Jurnal 25.04.2007-ci ildə
Azərbaycan Respublikası
Ədliyyə Nazirliyi
Mətbu nəşrlərin
reyestrinə daxil edilmişdir.
Reyestr № 2212

The journal is included in the
register of Press editions of the
Ministry of Justice
of the Republic of Azerbaijan on
25.04.2007.
Registration No. 2212

Azərbaycan Mətbuat Şurası
Azerbaijan Press Council

**Redaksiyanın ünvanı**
AZ1073, Bakı şəh.,
Mətbuat prospekti 529,
"Azərbaycan" nəşriyyatı,
6-cı mərtəbə

**Editorial address**
AZ1073, Baku,
Matbuat avenue 529,
"Azerbaijan" Publishing House,
6-th floor

**Tel.:** + 994 50 209 59 68
+ 994 55 209 59 68
+ 994 99 809 67 68
+ 994 12 510 63 99

**e-mail**
elmmerkezi@aem.az

## Beynəlxalq indekslər / International indices

ISSN: 2663-4619
e-ISSN: 2708-986X
DOI: 10.36719

## HUMANİTAR VƏ İCTİMAİ ELMLƏR

## HUMANITIES AND SOCIAL SCIENCES

DOI: https://doi.org/10.36719/2663-4619/97/8-13

**Əlizadə Nəcəfov**
ADPU-nun Ağcabədi filialı
tarix üzrə fəlsəfə doktoru
elizade.necefov@bk.ru
**Anar Kərimli**
ADPU-nun Ağcabədi filialı
tarix üzrə fəlsəfə doktoru
kerimli_anar@mail.ru

# ERMƏNİ TERRORU VƏ QARABAĞIN TARİXİ-DİNİ ABİDƏLƏRİ

**Xülasə**

Məqalədə Qarabağda olan tarixi-dini abidələrimizin erməni işğalı dövründə terrora məruz qalması, işğaldan azad olunan ərazilərimizdə bərpa-quruculuq işlərinin aparılması, abidələrimizin bərpa olunaraq yenidən həyata qaytarılmasından bəhs edilmişdir.

Məqalədə işğal dövründə ermənilərin mənfur məqsədlərinin işğal altında saxladıqları ərazilərdən Azərbaycan tarixini silməklə özlərini güya bu torpaqların qanuni sahibləri kimi təqdim etmək istəmələri vurğulanmışdır. Qeyd olunmuşdur ki, iki əsrdən çox Azərbaycan xalqına qarşı davam edən erməni təcavüzünün qurbanları təkcə minlərlə günahsız soydaşlarımız deyil, həm də yaşı min illərlə ölçülən tarixi-dini abidələrimiz, müqəddəs ocaqlarımız-məscidlər, dini ibadət yerləri, ziyarətgahlar, tarixən xalqımıza məxsus olan kilsələr, sinaqoqlar, pirlər, azərbaycanlılara məxsus yüzlərlə qəbristanlıqlar və digər tarixi mədəni abidələrimiz bihudə yerə erməni vandalizminə məruz qalmış və məhv edilərək yer üzündən silinmişdir.

***Açar sözlər:*** *mədəni irs, mədəni abidələr, dini abidələr, məscidlər, kilsələr, sinaqoqlar, terror*

**Alizade Najafov**
Aghjabadi branch of ASPU
PhD in history
elizade.necefov@bk.ru
**Anar Karimli**
Aghjabadi branch of ASPU
PhD in history
kerimli_anar@mail.ru

# Armenian terror and historical-religious monuments of Karabakh

**Abstract**

In the article, it was mentioned that our historical and religious monuments in Karabakh were subjected to terrorism during the Armenian occupation, restoration and construction works were carried out in our territories freed from occupation, and our monuments were restored and brought back to life.

In the article, it is emphasized that during the occupation, Armenians wanted to present themselves as the legal owners of these lands by erasing the history of Azerbaijan from the occupied territories. It was noted that the victims of the Armenian aggression against the people of Azerbaijan for more than two centuries are not only thousands of our innocent compatriots, but also our historic and religious monuments, holy places-mosques, places of religious worship, sanctuaries, churches

and synagogues that historically belong to our people., pyres, hundreds of cemeteries belonging to Azerbaijanis and other historical and cultural monuments of ours were subjected to Armenian vandalism for no reason and were destroyed and wiped off the face of the earth.

***Keywords:*** *cultural heritage, cultural monuments, religious monuments, mosques, churches, synagogues, terrorism*

## Giriş

Müstəqillik illərində respublikamızda başqa sahələrdə olduğu kimi tarixi- dini və mədəniyyət abidələrinin qorunması, mühafizəsi və inkişafı da ciddi sahələrdən birinə çevrilmişdir. Xüsusilə, Qərbi Azərbaycanda və Qarabağın işğal altındakı ərazilərində, erməni vandalizminin qarşısını almaq üçün beynəlxalq təşkilatların vasitəsi ilə abidələrin mühafizə edilməsinə nəzarət işləri mümkün qədər dövlət səviyyəsində daim diqqət mərkəzində saxlanılmış və dəfələrlə bu məsələ beynəlxalq təşkilatlar qarşısında qaldırılmışdır.

Erməni silahlı birləşmələri Qarabağı işğal edəndə "Hərbi münaqişələr zamanı mədəni sərvətlərin qorunması haqqında" (1954-cü il) Haaqa Konvensiyasının, "Mədəni sərvətlərin qeyri-qanuni dövriyyəsi haqqında" (1970-ci il) Paris Konvensiyasının, YUNESKO-nun "Ümumdünya mədəni və təbii irsinin mühafizəsi haqqında (1972-ci il) Konvensiyasının və "Arxeoloji irsin mühavizəsi haqqında" (1992-ci il) Avropa Konvensiyasının müddəalarını kobudcasına pozaraq Azərbaycanın mədəni sərvətlərini talamaqla məşğul olmuşdur (Süleymanov, Süleymanov, 2012: 65).

Bununla da ermənilərin mənfur məqsədləri işğal altında saxladıqları ərazilərdən Azərbaycan tarixini silməklə özlərini güya bu torpaqların qanuni sahibləri kimi təqdim etmək idi. Bu mənada iki əsrdən çox Azərbaycan xalqına qarşı davam edən erməni təcavüzünün qurbanları təkcə minlərlə günahsız soydaşlarımız deyil, həm də yaşı min illərlə ölçülən tarixi-dini abidələrimiz, müqəddəs ocaqlarımız-məscidlər, dini ibadət yerləri, ziyarətgahlar, tarixən xalqımıza məxsus olan kilsələr, sinaqoqlar, pirlər, ziyarətgahlar, azərbaycanlılara məxsus yüzlərlə qəbristanlıqlar və digər tarixi mədəni abidələrimiz bihudə yerə erməni vandalizminə məruz qalmış və məhv edilərək yer üzündən silinmişdir.

Unutmayaq ki, tarixi-dini abidələr hər xalqın təkcə tarixi deyil, həm də mənəvi, ruhani yaddaşını hifz edən müqəddəs məkanlardır. Bu baxımdan ermənilərin tarixi-mədəni abidələrimizi, o cümlədən məbədlərimizi məhv etmələri başadüşüləndir. Onlar bu yolla bizim minilliklər ərzində yaşadığımız Qarabağdakı tarixi ərazilərimizdən həm tarixi keçmişimizi, həm də mənəvi yaddaşımızı məhv etmək istəyirdilər.

Azərbaycan Respublikası Nazirlər Kabinetinin 2 avqust 2001-ci il tarixli, 132 nömrəli qərarı ilə təsdiq edilmiş "Dünya əhəmiyyətli daşınmaz tarix və mədəniyyət abidələrinin siyahısı", "Ölkə əhəmiyyətli daşınmaz tarix və mədəniyyət abidələrinin siyahısı" və "Yerli əhəmiyyətli daşınmaz tarix və mədəniyyət abidələrinin siyahısı"na əsasən 30 il ərzində işğal altında qalmış ərazilərdə dövlət qeydiyyatında olan tarix və mədəniyyət abidələrinin ümumi sayı 900-dən çoxdur (Məmmədov, 2015: 4).

Şübhəsiz ki, bu siyahıya alınmayan, lakin əzəli torpağımız Qarabağdakı varlığımızın, milli kimliyimizin maddi sübutları olan minlərlə tarixi abidəmiz, dəyərimiz vardır. Bəzi məlumatlara görə dövlət qeydiyyatında olmayan abidələrin sayı 1500-dən artıqdır, bunlardan beynəlxalq əhəmiyyətli abidələrin sayı isə onlarladır.

İşğal altındakı torpaqlarımızda təsbit olunmuş tarixi-dini abidələrin təqribi sayı 403-dür. Onlardan 67-si məscidlər, 144-ü məbədlər, 192-i ziyarətgahlar, 714-ü isə pirlərdir. İşğaldan azad olunmuş ərazilərimizdəki 67 məsciddən (Şuşada 13, Ağdamda 5, Füzulidə 16, Zəngilanda 12, Cəbrayılda 5, Qubadlıda 8, Laçında 8) 65-i tamamilə, 2-i isə qismən dağıdılaraq yararsız hala salınmışdır (Süleymanov, Süleymanov, 2012: 5).

Göründüyü kimi ermənilər təkcə müsəlman dininə aid məscid və ziyarətgahları deyil, həm də özlərinin mənsub olduqları xristian ehkamlarını da dağıtmaqdan çəkinməmişlər.

Dinşünasların da qeyd etdikləri kimi, ilahi dinlərin hər birində, onların müqəddəs kitablarında müqəddəs yerləri dağıdanlar barədə açıq-aşkar yazılır ki, kim Allahın məscidlərini və məbədlərini məhv edirsə, Allah da onları məhv edəcək. Qurani-Kərimin Bəqərə surəsinin 114-cü ayəsində bu barədə buyrulur: "Allahın məscidlərində Onun (Allahın) adının çəkilməsinə maneçilik törədənlərdən və onların xarab edilməsinə (dağıdılmasına) çalışanlardan daha zalım kim ola bilər? Halbuki, onlar oraya (məscidlərə) ancaq qorxa-qorxa girməli idilər. Onları dünyada rüsvayçılıq, axirətdə isə böyük əzab gözləyir" (Qurani-Kərim, 2022: 17).

İncildə isə bu barədə deyilir: "Kim Allahın məbədini məhv edirsə, Allah onu məhv edəcək, çünki Allahın məbədi müqəddəsdir" (İncil, Korinflilərə I məktub, 3/17) (Süleymanov, Süleymanov, 2012: 5).

Araşdırmalardan aydın olur ki, ermənilərin tarixi-dini abidələrimizə qarşı vandal təcavüzü müxtəlif istiqamətlərdə aparılmışdır. Milli mənsubiyyəti və qədim tarixi milli, dini ənənəni özündə ehtiva edən abidələr tamamilə uçurulmuşdur. Bu abidələrin erməniləşdirilməsinə, özgələşdirilib dəyişdirilməsinə cəhd edilmiş, işğal altındakı müsəlman dini kimliyinə aid olan abidələr, o cümlədən digər mədəniyyət nümunələri dağıdılmış, hətta təhqir olunmuşdur. Son illərdə məscidlərimizdə donuz, mal-qara və digər heyvanların saxlanılması faktı Qərb ölkələrinin fotomüxbirləri tərəfindən də lentə alınmış və bütün dünya ictimaiyyətinə çatdırılmışdır.

Azərbaycanın işğal altında olan ərazilərini "özününkü" hesab edən Ermənistanın siyasi dairələri, artıq bu əraziləri tarixi və mədəni baxımdan da erməniləşdirmək üçün işğal dövründə ardıcıl olaraq vandallıq həyata keçirmişlər. Həmin vandallıq fəaliyyəti aşağıdakı istiqamətlər üzrə aparılmışdır;

İslam dini abidələri, o cümlədən məscidlər, ziyarətgahlar, pirlər, ocaqlar, qəbristanlıqlar, qəbirüstü abidələr, qəbir daşları tamamilə dağıdılaraq yerlə yeksan edilmişdir. Memarlıq abidələri üzərindən Azərbaycan və ərəb əlifbası ilə yazılmış bütün mətnlər silinmiş və ya götürülərək ərazidən çıxarılmış, tarix diyarşünaslıq muzeyləri, şəkil qalareyaları və fondlarında olan yüzminlərlə əlyazmalar və eksponatlar, monumental abidələrin və xatirə nişanlarının, Azərbaycanın tarixi və mədəniyyəti ilə bağlı olan məhşurların həyatlarını əks etdirən lövhələrin, heykəltaraşlıq əsərlərinin sökülərək erməni mədəniyyətinin nümunələri və heykəlləri ilə əvəzlənməsinə cəhd edilmişdir.

Toponimlərin, yer-yurd və inzibati yaşayış mərkəzlərinin adlarının dəyişdirilməsi, tarixi şəxsiyyətlərin o cümlədən, dövlət xadimlərinin, hərbi xadimlərin, keçmiş Sovet İttifaqı və Milli Qəhrəmanların, görkəmli elm və incəsənət xadimlərinin həyatı ilə bağlı şəxsi müzeylər və mənzillər üzərindən azərbaycanlıların adlarının ləğv edilərək milliyyətcə erməni vətəndaşlarının adları ilə əvəz edilməsi və digər çoxsaylı vandalizm nümunələri mövcuddur (Rüstəmov, 2015: 3).

Ermənilərin işğalçılıq faktından istifadə edərək çoxsaylı abidələrə qarşı məqsədli şəkildə tətbiq etdikləri vandalizm aktları nəticəsində milli abidələrimizin forma cəhətdən görünüşü tamamilə dəyişdirilərək mövcudluğu şübhə altına alınmışdır. Buna misal olaraq, Şuşa şəhərindəki böyük tarixi əhəmiyyətə malik bina və qurğuları, M.P.Vaqifin xatirə kompleksini, Laçın rayonunun Güləbird kəndindəki Sarı Aşığın və Laçın şəhərinin mərkəzində tikilmiş İkinci Dünya Müharibəsi iştirakçılarının xatirə abidələrini göstərmək olar. Bütün bunların əvəzində isə ermənilər Şuşa, Laçın, Kəlbəcər, Xankəndi, Hadrut, Xocavənd, Qubadlı ərazilərində, birinci Qarabağ döyüşlərində azərbaycan oğulları tərəfindən məhv edilmiş erməni terrorçularından bəzilərinin xatirələrini əbədiləşdirmək üçün onların heykəlləri ucaldılmışdır.

Hərbi təcavüz nəticəsində işğala məruz qalmış ərazilərdə tarixən mövcud olmuş mədəni dəyərlərin qorunması və eləcə də memarlıq, incəsənət, tarixi abidələr, arxeoloji qazıntılar kimi daşınan və daşınmaz mədəni dəyərlərin müdafiə edilməsi və onlara dəymiş zərərlərin qiymətləndirilməsi hazırda Azərbaycan dövlətinin qarşısında təxirəsalınmaz bir vəzifə kimi durur. Belə ki, 2012-ci ildə Parisdə keçirilmiş YUNESKO-nun Silahlı münaqişələr zamanı mədəni mülkiyyətin qorunması üzrə Komitəsinin 8-ci sessiyası çərçivəsində işğal edilmiş ərazilərdə mədəni mülkiyyətin qorunması haqqında qəbul edilən sənəd imkan verir ki, Azərbaycan dövləti törətdiyi cinayətlərə görə Ermənistana qarşı Beynəlxalq təşkilatlar vasitəsi ilə sanksyaların tətbiq edilməsini tələb etsin (Axundova, 2023: 7).

Müasir şəraitdə Qarabağ abidələrinin Azərbaycan mədəniyyətinin inkişafında böyük əhəmiyyətini nəzərə alaraq, işğal altındakı abidələrin xüsusiyyətlərinin öyrənilməsinin vacibliyi indi daha çox hiss olunur. Qarabağ abidələrinin bütün Azərbaycan xalqının həyat fəlsəfəsində müsbət keyfiyyət müəyyən edən bədii-obrazların tətqiqinin zəruriliyi də xüsusi qeyd olunmalıdır.

Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin davamlı və təkidli tələbləri nəticəsində Beynəlxalq təşkilatlar Ağdam cümə məscidinin, Şuşa şəhərindəki Aşağı Gövhər ağa, Yuxarı Gövhər ağa və Saatlı məscidlərinin divarlarını dağılmaqdan saxlamağa nail olmuşdur.

İşğal dövründə ermənilər daha bir əxlaqsızlıq nümayiş etdirərək, Ağdam cümə məscidinin içərisində ev heyvanları, o cümlədən donuz saxlamaqla azərbaycanlılara qarşı öz nifrətlərini nümayiş etdirirdilər. Onlar qəbristanlıqların mərmər daşlarını söküb formalarını dəyişərək Xankəndi, Hadrut, Əsgəran, Laçın və Xocavənd qəsəbələrində inşa etdikləri bağ və parklarda bəzək daşları kimi istifadə etmişdilər. Bunun da nəticəsində yüzlərlə qəbristanlıqlar dağıdılmış və minlərlə qəbirlər tanınmaz hala salınmışdır.

Məlumdur ki, işğal edilmiş Qarabağdakı tarixi-dini abidələrimiz milli mədəniyyətimizin bir hissəsini təşkil edir. Bununla yanaşı erməni işğalçıları tərəfindən talan edilmiş regionun muzeylərində Azərbaycan xalqının tarixi və mədəniyyəti ilə bağlı qiymətli əşyalar, rəssamlıq və mədəniyyət əsərləri, dünya şöhrətli xalçalar, Azərbaycanın görkəmli şəxsiyyətlərinin xatirə əşyaları və digər qiymətli materiallar toplanmışdı. İşğal olunmuş ərazilərdə Azərbaycanın mədəni irsini təşkil edən mədəniyyət obyektləri xüsusi qəddarlıqla məhv edilmişdir. Ələ keçirdikləri ərazilərdə 12 muzey, 6 rəsm qalereyası, 9 saray qarət edilmiş və yandırılmışdır. Nadir tarixi əhəmiyyətli 40 min muzey sərvəti və eksponatı talan olunmuşdur. Dağıdılan və yandırılan 927 kitabxanada 4,6 milyon kitab və misilsiz əlyazma nümunələri məhv edilmişdir (Süleymanov, Süleymanov, 2012: 66).

Qeyd etmək yerinə düşər ki, düşmən tarixi-dini abidələrə qarşı vandallığı təkcə Qarabağda deyil, həmçinin Qərbi Azərbaycanda yaşamış soydaşlarımıza qarşı da törətmiş, azərbaycanlıların varlığını özündə əks etdirən bütün tarixi-memarlıq abidələri yer üzündən silinmiş, qəbiristanlıqlar dağıdılmışdır. XX əsrin əvvəllərində İrəvan quberniyası ərazisində 310 məscid qeydə alındığı halda, bu gün Ermənistan ərazisində yalnız bir məscid – Göy məscid qismən salamat qalmışdır ki, onu da xarici qonaqlara “fars” məscidi kimi təqdim edirlər. 1988-1989-cu illərdə Ermənistanın 22 rayonundan (170 sırf azərbaycanlı və 94 ermənilərlə qarışıq yaşayış məntəqələrindən) 250 minə yaxın azərbaycanlı deportasiya edildi. Bununla da tarixi Azərbaycan torpaqlarında monoetnik erməni dövlətinin əsası qoyuldu. Azərbaycanlıların Ermənistanda qoyub gəldikləri yaşayış məntəqələrindəki 234 məktəb, 214 kitabxana, 268 mədəniyyət müəssisəsi, 235 səhiyyə ocağı, 112 uşaq bağçası, 152 məişət evi ermənilərin əlinə keçdi. Azərbaycanlılara məxsus 223 qəbiristanlıq, 49 məscid, 68 tarixi-memarlıq abidəsi tədricən erməni vandalları tərəfindən səssiz-səmirsiz dağıdılmışdır (Axundova, 2023: 1).

Qeyd etmək lazımdır ki, Azərbaycan Respublikası Nazirlər Kabineti- avqust 2001-ci il tarixli 132 saylı qərarı ilə ilk variantda azərbaycan ərazisində 6308 sayda müxtəlif təyinatlı abidələrin adı, yaranma tarixi və ünvanı siyahıya alınıb dövlət səviyyəsində qorunur. Siyahıdan məlum olur ki, bu abidələrin 876-sı Qarabağda yerləşir. Onlardan 7-si dünya, 133-ü ölkə, 458-i isə yerli əhəmiyyətli abidələrdir (Qarabağlı, 2004: 116).

İnamla deyə bilərik ki, bu siyahı tərtib olunan zaman Qarabağ işğal altında olduğuna görə ərazidəki tarixi dini və başqa sahələrə aid olan abidələrin xeyli hissəsi bu siyahıya öz əksini tapmamışdır.

Bəzi erməni mətbuatında Qarabağda “erməni mədəniyyəti” ifadələrinə rast gəlirik. Məlum olduğu kimi bu tamamilə əsassız və yalan ifadələrdir. Qarabbağda olan xristian mənşəli tarixi dini abidələrin hamısı qədim alban – Azərbaycan abidələridir. Qarabağdakı ermənilər 1978-ci ildə əcdadlarının Rusiyanın iştirakıa ilə 1828-ci ildə İrandan köçürülərək Qarabağda yerləşdirilmiş əcdadlarının 150 illiyi şərəfinə yerli əhəmiyyətli bir kiçik abidə (dəmir-beton konstruksiyadan hazırlanmış üzərində ermənicə “marağa-150” ifadəsi yazılmışdır) qoymuşdular. 1991-ci ildə həmin abidə ermənilərin Qarabağa gəlmə olduqlarını təsdiq etdiyinə görə özləri tərəfindən həyasızcasına dağıdılmışdır (Əliyev, 2003: 7).

Ermmənilərin qarabağdakı xristian mənşəli abidələrlə heç bir əlaqəsinin olmması barədə 1928-ci ilin iyul-avqust aylarında Qarabağda tədqiqat işləri aparmış İ.Petruşevski "O doxristianskix verovaniya krestyan Naqornoqo Karabaxa" adlı əsərində yazır ki, Qarabağdakı xristian abidələrini heç vaxt erməni mədəniyyət nümunələri hesab etmək olmaz. Çünki ermənilər bu əraziyə İran, Türkiyə və başqa yerlərdən köçürülmüşdülər (Petrusheviski, 1930: 13).

Dini Qurumlarla İş üzrə Dövlət Komitəsinin sədr müavini Gündüz İsmayılov "Azərbaycanda dini məsələ: təhdidlər və hədəflər" adlı əsərində yazır: "Azərbaycanda xeyli sayda kilsə var və onlar dövlət tərəfindən qorunur. Bu kilsələrin böyük əksəriyyəti Alban məbədləridir. İşğal olunmuş ərazilərimizdə və bu gün Ermənistan adlandırılan tarixi Azərbaycan torpaqlarında mövcud olan Alban məbədlərinin hamısı ya qriqoryanlaşdırılıb, ya da məhv edilib" (İsmayılov, 2021: 88).

Ümumilli lider Heydər Əliyevin "Abidələr şəhəri" adlandırdığı Şuşada 190 hektarlıq qoruq ərazisində 235 tarixi və dini abidə məhv edilmişdir ki, onlardan 23-ü dünya və respublika əhəmiyyətli, digərləri isə yerli əhəmiyyətli abidələt idi (Hacıyev, 2005: 181).

Ermənistan silahlı qüvvələrinin Qarabağda törətdikləri vəhşilikləri beynəlxalq təşkilatların ali kürsülərindən dəfələrlə dünya ictimaiyyətinin nəzərinə çatdıran Azərbaycan Respublikasının Prezidenti İ.Əliyev çıxışlarının birində bu barədə demişdir: "..Bütün dünya gördü ki, onların əsas ideoloji amili nə idi. Guya onlar burada azlıqda yaşayan mədəni, böyük sivilizasiyaya aid olan bir xalqdır, ətrafında da vəhşi müsəlmanlar bunları əhatə edir. Avropanın hər bir tinində bunu deyirdilər. Rusiyanın hər bir tinində bunu deyirdilər ki, bizə kömək edin, yoxsa bizi burada boğarlar. İndi hər kəs gördü bunun sivilizasiyası nədir, bunun mədəniyyəti nədir, bunun əxlaqı, mənəviyyatı nədir?! Qəbirləri dağıdan, şumlayan, ölülərin qızıl dişlərini çıxaran, məsciddə donuz saxlayan vəhşidir, başqa adı yoxdur. Bütün dünya bunu görüb və daha da çox görəcək" (11).

## Nəticə

Əvvəldə qeyd etdiklərimizdən bəlli olduğu kimi erməni işğalçıları tarixi Qarabağda tarixi-dini və digər mədəni irsimizi məhv etməklə, dünyaya daş dövründən bəri məlum olan tarixi irsimizi itirmək istəsələr də buna nail ola bilmədilər. Çünki, tarixi dəyişmək heç kəsə nəsib olmadığı kimi erməni faşistlərinə də qismət olmadı.

Böyük qürur və iftixar hissilə qeyd etməliyik ki, üç ildən artıqdır ki, Qarabağ Müzəffər Ali Baş Komandan İlham Əliyevin rəhbərliyi ilə rəşadətli ordumuz tərəfindən düşməndən tamamilə azad edilmiş və ərazi bütövlüyümüz bərpa olunmuşdur. Qarabağdakı "oyuncaq dövlət" məhv edilmiş və 30 ilə yaxin bir zaman kəsiyində qanunsuz qondarma rejimə rəhbərlik etmiş cinayətkar rəhbərlər həbs olunaraq Azərbaycanın paytaxtı Bakıya gətirilmiş və barələrində həbs qəti imkan tədbiri seçilmişdir.

Artıq Qarabağda həyat yenidən öz axarına düşüb, hər tərəfdə geniş abadlıq quruculuq, bərpa və təmir işləri vüsət alıb, məcburi köçkünlər mərhələlərlə öz doğma dədə-baba yurdlarına qayıdırlar. İşğaldan azad olunmuş ərazilərdən Şuşada, onun kəndi olan Daşaltıda, Hadrutda, Suqovuşanda, Zəngilan, Qubadlı, Cəbrayıl, Laçında yeni tikiləcək məscidlərin təməli qoyulmuş, Şuşada yuxarı və Aşağı Gövhər ağa, Saatlı, Ağdamda isə şəhər cümə məscidləri bərpa olunaraq istifadəyə verilmişdir (Milli-mənəvi dəyərlərimizin hamısı, 2023: 124).

## Ədəbiyyat

1. Süleymanov, E., Süleymanov, V. (2012). Ermənistanın Azərbaycana qarşı silahlı təcavüzü və işğalın ağır nəticələri. Bakı, 181 s.
2. Məmmədov, N. (2015). İşğal altındakı tarixi-dini abidələrimiz. Nurlar, 96 s.
3. Qurani-Kərim, B. (2022). Tuna, 640 s.
4. Rüstəmov, T. (2015). Erməni işğalçıları Qarabağda maddi-mədəni irsimizi məhv etməklə dünyaya çoxdan məlum olan tarixin izlərini itirmək istəyirlər". "Xalq qəzeti". 30 mart, 6 s.
5. Axundova, S. (2023). Xalqımızın dünya əhəmiyyətli tarixi və mədəniyyət abidələri erməni vandalizminə məruz qalıb. "İki sahil" qəzeti, 6 oktyabr.
6. Qarabağlı, R. (2004). Qarabulaqdan Füzuliyədək. Bakı: Nurlan, 167 s.

7. Əliyev, C. (2003). Türklər, azərbaycanlılar, ermənilər: tarixi həqiqətin "genosidi". M., 62 s.
8. Petrusheviski, I.O. (1930). Dokhristiyanskikh verovaniyakh krestiyan Nagornogo Karabakha. Izvestiya Az.GNII. (Azerbaydzhanskiy Nauchno-Issledovatel'skiy Institut). Baku, tom.1, vipusk 6, 43 s.
9. İsmayılov, G. (2021). Azərbaycanda dini məsələ: təhdidlər və hədəflər. B., 290 s.
10. Hacıyev, N. (2005). Dağlıq Qarabağın tarixindən sənədlər. Bakı: Gənclik, 190 s.
11. Xəzər xəbər. 12 aprel.
12. Milli-mənəvi dəyərlərimizin hamısı. (2023). Bakı: Tuna, 214 s.

Göndərilib: 21.10.2023 Qəbul edilib: 01.12.2023

DOI: https://doi.org/10.36719/2663-4619/97/14-19

**Nuri Ələviyyə**
Naxçıvan Dövlət Universiteti
doktorant
mayisnuri422@gmail.com

# İNGİLİS DİLİNDƏ SÖZ YARADICILIĞININ QEYRİ-ƏSAS NÖVLƏRİ

**Xülasə**

Dil ən mobil və daim dəyişən sistemlərdən biridir və daim dəyişən tarixi, iqtisadi, mədəni şəraitlə əlaqədar olaraq dilin həm tərkibi, həm də quruluşu dəyişir. Dilin həyatın dəyişən xüsusiyyətlərinə uyğunlaşdırılması prosesində cəmiyyətin fəaliyyətinin bu mərhələsində aktual olan yeni sözlərin yaranması yolu ilə yenilənir.

Dildə yeni sözlərin yaradılmasında bir sıra məhsuldar vasitələrlə yanaşı az məhsuldar olan növləri də mövcuddur. Söz yaradıcılığının qısaltmalar, səs təqlidi, klipinq kimi qeyri-əsas növlərinin tam xarakteristikasını vermək olduqca vacibdir. Odur ki, qeyri-əsas növləri söz yaradıcılığının əsas növlərindən fərqləndirən amilləri öyrənmək məqalənin mövzusunun aktuallığını təmin edir. Məqaləni yazarkən, qarşımıza qoyduğumuz məqsədə çatmaq üçün müxtəlif metodlardan istifadə məsələsi çox mühüm amil olmuşdur. Bu səbəbdən, bu məqaləni yerinə yetirərkən, biz, mövzuyla əlaqədar təsviri, komponentlərin təhlili və kontekstual metodlardan istifadə etmişik.

Bu məqalənin yazılmasında başlıca məqsəd söz yaradıcılığının ikinci dərəcəli növlərinin onun əsas növlərindən fərqli cəhətlərini müəyyənləşdirməkdir.

***Açar sözlər:*** *ingilis dili, söz yaradıcılığı, söz, qeyri-əsas növlər*

**Nuri Alaviyya**
Nakhchivan State University
PhD in student
mayisnuri422@gmail.com

# Non-major types of word-formation in English

**Abstract**

Language is one of the most mobile and ever-changing systems, and both its composition and structure change due to the ever-changing historical, economic, and cultural conditions. In the process of adaptation of the language to the changing features of life, it is updated through the creation of new words that are relevant at this stage of the society's activity.

Along with a number of productive means of creating new words in the language, there are also less productive ones. It is extremely important to give a complete characterization of non-basic types of word creation, such as abbreviations, voice imitation, clipping. Therefore, studying the factors that distinguish the non-main types from the main types of word creation ensures the relevance of the topic of the article. When writing the article, the issue of using different methods to achieve our goal was a very important factor. For this reason, in carrying out this article, we have used descriptive, component analysis and contextual methods related to the topic.

The main goal of writing this article is to determine the differences between the secondary types of word creation and its main types.

***Keywords:*** *English language, word creation, vocabulary, non-basic types*

## Giriş

Dil gündəlik həyatımızın ayrılmaz hissəsidir. İngilis dilinin söz ehtiyatı günbəgün yenilənməyə və yeni vahidlərlə zənginləşməyə davam edir. Mövcud məlumatlara görə, il ərzində ingilis dilində orta hesabla 800-ə yaxın yeni dil vahidi yaranır ki, bu da dünyanın əksər dillərindəkindən çoxdur.

Söz ehtiyatının bu cür yenilənməsi təkcə müxtəlif dillərdən keçən sözlərin, yəni morfemlərin tərcüməsi vasitəsi ilə başqa bir dilin prinsiplərinə uyğun olaraq yeni sözlərin yaradılması yolu ilə baş vermir, həm də ingilis dili sisteminin "daxili resursları" – söz əmələ gətirmə mexanizmləri və mövcud mənaların yenidən nəzərdən keçirilməsi vasitəsilə də yaranır (Amus, 2005: 45).

Bəzi alimlərin fikrincə, "kommunikativ uyğunluq vəziyyətində" qalmaq üçün ingilis dili (hər hansı digər dil kimi) sistemin orijinallığını qorumaqla, davamlı olaraq yenidən qurulmalı və inkişaf etdirilməlidir.

Bildiyimiz kimi, dilin əsas vahidləri bunlardır: morfem, söz, söz birləşməsi, cümlə, mətn. Müxtəlif dil vahidləri arasındakı sərhəd həmişə aydın olmur və onu müəyyən etməyə çalışarkən terminin ifadə etdiyi anlayışın ən mühüm xüsusiyyətlərini göstərmək vacibdir. Quruluş etibarilə söz onu həm morfemlərdən, həm də sözyaradıcı qruplardan fərqləndirən, müəyyən qrammatik formalar və sintaktik xüsusiyyətlər sisteminə çevrilən ayrılmaz leksik vahiddir.

"Söz" anlayışının onu müxtəlif nöqteyi-nəzərdən xarakterizə edən və müəyyən edən bir çox tərifləri var:

1. "Söz" termini müəyyən mənanın müəyyən qrammatik işlənməyə qadir olan müəyyən qrup səslərlə əlaqələndirilməsi nəticəsində yaranan əsas dil vahidini bildirir.
2. Söz eyni zamanda semantik, qrammatik və fonoloji vahiddir.
3. Söz dil sisteminin əsas və əsas vahididir, linqvistik təhlilin morfoloji cəhətdən ən böyüyü, sintaktik müstəvidə isə ən kiçiyidir.
4. Söz dil sistemi daxilində struktur və semantik varlıqdır.

Beləliklə, söz həm məna parametrinə, həm də məzmuna malik olan ikiölçülü vahiddir. Söz fonologiya, sintaksis, morfologiya kimi bir çox dil fənlərinin mərkəzidir, lakin fəlsəfə və psixologiya kimi qeyri-dil elmləri tərəfindən də öyrənilir. Hər bir elm sahəsində sözün dilin əsas vahidi kimi müəyyən edilməsinin özünəməxsus xüsusiyyətləri olacaqdır.

Rəsmi səviyyədə bir söz "minimal sərbəst forma" kimi müəyyən edilir. Bu o deməkdir ki, müəyyən mənanın verilmiş səs kompleksi ilə əlaqəli olduğu, verilmiş qrammatik işləkliyi qəbul edən və özbaşına cümlə qura bilən muxtar dil vahidi olan söz digər əsas dil vahid olan morfemdən fərqli olacaqdır. Morfemlər nitqdə yalnız sözlərin tərkib hissələri kimi meydana çıxır, yəni müstəqil şəkildə işlənmir. Morfemlər daha kiçik mənalı vahidlərə bölünmür. Morfemlərin sözlərin qurulmasında oynaya biləcəyi roldan asılı olaraq onlar kök və fikslərə bölünür. Sözün əsas leksik mənasını daşıyan morfemə kök morfem deyilir. Affiksasiya morfemləri və ya affikslər suffiks və prefikslərə bölünür.

Söz məna baxımından aşağıdakı xüsusiyyətlərə malik olan "semantik vahid" hesab olunur: bölünməzlik / davamlılıq (məna dəyişmədən sözü ixtisar etmək olmaz), mövqe hərəkətliliyi (cümlə hüdudları daxilində söz müstəqil fəaliyyət göstərə bilir).

İngilis dilinin lüğətinin xüsusiyyətlərindən biri ondan ibarətdir ki, o, alınma lüğətin təxminən 70% -ni və eyni zamanda yerli lüğətin 30% -dən çoxunu ehtiva edir. Artıq qeyd edildiyi kimi, ildə 800-ə qədər yeni söz yaranır. Eyni zamanda, mənşəyindən asılı olmayaraq, onların əksəriyyəti doğma ingilis dili kimi qəbul edilir. Lakin onların xüsusiyyətlərini və linqvo-mədəni və tarixi aspektlərini daha ətraflı araşdırıb təhlil etdikdə deyə bilərik ki, onların heç də hamısı doğma ingilis dili lüğəti deyil. İngilis dili german dillərinin qərb yarımqrupuna aiddir, yəni onun əsas fondunu təmsil edən lüğət vahidləri bir çox hallarda digər german dillərində etimoloji oxşarlıqlar tapır. Belə lüğət vahidlərinə, məsələn, ingilis dilindəki house (ev) sözü (alman dilində *haus*, holland dilində *huis*, isveç dilində *hus*) və day (gün) sözü (alman dilində *tag*, holland dilində *dag*) daxildir (Barinova, 2007: 79).

Dillər inkişaf edir və yeni reallıqlara və şəraitə uyğunlaşır. Bütün insan dillərinin xarakterik xüsusiyyəti yeni sözlər yaratmaq potensialıdır. Yeni sözlər söz əmələ gəlmə prosesləri ilə yaranır. Söz əmələ gəlmə prosesi əsasən insan həyatına daxil olan fenomen kimi tanınır. Vikipediya tərəfindən təqdim edilən təriflərdən birində deyilir ki, söz əmələ gəlməsi çoxmənalı termindir, çünki o, sözlərin dəyişə biləcəyi proseslərə (yəni morfologiyaya) və ya müəyyən bir sahədə yeni leksemin yaradılmasına aid edilə bilər (3). Müxtəlif alimlər bu fikrin çoxsaylı təriflərini verirlər. Söz

yaratmaq prosesi mövcud materiallardan yeni terminlər yaratmaq üsuludur. R.I.Trask, P.Hacken və C.Thomas vurğulayırlar ki, söz əmələ gəlmə prosesi müəyyən qaydalara uyğun olaraq yeni sözlərin yaradılması ilə məşğul olur (Hacken, Thomas, 2013: 1997). Bundan əlavə, I.Plag iddia edir ki, bu prosesin xüsusiyyəti digər mövcud sözlərdən yeni sözlər çıxarmaqdır (Plag, 2002: 95). L.Bauer bildirir ki, söz əmələ gəlmə prosesi məhsuldar və ya qeyri-məhsuldar ola bilər (Bauer, 1983: 633). Məhsuldar söz əmələ gətirmə prosesi yeni materialların istehsalında tətbiq oluna bilər, halbuki qeyri-məhsuldar söz əmələ gəlməsi prosesi yeni materialların istehsalında tətbiq edilmir. Deməli, ümumiləşdirilə bilər ki, sözəmələgəlmə prosesini yeni söz yaratmaq üçün istifadə etmək məqsədəuyğun olarsa, həmin proses məhsuldardır. H.Harley vurğulayır ki, yeni yaranan sözlər mövcud sözlərin manipulyasiyası nəticəsində yaranan sözlərdir (Harley, 2006: 57).

Söz yaratmaq prosesləri təkcə keyfiyyət deyil, həm də kəmiyyət dəyişikliklərini əhatə edir. Kəmiyyətcə olanlar arasında biz qeyri-əsas və ya başqa adı ilə qeyri-məhsuldar söz yaratma vasitələrini fərqləndiririk: qısaltma, qarışdırma, səs dəyişməsi, vurğunun yerinin dəyişməsi, səs imitasiyası və ya reduplikasiya, geri formalaşma.

Bu növlərin hər birinə ayrı-ayrılıqda qısaca nəzər salaq:

***1. Qısaltma (shortening).***

Qısaltma söz yaradıcılığının nisbətən yeni üsuludur və ilk başlarda qeyri-məhsuldar söz yaratma vasitələrindən biri olsa da bu gün, xüsusən də Amerikan ingilis dilində yüksək məhsuldarlığa səbəb olmuşdur.

Qısaltmalar iki fərqli şəkildə özünü göstərir. Birincisi, ilkin sözün bir hecasından (və ya iki) yeni söz yaratmaqdır. Məsələn, bəzi sözlərdə sözün əvvəli ixtisar olunur və ikinci hecası qalır, məsələn, *telephone (telefon)* sözündən *tele* hissəsi atılır və *phone* yeni yaranmış söz olur, *defence (müdafiə)* sözündən *de* hissəsi atılır *fence* sözü yaranır. Bəzi sözlərdə isə sözün sonu ixtisar olunur, məsələn, *holidays (bayramlar/tətillər)* sözü qısaldılmış və *hols* sözü, *vacation (tətil)* sözündən *vac*, *properties (əmlak)* sözündən *props*, *advertisement (reklam)* sözündən *ad* yaranmışdır, Bir sıra sözlərdə başlanğıcını, həm də sonunu itirə bilər, məsələn, *influenza (qrip)* sözündən *flu*; *refrigerator (soyuducu)* sözündən *fridge* sözlərinin yaranması kimi. Qısaltmalara daxil olan klippinqlər və leksik abbreviaturalar arasında fərq qoyulmalıdır.

a) ***Klippinq***in üç növü ayırd edilir: aferez (aphaeresis), sinkop (syncope), apokop (apocope).

Aferez Yunan dilindən tərcümədə “atmaq” mənasını verir və sözün başlanğıc hissəsinin atılması hadisəsinə deyilir:

Məs. *telephone – phone (telefon), omnibus – bus (avtobus).*

Ancaq bəzən qısaldılmış söz sadəcə formaca deyil, həm də mənaca da bir qədər dəyişdirilir:

Məs. *acute (sharp – iti) – cute (pretty, clever – gözəl, ağıllı), espy (see at a distance – məsafədən görmək) – spy (to try to get secret information – gizli məlumatı əldə etməyə çalışmaq/cəsus) (10).*

Bəzi sözlər öz tarixi inkişafını aferezinə borcludur, məsələn, *adown (aşağı)* sözündən *down* sözü yaranmışdır ki, bu da öz növbəsində anqlo-saksonların *dune* sözündən inkişaf etmişdir.

Bir çox ilk adlar aferez üsulu ilə qısaldılmışdır:

Məs. *Bess (Elizabet), Becky (Rebecca)* və s.

Sinkop (yunan dilindən "*kəsmək*" deməkdir) vurğusuz orta hecanın ixtisar olunması nəticəsində yeni sözlərin yaradılması prosesidir:

Məs. *fantasy – fancy (fantaziya), courtesy – curtsy (nəzakət).*

“*e’en – even, ne’er – never*” kimi sinkop sözlər əvvəllər daha ritmik axıcılıq yaratmaq üçün şairlər tərəfindən çox istifadə olunurdu. Müasir poeziya nümunələrində də nadir hallarda sinkop nümunələrinə rast gəlinir.

Apokop (yunan dilindən "*kəsmək*" deməkdir) sözün son hissəsinin kəsilməsi yolu ilə baş verir. Ən məhsuldar qısaldılma növüdür. Stilistik sinonimlər əsasən apokop vasitəsilə yaranır. Apokopdan daha çox danışıq dilində istifadə edilir (8):

Məs. *gym (gymnasium) – gimnaziya/idman zalı, specs (spectacles) – eynəklər, croc (crocodile) - timsah*.

Xüsusi adlarda da apokopiya olunur:

Məs. *Nick (Nicholas), Ed (Edward).*

Bəzi sözlər var ki, onlar nadir hallarda apokopiya olunmuş formada istifadə olunmur. İngilis dilində bu tip sözlər çox deyil:

Məs. *Internet, Eurobank.*

Bir neçə klipinq növünün birləşməsi halları da mümkündür:

Məs. *perambulator – pram (uşaq arabası) (senkop + apokop); refrigerator – fridge (soyuducu) (aferez + apokop).*

b) ***Qısaltmağın ikinci yolu*** qısaldılmış söz qrupunun ilk hərflərindən yeni söz yaratmaqdır ki, buna da ***abreviatura*** deyilir.

- leksik abbreviatura həm yazılı, həm də şifahi nitqdə sözün və ya söz qrupunun qısaldılmasının nəticəsidir:

- əlifba abbreviaturası (initializm) tərkib hərflərinin əlifba oxunuşlarının ardıcıllığı kimi oxunan qısaldılmadır, məs. *BBC (British Broadcasting Corporation), MTV (Music Television), EU (European Union), M.P. (Member of Parliament), WHO (World Health Organisation), AIDS (Acquired Immune Deficiency Syndrome), GMO (Genetically Modified Organisms) etc.*

- akronimik abbreviatura (akronim) tərkib hərfləri ilə işarələnən səslərin ardıcıllığı kimi oxunan qısaltmadır, yəni adi söz kimi, məs. *UNESCO (United Nations Scientific, and Cultural Organisation), NATO (North Atlantic Treaty Organisation), UNICEF (United Nations International Children's Emergency Fund) e.g. UNO from the United Nations Organization, WASP (Women's Air Force Service Pilots) (9).*

Onlar söz kimi istifadə olunur və geniş valyutaya malik abbreviatura artikulyasiya üçün əlverişsizdirsə, bəzən dəyişdirilir: məsələn, *W.R.N.S (Women's Royal Naval Service)* tələffüz etmək çətin idi, buna görə də *WRENS* olaraq dəyişdirildi.

İxtisarlar bəzi hallarda ingilis dilində çox vacib sayılan omonimlərin yaranmasına da gətirib çıxara bilir. Məsələn, *the United States – US.* Elə bu nümunənin özünü omoqraflara aid edə bilərik. Belə ki, *Birləşmiş Ştatlar* adının abbreviaturası olan *US*, əvəzliyin obyekt halında *"bizi/bizə"* mənasını verən *"us"* əvəzliyi ilə yazılış baxımından omonimlik yaradır.

Akronimlər də mürəkkəb isimləri təşkil edən xüsusi isimlərin ilk hərflərinin yazılması ilə yaranır, lakin akronimlər initializmlərdən fərqli olaraq tək bir söz kimi oxunur, hərf-hərf deyilmir: məsələn, *SAD - Seasonal Affective Disorder* (Adətən mövsümlərin payızdan qışa qədər dəyişməsi depressiyaya səbəb olur). Bu akronim sifət olan *sad – qəmgin* sözü ilə omonimlik yaradır. Başqa bir nümunə kimi *AİDS - Acquired Immune Deficiency Syndrome (Qazanılmış İmmun Çatışmazlığı Sindromu)* akronimi *aid – yardım* sözünün cəm forması olan *aids – yardımlar* sözü ilə omonimlik yaradır (Hurford, Brendan, Michael, 2007: 123).

*- KİSS – keep it simple and stupid (sadə saxlamaq) akronimi kiss – öpmək feili ilə omonimlik yaradır.*

*- MAP – Moving Ahead for Progress (tərəqqiyə doğru getmək) akroniminin map – xəritə ismi ilə omonim olduğunu aşkar edirik.*

*- PAW – parents are watching (valideynlər baxır) – akroniminin isə paw – pəncə ismi ilə omonimlik yaratdığını müəyyən edirik.*

*- AİRS – Atmospheric İnfrared Sounder (Atmosfer İnfraqırmızı Səsləndiricisi) akronimi ears – qulaqlar isminin omofonudur və s (Hurford, Brendan, Michael, 2007: 123-124).*

***2. Blendinq/qarışdırma (blending) üsulu.***

Qarışdırma (teleskoplama) sözlərin hissələrinin bir yeni sözdə birləşdirilməsi prosesidir, məs. *Bollywood < Bombay + Hollywood, brunch < breakfast + lunch, Mathlete < Mathematics+ athlete, Smog < slang + language, pollutician < pollute + politician, infanticipate < infant + anticipate (11).*

*Qarışıq söz (a blend)* və ya digər adları ilə *füzyon, teleskop söz, portmanto sözü* iki sözün hissələrini birləşdirən və birləşdirici element kimi ortaq hərfləri və ya/və səsləri özündə birləşdirən sözdür.

Blendinq 15-ci əsrdən bəri məlumdur. İlk qarışıq sözlər komik və ya sirli xarakter daşıyırdı, çünki bunlar oxucuların və ya dinləyicilərin anlamasına çətinlik yaradırdı. Teleskopik sözlərə U.Şekspirin (*trimpherate* < *triumph+ triumvirate*), E.Spenserin (*wrizzle* < *wrinkle* + *frizzle*) əsərlərində rast gəlinir.

Portmanto sözü termini Lewis Carroll tərəfindən 1872-ci ildə "*Through the Looking Glass*" əsərində "*Jabberwocky*" adlı cəfəng şeirdə uydurduğu bəzi sözləri izah etmək üçün istifadə edilmişdir, məsələn, *galumph* < *gallop + triumph, chortle* < *chuckle + snort (11).*

***3. Səs mübadiləsi.***

Səs mübadiləsi, bəzi səslərin yeni söz yaratmaq üçün dəyişdirildiyi zaman söz yaratma üsuludur. Müasir ingilis dilində qeyri-məhsuldar olsa da, əvvəllər köhnə ingilis dilində məhsuldar idi.

İngilis dilində səs mübadiləsi söz quruculuğunda müəyyən rol oynamaq üçün istifadə olunur: məsələn, *sit – sat, fall – fell; food – feed, tooth – teeth*.

Samitlərin dəyişməsi daha nadir haldır: məsələn, *advice – advise*.

Digər hallarda həm sait, həm də samit mübadiləsi baş verir: məsələn, *bath – to bathe, grass – to graze*.

Bəzən səs mübadiləsi affiksasiya ilə müşayiət olunur: məsələn, *deep – depth, long – length*.

Səs mübadiləsinin səbəbləri müxtəlif ola bilər. Alimlərə məlum olan dilin inkişafı dövründə fonetik qanunlarla izah edilə bilməyən Qədim Ablautun nəticəsi ola bilər: məsələn, *to strike - stroke, to sing - song və s (11).*

O, həm də Qədim Umlaut və ya kökdən sonra gələn hecadakı ön sait səbəbindən kök saitin palatallaşdırılmasının nəticəsi olan sait mutasiyasının nəticəsi ola bilər (reqressiv assimilyasiya): məsələn, *hot - to heat (hotian), blood - to bleed (blodian) və s.*

Bir çox hallarda bizdə sait və samit mübadiləsi olur. İsimlərdə səssiz samitlər, feillərdə isə uyğun səsli samitlər var, çünki köhnə ingilis dilində isimlərdəki bu samitlər sözün sonunda, feillərdə isə intervokal mövqedə idi: məsələn, *bath - to bathe, life - to live, breath - to breathe və s (11).*

***4. Vurğu mübadiləsi / Fərqli vurğu.***

Vurğu mübadiləsinə daha çox roman mənşəli feil və isimlərdə rast gəlmək olar: isimlərdə vurğu birinci hecada, feillərdə isə sonuncu hecada olur, məsələn, *`accent - to ac`cent*.

Bu hadisə belə izah olunur: Fransız feilləri və isimləri ingilis dilinə alındıqda fərqli quruluşa malik idilər, belə ki, feillər uyğun isimlərdən bir heca çox idi. Bu alınmalar ingilis dilində mənimsənildikdə onlarda vurğu əvvəlki hecaya (sondan ikinci) köçürüldü.

Sonralar fransız dilindən götürülmüş fellərdə sonuncu vurğusuz heca düşür (doğma fellərdə olduğu kimi) və bundan sonra fellərdə vurğu sonuncu hecada, isimlərdə isə birinci hecada olmuşdur. Bunun nəticəsində biz ingilis dilində belə cütlərə sahibik: məsələn, *to af`fix -`affix, to con`flict- `conflict, to ex`port -`export, to ex`tract - `extract* və s (Trask, 1997).

Vurğu dəyişməsi nəticəsində bizdə də belə sözlərdə sait dəyişməsi olur, çünki saitlər vurğulu və vurğusuz vəziyyətdə fərqli tələffüz olunur.

Latın və ya fransız mənşəli bir çox ingilis feilləri müvafiq isimlərdən vurğunun mövqeyinə görə fərqlənir: məsələn, *'conduct – to con'duct, 'present – to pre'sent, 'export – to ex'port, 'import – to im'port (13).*

Vurğu mübadiləsi yalnız isim və feildən ibarət söz cütləri ilə məhdudlaşmır. Sifətlər və zərflər də bu prosesdən keçə bilər: məsələn, *'frequent - to fre'quent, 'absent – to ab'sent*.

Bununla belə, vurğu fərqi nə məhsuldar, nə də müntəzəmdir. Vurğulanmış və buna görə də müvafiq isimlərlə omonim olan bir çox denominal (isimdən yaranmış) feil var: məsələn, *'figure – to 'figure, 'programme – to 'programme*.

Həm isimlərdə, həm də feillərdə ikinci hecanın vurğusunu saxlayan böyük bir alınma sözlər qrupu vardır: məsələn, *ac'count – to ac'count, de'feat – to de'feat*.

Qeyd etmək lazımdır ki, hər hansı digər fərqləndirici amillə müşayiət olunmayan tək vurğu sözlərin fərqləndirilməsi üçün çox təsirli vasitə kimi görünmür və yəqin ki, elə bu səbəbdən də vurğunun dəyişdirilməsi ilə yeni söz söz yaratma üsulu nə müntəzəm, nə də məhsuldar xarakter daşımır.

***5. Səs imitasiyası/reduplikasiya.***

Müxtəlif səsləri təqlid edərək yeni bir söz əmələ gətirən söz yaratma üsuludur. Səs təqlidi üçün digər terminlər onomatopeya və exoizmdir.

Bu cür söz quruculuğu ilə yaranan sözlər heyvanlar, quşlar, insanlar və cansız cisimlər tərəfindən yarana bilən müxtəlif səs növlərini təqlid etməklə formalaşır.

Səs təqlidi yolu ilə əmələ gələn bəzi semantik söz qrupları var

a) İnsanların yaratdığı səslər, məsələn: *to whisper (pıçıldamaq), to giggle (gülmək), to mumble (mızıldamaq), to sneeze (asqırmaq), to whistle (fit çalmaq)* və s.

b) Heyvanlar, quşlar, həşəratlar tərəfindən yaradılan səslər: *to hiss (fişıltı), to buzz (vızıltı), to bark (hürmək), to moo (inəklərin çıxardığı səs/moolamaq)* və s.

c) Təbiətin və əşyaların yaratdığı səslər, məsələn: *to splash (sıçramaq), to rustle (xışıltı), to clatter (tıqqıltı), to bubble (köpürmək), to tinkle (cingilti)* və s.

## Nəticə

İngilis dili çox dinamik bir dildir və daimi öyrənmə tələb edir. Hər hansı digər dil kimi bu da bu tarixi mərhələdə insanların həyatının xüsusiyyətlərinin əksidir. Daimi tədqiqə ehtiyacı olan ən qeyri-sabit hadisələrdən biri də yeni sözlərin yaranması ilə dilin lüğət tərkibinin yenilənməsidir.

İngilis dilində yeni sözlərin yaranması müxtəlif amillərlə bağlıdır, bunlardan başlıcası lüğət təyinatını tələb edən yeni reallıqların yaranması, mövcud mədəniyyət və məişət obyektlərinin dəyişdirilməsi və dəyişdirilməsi, əhalinin miqrasiyası ilə əlaqədar mədəni və dil sərhədlərinin dəyişməsi misal göstərilə bilər. Aparılan tədqiqatlar nəticəsində məlum olmuşdur ki, ingilis dilində yeni sözlərin yaranması prosesinin məhsuldar və qeyri-məhsuldar növləri mövcuddur. Məhsuldar növlərə şəkilçilərdən istifadə, başqa dillərdən sözlərin alınması, konversiya kimi üsullar, qeyri-məhsuldar növlərə isə qısaltma, səs imitasiyası/reduplikasiya, səs mübadiləsi, vurğunun dəyişməsi, qarışdırma/blending kimi üsullar daxildir. Bu tədqiqat işinin mərkəzində ingilis dilində söz yaradıcılığının qeyri-məhsuldar formaları ətraflı şəkildə araşdırılmış və hər biri ilə bağlı çoxsaylı nümunələr göstərilərək izah edilmişdir. Beləliklə, tədqiqat işində öz əksini tapan məlumatlardan, əldə olunmuş nəticədən seminarlarda, dərsliklərdə istifadə oluna bilər.

## Ədəbiyyat

1. Asmus, N.G. (2005). Lingvisticheskiye osobennosti virtual'nogo kommunikativnogo prostranstva: dis. kand. filol. nauk: 10.02.19. Chelyabinskiy gos. un-t. Chelyabinsk, 265 s.
2. Barinova, S.O., Gertsena, A.I. (2007). Klassifikatsiya sokrashcheniy v yazyke Interneta (na materiale angliyskogo yazyka). Izvestiya RGPU im. № 33, s.24-27.
3. https://notesread.com/50-examples-of-apocope/
4. Hacken, P., Thomas, C. (2013). The Semantics of Word Formation and Lexicalization. Edinburgh University Press.
5. Plag, I. (2002). Word Formation in English. Cambridge University Press, 95 p.
6. Bauer, L. (1983). English Word Formation. Cambridge University Press, 633 p.
7. Harley, H. (2006). English Words: A Linguistic Introduction, 7th ed. Oxford: Blackwell, 57 p.
8. en.m.wikipedia.org
9. https://www.oxfordlearnersdictionaries.com/
10. Hurford, R., Brendan, H., Michael, B. (2007). Semantics: A Course Book (2nded.) Cambridge: Cambridge University Press.
11. **Error! Hyperlink reference not valid.**
12. Trask, R.L. (1997). A Student's Dictionary of Language and Linguistics. A Hodder Arnold Publication.
13. https://www.thoughtco.com/what-is-aphaeresis-words-1688993

Göndərilib: 05.10.2023 Qəbul edilib: 27.11.2023

DOI: https://doi.org/10.36719/2663-4619/97/20-25

**Ağasəməd Yəhyalı**
Azərbaycan Dövlət İqtisad Universiteti (UNEC)
magistrant
yahyaliagasamed@gmail.com

# YEMƏK SİFARİŞİ PLATFORMALARINDA QİDA ÇATDIRILMASI XİDMƏTLƏRİNİN İŞ PRİNSİPİ

**Xülasə**

Elekron ticarət müəssisələrin məhsul və xidmətlərini onlayn mağazalar və ya e-ticarət bazarları vasitəsilə satılmasıdır. İnternetin meydana gəlməsi ilə alış-veriş proseslərində dəyişiklik meydana gəldi. Hazırda insanlar daha çox onlayn satış edən müəssisələrdən alış-veriş edirlər və brend şirkətlər də onlayn mağazalar vasitəsilə satışını təmin edir. Onlayn satışın təşkili üçün rəqəmsal transformasiyasının ardıcıl tətbiqi zəruri xarakter kəsb edir. Təklif olunan iaşə məhsulları haqqında məlumat saytda yerləşdirilməlidir. Burada müəssisənin adı, yemək hazırlanan stasionar obyektin ünvanı və iş rejimi yazılmalıdır.

Məqalədə yemək sifarişi platformalarında qida çatdırılması xidmətlərinin iş prinsipi haqqında məlumat verilmişdir. Müasir dövrdə uzaqdan alış-veriş etmək, onu kuryerlə almaq, eləcə də bank kartı ilə ödəniş etmək normal haldır. Belə olan halda o, göstərdiyi xidmətə görə malın dəyərinin neçə faizinin kuryerə verilməli olduğunu və həmin cəhətin qanunla tənzimlənmədiyini diqqətə çatdırır.

Şəxsi aktivləri olan kuryer xidməti logistika xidmətlərinin tam spektrini təqdim edir. Kuryer xidmətinin resursları eyni zamanda çoxlu sayda fiziki şəxslərə və iri korporativ müştərilərə keyfiyyətli xidmətlər göstərmək üçün nəzərdə tutulub. Hazırda qida çatdırılması sənayesi sürəli bir şəkildə inkişaf edir. Analitiklər yaxın illərdə restoranlar tərəfindən çatdırılan yeməklərin sayının durmadan artacağını proqnozlaşdırırlar. Bu proses istehlakçılar tərəfindən bəyənilir və insanlara sürətli çatdırılma ilə pul qazanmağa imkan verir. Restoranlar da çatdırılma platformasında öz təsirlərini artıra və sifariş qəbul etmək üçün daha çox imkanlara sahib ola bilərlər.

***Açar sözlər:*** *internet, elektron ticarət, onlayn bazar, yemək sifarişi, qida çatdırılması, kuryer xidmətləri*

**Aghasamad Yahyali**
Azerbaijan State University of Economics (UNEC)
master student
yahyaliagasamed@gmail.com

## The working principle of food delivery services on food ordering platforms

**Abstract**

E-commerce is the sale of products and services by businesses through online stores or e-commerce marketplaces. With the advent of the Internet, there has been a change in shopping processes. Nowadays, people are increasingly buying from businesses that sell online, and brand companies are also selling through online stores. The consistent application of digital transformation is necessary for the organization of online sales. Information about the offered catering products should be posted on the website. The name of the enterprise, the address of the stationary facility where food is prepared, and the mode of operation should be written here.

The article provides information about the working principle of food delivery services on food ordering platforms. In modern times, it is normal to shop remotely, to receive it by courier, as well as to pay by bank card. In such a case, he points out that what percentage of the value of the goods should be given to the courier for the service he provides and that aspect is not regulated by law. Courier service with private assets provides a full range of logistics services.

mükafat müqabilində vəzifəli şəxsin qərarına qanunsuz təsir göstərmək imkanına malik olduğunu bildirən şəxs tərəfindən maddi və sair nemətlərin, imtiyazların və ya güzəştlərin qəbul edilməsi və ya belə maddi və sair nemətlərin, imtiyazların və ya güzəştlərin verilməsi ilə bağlı təklifin və ya vədin qəbul edilməsi kimi göstərilmişdir (8).

Qeyd edilən əməllərin subyektləri qismində isə qanunvericilikdə qeyd olunan aşağıdakı şəxslər ola bilər (8):

- Azərbaycan Respublikasının Konstitusiyası və qanunları ilə müəyyən olunmuş qaydada dövlət orqanlarına seçilmiş və ya təyin edilmiş şəxslər;
- xüsusi səlahiyyət əsasında dövlət orqanlarını təmsil edən şəxslər;
- inzibati vəzifə tutan dövlət qulluqçuları;
- dövlət orqanlarının müvafiq struktur vahidlərində, dövlət idarə, müəssisə və təşkilatlarında, habelə dövlətin nəzarət səhm zərfinə sahib olduğu təsərrüfat subyektlərində təşkilati-sərəncamverici və ya inzibati-təsərrüfat funksiyalarını həyata keçirən şəxslər;
- Azərbaycan Respublikasının dövlət orqanlarında seçkili vəzifələrə namizədliyi qanunla müəyyən olunmuş qaydada qeydə alınmış şəxslər;
- Azərbaycan Respublikasının qanunvericiliyi ilə müəyyən edilmiş qaydada yerli özünüidarəetmə orqanlarına seçilmiş şəxslər;
- yerli özünüidarəetmə orqanlarında təşkilati-sərəncamverici və ya inzibati-təsərrüfat funksiyalarını həyata keçirən şəxslər;
- qurumların rəhbərləri və işçiləri, o cümlədən qurumlarda xüsusi səlahiyyət üzrə təşkilati-sərəncamverici və ya inzibati-təsərrüfat funksiyalarını həyata keçirən şəxslər (9);
- qanunla müəyyən edilmiş hallarda dövlət orqanlarının səlahiyyətlərini yerinə yetirən qeyri-dövlət orqanlarında təşkilati-sərəncamverici və ya inzibati-təsərrüfat funksiyalarmı həyata keçirən şəxslər;
- öz nüfuzundan və ya əlaqələrindən istifadə edərək vəzifəli şəxsin qərarına qanunsuz təsir göstərmək müqabilində maddi və sair nemətlər, imtiyazlar və ya güzəştlər əldə edən şəxslər;
- vəzifəli şəxsə qanunsuz olaraq maddi və sair nemətlər, imtiyazlar və ya güzəştlər təklif edən və ya vəd edən, yaxud verən fiziki və hüquqi şəxslər və ya belə hərəkətlərdə vasitəçilik etmiş şəxslər.

Qeyd edilən "Vəzifəli şəxs"-lərin də dairəsi müəyyən edilmişdir. Belə ki, Azərbaycan Respulbikasının Cinayət Məcəlləsinin 308-ci maddəsinin qeyd hissəsində hakimiyyət nümayəndələri, o cümlədən Azərbaycan Respublikasının Konstitusiyası və qanunları ilə müəyyən olunmuş qaydada dövlət orqanlarına seçilmiş və ya təyin edilmiş, yaxud xüsusi səlahiyyət əsasında dövlət və ya yerli özünüidarə orqanlarını təmsil edən şəxslər, zabit, gizir və ya miçman olan hərbi qulluqçular, dövlət qulluğunun xüsusi növündə çalışan şəxslər, bələdiyyə üzvləri və bələdiyyə qulluqçuları, dövlət orqanlarında seçkili vəzifələrə namizədliyi qanunla müəyyən edilən qaydada qeydə alınmış şəxslər, dövlət və bələdiyyə müəssisə, idarə və təşkilatlarının, beynəlxalq məhkəmələrin hakimləri və digər vəzifəli şəxsləri, publik hüquqi şəxslərin, həmçinin kommersiya və qeyri-kommersiya təşkilatlarının rəhbərləri və işçiləri, dövlət və bələdiyyə müəssisə, idarə və təşkilatlarında, publik hüquqi şəxslərdə, həmçinin kommersiya və qeyri-kommersiya təşkilatlarında xüsusi səlahiyyət üzrə təşkilati-sərəncamverici və ya inzibati-təsərrüfat funksiyalarını yerinə yetirən şəxslər, hüquqi şəxs yaratmadan sahibkarlıq fəaliyyəti ilə məşğul olan şəxslər, xarici ölkələrin dövlət orqanlarının vəzifəli şəxsləri, xarici ölkələrin seçkili dövlət orqanlarının üzvləri, beynəlxalq təşkilatların vəzifəli şəxsləri və digər qulluqçuları, dövlət qulluqçuları, beynəlxalq parlament assambleyalarının üzvləri, Azərbaycan Respublikası və ya xarici ölkələrin qanunlarına, Azərbaycan Respublikasının tərəfdar çıxdığı beynəlxalq müqavilələrə əsasən fəaliyyət göstərən yerli, xarici və beynəlxalq arbitrlər, xarici və ya yerli andlı iclasçılar vəzifəli şəxs kimi göstərilmişdir (10).

Milli qanunvericilikdə korrupsiyaya qarşı mübarizə məqsədi ilə bir sıra tədbirlərin həyata keçirilməsi təsbit olunmuşdur. "Korrupsiyaya qarşı mübarizə haqqına" qanunda maliyyə xarakterli tələblərin irəli sürülməsi, maliyyə xarakterli tələblərin pozulmasına görə məsuliyyət, qohumların

birgə işləməsinə yol verilməməsi, hədiyyə alma ilə əlaqədar məhdudlaşdırmalar və s. korrupsiyanın qarşısının alınmasına yönələn tədbirlərdir (11).

Həmçinin "Korrupsiya ilə əlaqədar cinayət məsuliyyəti haqqında" Konvensiyada orqanların korrupsiya ilə mübarizə üzrə ixtisaslaşmasını təmin etmək üçün tələb edilən tədbirləri həyata keçirilməsi məqsədi ilə Azərbaycan Respublikasının Korrupsiyaya qarşı mübarizə üzrə Komissiyası təsis edilmişdir. Komissiyanın məqsədi korrupsiyaya qarşı mübarizə üzrə dövlət proqramlarının icrasına nəzarəti həyata keçirmək, mübarizənin vəziyyətini və səmərəliliyini təhlil etmək, hüquqpozmalarla bağlı məlumatları toplamaq, təhlil etmək, ümumiləşdirmək və müvafiq dövlət orqanlarına, digər qurumlara təkliflər vermək və s. fəaliyyəti həyata keçirməkdən ibarətdir (6).

Bundan basqa korrupsiya cinayətlərinin müəyyən edilməsi və istintaqının aparılması məqsədi ilə Azərbaycan Respublikası Prezidentinin 2004-cü ilin 3 mart tarixli "Korrupsiyaya qarşı mübarizə haqqında Azərbaycan Respublikasının Qanununun tətbiq edilməsi barədə" Sərəncamı əsasında Azərbaycan Respublikasının Baş prokuroru yanında Korrupsiyaya qarşı Mübarizə İdarəsi yaradılmışdır. Əsasnaməyə uyğun olaraq bu ixtisaslaşmış qurum korrupsiya ilə əlaqədar hüquqpozmalara dair daxil olmuş məlumatlara baxır və araşdırma aparır, korrupsiya ilə bağlı cinayətlərlə əlaqədar cinayət işi başlayır və ibtidai istintaq aparır, cinayətlərin törədilməsi nəticəsində vurulmuş maddi ziyanın ödənilməsi, həmçinin, tətbiq oluna biləcək əmlak müsadirəsinin təmin edilməsi üçün qanunvericiliklə nəzərdə tutulmuş tədbirlər görür, korrupsiyaya qarşı mübarizə sahəsində maarifləndirmə və profilaktik tədbirləri həyata keçirir (12).

## Nəticə

Korrupsiya ilə mübarizə Azərbaycan və eyni zamanda digər xarici dövlətlər üçün vacib bir məsələdir və ölkədə bu sahədə bəzi strukturlar və tədbirlər həyata keçirilmişdir. Korrupsiyanın sosial, iqtisadi, və demokratik inkişafa təsir etməsi və həm də beynəlxalq qurum və təşkilatlarla əməkdaşlığın təmin edilməsi bu məsələninin əhəmiyyətini əks etdirir.

Azərbaycanın Birləşmiş Millətlər Təşkilatının Korrupsiyaya Qarşı Konvensiyasına üzv olması, fəaliyyətini bu sahədə dünya standartları ilə müqayisədə etməsi və beynəlxalq təşkilatlarla əməkdaşlığını gücləndirir. BMT-nin Korrupsiyaya Qarşı Konvensiyası (UNCAC) ilə ölkə, korrupsiya ilə mübarizədə daha böyük bir əməkdaşlıq və məsuliyyət almağa əlavə olaraq, korrupsiya ilə mübarizə sahəsində dünya miqyasında standartlara çatmağı hədəfləyir.

Əlavə olaraq, ölkədə korrupsiya ilə mübarizə üçün müvafiq qanunvericilik aktları qəbul edilmiş və müstəqil orqanlar təsis edilmişdir. Korrupsiyaya qarşı mübarizə Komissiyası korrupsiya ilə mübarizə üzrə dövlət proqramlarının icrasını nəzarət etmək, məlumatları toplamaq və müvafiq təhlil etmək məqsədi ilə fəaliyyət göstərir.

Əsas hüquqi sazişlərdən biri olan "Korrupsiya ilə əlaqədar cinayət məsuliyyəti haqqında" Konvensiya, ölkəni korrupsiya ilə mübarizə strategiyasının müəyyənləşdirilməsi sahəsində beynəlxalq standartlar və tələblərə uyğunlaşdırma baxımından olduqca mühümdür.

Göründüyü kimi, Azərbaycanın korrupsiya ilə mübarizə sahəsində beynəlxalq qurumlar və dövlətlərlə əməkdaşlığı və özü ilə bağlı inkişaf yönümlü fəaliyyətini artırmağa dair ciddi səylər göstərdiyi müşahidə edilir. Bu fəaliyyəti davam etdirərək və müstəqil orqanları gücləndirərək, ölkə bu sahədə daha böyük nailiyyətlər əldə etmək potensialına malikdir.

## Ədəbiyyat

1. "Korrupsiya ilə əlaqədar cinayət məsuliyyəti haqqında" Konvensiyasının təsdiq edilməsi barədə Azərbaycan Respublikasının Qanunu. https://e-qanun.az/framework/5406
2. https://www.iaca.int/who-we-are.html
3. Azərbaycan Respublikasinin Cinayət Məcəlləsi. https://e-qanun.az/framework/46947
4. Azərbaycan Respublikasının Korrupsiyaya qarşı mübarizə üzrə Komissiyası haqqında Əsasnamənin təsdiq edilməsi barədə Azərbaycan Respublikasının Qanunu. https://e-qanun.az/framework/9912
5. "The History of Ancient Egypt" by Bob Brier and Hoyt Hobbs.

6. https://www.unov.org/unov/en/library.html
7. Birləşmiş Millətlər Təşkilatının Korrupsiyaya Qarşı Konvensiyası. https://www.unodc.org/unodc/en/corruption/ratification-status.html
8. Birləşmiş Millətlər Təşkilatının Korrupsiya əleyhinə Konvensiyasının təsdiq edilməsi haqqında. https://e-qanun.az/framework/10784
9. "Korrupsiya ilə əlaqədar mülki-hüquqi məsuliyyət haqqında" Konvensiyanın təsdiq edilməsi barədə Azərbaycan Respublikasının Qanunu. https://e-qanun.az/framework/5407
10. “Korrupsiyaya qarşı mübarizə haqqında” Azərbaycan Respublikasının Qanunu. https://e-qanun.az/framework/5809
11. Prokurorluq haqqında qanun. https://e-qanun.az/framework/5229
12. “AR Baş prokuroru yanında Korrupsiyaya qarşı Mübarizə Baş İdarəsinin Əsasnaməsi”.

Göndərilib: 11.09.2023 Qəbul edilib: 20.11.2023

DOI: https://doi.org/10.36719/2663-4619/97/38-42

**Ləman Cabbarlı**
Azərbaycan Respublikasının Prezidenti yanında
Dövlət İdarəçilik Akademiyası
magistrant
cabbarlilaman@gmail.com
**Ümbülbanu Talıbova**
Azərbaycan Respublikasının Prezidenti yanında
Dövlət İdarəçilik Akademiyası
magistrant
btalibova1@gmail.com

# AZƏRBAYCANDA MÜLKİYYƏTİN KONSTİTUSİON VƏ HÜQUQİ MÜDAFİƏSİ

**Xülasə**

"Mülkiyyət" anlayışı müasir təşkilatlar və fərdi həyatda vacib anlayışlardan biridir. "Mülkiyyət" termini çoxmənalı anlayışdır və hüquq ədəbiyyatında əsasən üç mənada işlənir: fəlsəfi, iqtisadi və hüquqi mənalarda. Fəlsəfi mənada mülkiyyət dedikdə, cəmiyyətdəki əmlak münasibətlərinin ifadəsi, əmlaka sahiblik başa düşülür. İqtisadi mənada mülkiyyət ictimai-iqtisadi münasibətdir; hüquqi mənada mülkiyyət, mülkiyyət hüququ anlayışı ilə əhatə olunur və o, hüquq normalarının məcmuyunda ifadə olunur.

Mülkiyyət hüquqlarından səmərəli istifadə etmək imkanı müvafiq subyektiv hüquqların həyata keçirilməsini təmin etməyə yönəlmiş qanunvericilikdə nəzərdə tutulmuş mühafizə tədbirləri ilə birbaşa əlaqəlidir. Bu gün Azərbaycanda fiziki və hüquqi şəxslərin mülkiyyəti müxtəlif daşınmaz və daşınar əmlak obyektlərindən ibarətdir. Bu baxımdan, praktik olaraq əhəmiyyətli olan əsas vəzifələrdən biri əmlak sahiblərinin hüquqlarının, maraqlarının real qorunmasını təmin etməkdir.

"Mülkiyyət" termini olmadan nə məişət, iqtisadi, fəlsəfi lüğət, nə də hüquq elmi təsəvvü edilə bilməz. Mülkiyyət hüquqlarının müdafiəsi Azərbaycan Respublikasında konstitusiya, mülki, inzibati və cinayət mühakiməsi yolu ilə həyata keçirilən ən mühüm sosial yönümlü funksiyalardan biridir. Konstitusiya icraatı digər icraat növləri ilə yanaşı, dövlətdə mülkiyyətin qorunmasını təmin edən mühüm və səmərəli mexanizmlərdən biridir.

***Açar sözlər:*** *mülkiyyət, mülkiyyətin mühafizəsi, xüsusi mülkiyyət, dövlət mülkiyyəti, bələdiyyə mülkiyyəti, mülkiyyətin məhkəmə müdafiəsinin dəyəri*

**Laman Jabbarli**
The Academy of Public Administration under the
President of the Republic of Azerbaijan
master student
cabbarlilaman@gmail.com
**Umbulbanu Talibova**
The Academy of Public Administration under the
President of the Republic of Azerbaijan
master student
btalibova1@gmail.com

## Constitutional and legal protection of property in Azerbaijan

**Abstract**

The concept of "property" is one of the most important for modern organizations and individual life. The term "property" is an ambiguous concept and is used in legal literature mainly in three meanings: legal, economic and philosophical. In the philosophical meaning, property is understood

as the expression of property relations in society, ownership of property. In the economic meaning, property is a socio-economic relationship; in the legal meaning, property is covered by the concept of property law, and it is expressed in the totality of legal norms.

The possibility of effective use of property rights is directly related to the protection measures provided for by legislation aimed at ensuring the implementation of relevant subjective rights. Today, the property of individuals and legal entities in Azerbaijan consists of various immovable and movable property objects.In this regard, one of the main tasks, which is practically significant, is to ensure real protection of the rights, interests of property owners.

Without it, neither household, economic, philosophical vocabulary, nor legal science can be imagined. Protection of property rights is the most important socially oriented function implemented in the Republic of Azerbaijan through constitutional, civil, administrative and criminal proceedings. Constitutional proceedings, along with other types of proceedings, are one of the important and efficient mechanisms that ensure the protection of property in the state.

***Keywords:*** *property, protection of ownership, private, state, municipal property, the value of judicial protection of ownership*

## Giriş

İqtisadi hüquqlar arasında ən əsas hüquq mülkiyyət hüququdur. Mülkiyyət hüququ ən qədim hüquqlardandır. 1793-cü il Fransa konstitusiyasında göstərilirdi ki, mülkiyyət hüququ hər bir vətəndaşa məxsusdur və o öz istədiyi kimi bu hüquqdan istifadə edə bilər. Yəni bütün insanların mülkiyyəti toxunulmazdır və əgər bir gün hansısa şəxs tərəfindən bu toxunulmazlıq pozularsa o zaman dövlət bu hüququn bərpa edilməsi baxımından müəyyən addımlar atır (Alekseyev, 2017: 65).

Hər bir dövlətdə mülkiyyət və mülkiyyət mərkəzi yer tutur. "Mülkiyyət" termini olduqca qeyri-müəyyəndir və vahid dəqiq tərifi yoxdur: birbaşa kiməsə məxsus əmlak, hökmranlıq, mülkiyyət kimi başa düşülür.

İqtisadiyyatın sosial inkişaf üçün həlledici qüvvəyə çevrildiyi müasir dinamik cəmiyyətdə Azərbaycan hüquq sistemi kontekstində mülkiyyət və mülkiyyət hüququ anlayışlarının fərqləndirilməsinin aktuallığı daha da aydın olur. Hüquq ədəbiyyatı bu anlayışların xarici oxşarlığına baxmayaraq, daha dərin təhlil tələb edən fərqlərə və əlavə nüanslara sahib olmasına diqqət yetirir.

Ekspertlər bildirirlər ki, mülkiyyət hüququ mütləq hüquq olduğu üçün hər kəsdən müdafiə edilir. Buna görə də qanun, mülkiyyətçiyə, onun səlahiyyətlərini həyata keçirməyə imkan verməyən hər cür maneələri dəf etmək hüququ verir. Qanuna görə mülkiyyət hüququnun həyata keçirilməsi ətraf mühitə zərər vurmamalı, qanunların və ya üçüncü şəxslərin hüquqlarını pozmamalı, cəmiyyətin, xüsusilə dövlətin qanunla qorunan mənafelərinə zidd olmamalı, yaxud hüquqdan sui-istifadə edilməməlidir. Mülkiyyətçinin sahiblik və istifadəsində olan əmlak üzərində hüquqlarını həyata keçirmək üçün təkcə o lazımdır ki, üçüncü şəxs həmin əmlaka təcavüz etməsin. Lakin həmişə belə olmur. Əmlak üzərində sərəncam verərkən mülkiyyətçi konkret şəxslə hüquq münasibətinə girir (Belyakova, 1986: 235).

Qeyd etmək lazımdır ki, mülkiyyət hüququnun dərk edilməsinə iki perspektivdən yanaşmaq olar: obyektiv və subyektiv. Birinci perspektiv maddi malların alınması ilə əlaqəli münasibətləri tənzimləyən hüquq normaları sisteminə, habelə sahibinin bu əmlaka sahib olmaq, istifadə etmək və sərəncam vermək hüquqlarına aiddir. İkinci, subyektin öz mülahizəsinə görə əmlakına sahib olmaq, istifadə etmək və sərəncam vermək üçün dövlət tərəfindən tanınan və qorunan hüquqları deməkdir.

Azərbaycan Respublikasının Konstitusiyasında bütün mülkiyyət formalarının toxunulmazlığını və bərabərliyini təmin edən müddəalar mövcuddur. Bu müddəa Ümumdünya İnsan Hüquqları Bəyannaməsinin 17-ci maddəsinədə qeyd olunmuşdur, (“Heç kimin öz əmlakından özbaşınalıqla məhrum edilə bilməz”) (3).

Azərbaycan Respublikasının Mülki Məcəlləsinin 152-ci maddəsi subyektiv mənada mülkiyyət hüququ dedikdə, subyektin ona mənsub əmlaka (əşyaya) öz istədiyi kimi sahib olmaq, ondan istifadə etmək və ona dair sərəncam vermək üzrə dövlət tərəfindən tanınan və qorunan hüquqlarını

aydınlaşdırır (4). Bu maddənin birinci hissəsinə xüsusi diqqət yetirsək görərik ki, Azərbaycanda mülkiyyət toxunulmazdır və dövlət tərəfindən qorunur.Qanunvericiliyə uyğun olaraq fiziki və ya hüquqi şəxslərə mənsub ola bilməyən əmlakın ayrı-ayrı növləri istisna edilməklə, fiziki və hüquqi şəxslərin mülkiyyətində istənilən əmlak ola bilər. Buraya topraq sahələri, yaşayış evləri, mənzillər, bağlar, bağ evləri, qarajlar, ev təsərrüfatı ləvazimatları, şəxsi istehsal predmetləri, pul vəsaitləri və s. daxildir.

Mülkiyyətin başqa bir növü də əqli mülkiyyət hüququdur. Əqli mülkiyyət özü də iki yerə bölünür: Müəlliflik və patent hüquqları. Müəlliflik hüququ – misal üçün siz kitab yazmışsınız və belə bu zaman bu kitaba sizin müəlliflik hüququnuz yaranır. Müəlliflik hüququ şəxslər üçün ömürlükdür. O öldükdən sonra onun vərəsələri üçün 50 il müddətinə tanınır. Patent hüququ- misal üçün siz yeni bir kimyəvi maddə ixtira etmişsiniz. Bu zaman sizin patent hüququnuz yaranır. Bu hüquq konkret fərd üçün 20 il müddətə qüvvədə olur.

Bu aspekt Azərbaycan iqtisadiyyatının qarşısında duran müasir çağırışlar fonunda kritik əhəmiyyət kəsb edir. Ölkənin sosial-iqtisadi inkişaf dinamikasında mülkiyyət və mülkiyyət arasındakı fərqləri anlamaq, xüsusən də hüquqi kontekstdə ədalətli, sabit və davamlı mülkiyyət münasibətləri sistemi yaratmaq üçün təməl daşa çevrilir. Bu, həm də investisiyaların cəlb edilməsində və milli iqtisadiyyatın rəqabət qabiliyyətinin təmin edilməsində mühüm rol oynayır (Bratus, 1976: 25).

Azərbaycan Respublikası Konstitusiyasının qəbul edilməsi onun əsas nailiyyətlərindən biridir. Məhz 12 noyabr 1995-ci il Konstitusiyasında siyahısı açıq olan mülkiyyət formalarının müxtəlifliyini tanımaq üçün hüquqi zəmin əldə etdik: xüsusi, dövlət, bələdiyyə və digər mülkiyyət formaları. Konstitusiya quruluşunun əsaslarında, yəni Azərbaycan Respublikasının Konstitusiyasının 13-cü maddəsinin 2-ci bəndində dövlət tərəfindən bərabər tanınan və qorunan mülkiyyət növlərinin siyahısı müəyyən edilmişdir. Maddənin ikinci hissəsinə əsasən mülkiyyət dövlət, xüsusi və bələdiyyə mülkiyyəti növündə ola bilər (3). Maddənin üçüncü hissəsinə əsasən mülkiyyətdən insan və vətəndaş hüququları və azadlıqları, cəmiyyətin və dövlətin mənafeləri, şəxsiyyətin ləyaqəti əleyhinə istifadə edilə bilməz. Bu müddəa Konstitusiya aktının 22-ci maddəsinə əsaslanır. Analoji müddəa bir sıra dövlətlərin konstitusiyalarında da vardır. Məsələn, Rusiya Konstitusiyasının 8-ci maddəsində deyilir: “Rusiya Federasiyasında eyni qaydada xüsusi, dövlət, bələdiyyə və mülkiyyətin başqa formaları dəstəklənir”. Buna müvafiq olaraq AR MM mülkiyyət hüququnun üç növünü müəyyən edir: fiziki və hüquqi şəxslərin mülkiyyət hüququ, yeni xüsusi mülkiyyət hüququ (AR MM-in 154-cü maddəsi), dövlət mülkiyyət hüququ (AR MM-nin 155-ci maddəsi), bələdiyyələrin mülkiyyət hüququ (AR MM-in 156-cı maddəsi) (4).

Yuxarıda göstərildiyi kimi, ARK mülkiyyətin üç fotmasını fərqlənddirir: dövlət, xüsusi və bələdiyyə mülkiyyəti. Beləliklə, dövlət tərəfindən tanınma, qorunma haqqında yuxarıda göstərilən Konstitusiya formulu, əslində Azərbaycan Konstitusiyasında təbii hüquq doktrinasının olması və mülkiyyət hüququnun tanınması barədə nəticə çıxarmağa imkan verir.

Mülkiyyət hüququ qanunların mənasını, məzmununu və tətbiqini, qanunverici və icra hakimiyyətlərinin, yerli özünüidarəetmə orqanlarının fəaliyyətini müəyyənləşdirən və ədalətlə təmin olunan əsas hüquq və azadlıqlardan biridir. Mülkiyyət hüququ vətəndaşlar və onların birlikləri tərəfindən dövlətin bu hüquqların həyata keçirilməsinə özbaşına müdaxiləsini istisna edən hüquqi bərabərliyin, mülkiyyət toxunulmazlığının və müqavilə azadlığının ümumi hüquqi prinsipləri əsasında həyata keçirilir (Gadzhiyev, 2006: 7).

Azərbaycan Respublikası Konstitusiyasının əsas maddələrindən biri 29-cu maddədir: "Mülkiyyət hüququ, o cümlədən xüsusi mülkiyyət hüququ qanunla qorunur". Beləliklə, bu hüququn subyektiv, yəni səlahiyyətli şəxsin mümkün davranışının ölçüsünü təyin edən ətraflı xarakteristikasını ehtiva edir. Azərbaycan Respublikası Konstitusiyasının 29-cu maddəsinin 3-cü hissəsinə əsasən, hər kəsin mülkiyyətində daşınar və daşınmaz əmlak ola bilər və mülkiyyət hüququ mülkiyyətçinin təkbaşına və ya başqaları ilə birlikdə əmlaka sahib olmaq, əmlakdan istifadə etmək və onun barəsində sərəncam vermək hüquqlarından ibarətdir (“Daşınmaz Əmlakın Dövlət Reyestri haqqında” Azərbaycan Respublikası Qanunu, 2004). ARK-nın 29-cu maddəsindən belə nəticəyə

gəlmək olar ki, mülkiyyətin heç bir növünə (dövlət, xüsusi və bələdiyyə mülkiyyət növləri) üstünlük verilmir. Bu məsələ ilə bağlı AR MM-in 153-cü maddəsinin dördüncü hissəsində deyilir: "Bütün mülkiyyətçilərin hüquqları eyni bərabərdə müdafiə olunur" (Xəlilov, 2007: 23).

Mülkiyyətin dövlət tərəfindən müdafiə olunması o deməkdir ki, mülkiyyət və mülkiyyət hüququ qanunla qorunur və o, birbaşa dövlətin himayəsi və qayğısı altındadır. ARK-nın 29-cu maddəsinin (mülkiyyət hüququ) beşinci hissəsində deyilir: Dövlət vərəsəlik hüququna təminat verir. Mülkiyyət hüququ, bir qayda olaraq, ayrılmazdır və bu hüququdan məhrumetməyə yalnız qanunla müəyyən olunmuş prosedurlarla ciddi şəkildə riayət edilməklə, özü də müstəsna hallarda yol verilə bilər. ARK-nın 29-cu maddəsinin (mülkiyyət hüququ) dördüncü hissəsində bu məsələ ilə bağlı deyilir: Heç kəs məhkəmənin qərarı olmadan mülkiyyətindən məhrum edilə bilməz (Braginskiy, 1998: 324). Əmlakın tam müsadirəsinə yol verilmir. Dövlət ehtiyacları və ya ictimai ehtiyaclar üçün mülkiyyətin özgəninkiləşdirilməsinə yalnız qabaqcadan onun dəyərini ədalətli ödəmək şərti ilə yol verilə bilər.

Hər bir halda mülkiyyətin bütün növlərindən istifadə cəmiyyətin ümumi rifah halının yüksəldilməsinə və dövlətin iqtisadi gücünün daha da möhkəmləndirilməsinə xidmət etməlidir. Başqa sözlə, mülkiyyətdən digər şəxslərin hüquq və azadlıqlarını pozmaq, cəmiyyətin və dövlətin mənafeyinə zərər vurmaq, habelə şəxsiyyətin şərəf və ləyaqətini alçaltmaq məqsədilə istifadəsinə yol verilmir (Sbornik uchenykh trudov, Grazhdanskoye pravo i sposoby yego zashchity, 1974: 78).

Mülkiyyət və mülkiyyət hüququ əleyhinə törədilən hüquq pozuntusu AR-in müvafiq qanunvericiliyinə əsasən məsuliyyətə səbəb olur. Təsadufi deyil ki, AR CM-in IX bölməsində mülkiyyət əleyhinə (məsələn, öğurluq, dələduzluq, soyğunçuluq, quldurluq və s.) və iqtisadi fəaliyyət sahəsində (qanunsuz sahubkarlıq, yalançı sahibkarlıq, qəsdən müflisləşdirmə, saxta müflisləşdirmə və s.) olan cinayətlərə görə cinayət məsuliyyəti nəzərdə tutulmuşdur.

Beləliklə, Azərbaycan Respublikasının Konstitusiya quruluşunun əsaslarından biri kimi təkcə şəxsi mülkiyyət elan edilmir, həm də ona sahib olmaq imkanı əsas insan hüquq və azadlıqları sırasına daxil edilir.

## Nəticə

Beləliklə, Azərbaycan Respublikasında və onun subyektlərində mülkiyyət hüququnun qorunmasında konstitusiya nəzarətinin yeri barədə danışa bilərik.

Nəticə olaraq aşağıdakıları çıxarmaq olar:

● Azərbaycan Respublikasının Konstitusiyasının qəbul edilməsi onun əsas nailiyyətlərindən biridir. Məhz 12 noyabr 1995-ci il Konstitusiyasında siyahısı açıq olan mülkiyyət formalarının müxtəlifliyini tanımaq üçün hüquqi zəmin əldə etdik: xüsusi, dövlət, bələdiyyə və digər mülkiyyət formaları. Bu formalar dövlət tərəfindən bərabər tanınır və qorunur;

● Azərbaycan Respublikasında mülkiyyət hüququnun qorunmasının əsas təminatlarından biri Konstitusiya, Mülki, İnzibati və Cinayət məhkəmə icraatları vasitəsilə həyata keçirilən məhkəmə müdafiəsidir;

● Konstitusiya məhkəmə icraatı digər məhkəmə icraatı növləri ilə yanaşı, əmlakın qorunmasının təmin edilməsinin vacib mexanizmlərindən biridir.

● Konstitusiya mülkiyyət hüquqlarının qorunması mexanizmi müxtəlif səviyyələrdə (hüquq normaları, hüquqi münasibətlər, hüquq normalarının həyata keçirilməsi aktları) qarşılıqlı təsir göstərən tənzimləyici, qoruyucu konstitusiya və hüquqi vasitələrin vahid sistemi olan mürəkkəb bir hadisədir.

● Konstitusiya mülkiyyət hüquqlarının qorunması mexanizminin məzmunu mülkiyyət hüquqlarının qorunması sahəsində qurulmuş davranış modellərini, habelə əlaqəli qorunma obyektlərini və subyektlərini tənzimləyən hüquqi münasibətlərin məcmusudur.

Bu elmi məqalədə Azərbaycanda mülkiyyətin konstitusiya-hüquqi müdafiəsi mexanizmlərini təhlil etməyə və qiymətləndirməyə cəhd göstərilib. Tədqiqat nəticəsində mülkiyyətin qorunmasına həsr olunmuş Konstitusiya normalarının ölkənin hüquq sistemində mühüm rol oynadığı aydın olur.

Cəmiyyətin müasir çağırışları və dəyişiklikləri kontekstində, xüsusən də iqtisadiyyat sahəsində mülkiyyətin effektiv Konstitusiya və hüquqi qorunması sabitlik və inkişafın əsas elementi kimi çıxış edir. Bu normaların məhkəmə praktikasında tətbiqinin təhlili göstərir ki, onlar yalnız mülkiyyətin əsas prinsiplərini birləşdirmir, həm də onların həyata keçirilməsi mexanizmlərini təmin edir.

Bununla birlikdə, müsbət cəhətlərə baxmayaraq, mülkiyyətin Konstitusiya və hüquqi müdafiəsi sistemindəki bəzi çatışmazlıqlar, məsələn, bəzi normaların müəyyənləşdirilməsində və onların təfsirində aydınlığın olmaması, bəzi hallarda hüquqi məsələlərin həllində qeyri-müəyyənliyə və ədalətsizliyə səbəb ola bilər.

Ümumiyyətlə, tədqiqatın nəticələri əmlakın hüquqi müdafiəsi sahəsində müasir çağırışlar və dünya standartları nəzərə alınmaqla Azərbaycanda mülkiyyətin qorunması üçün konstitusiya hüquqi mexanizmlərinin daim təkmilləşdirilməsinin vacibliyini vurğulayır. Bu, mülkiyyət hüquqlarının daha effektiv dəstəklənməsinə və buna görə də ölkədə hüquqi qaydanın möhkəmlənməsinə kömək edə bilər.

## Ədəbiyyat

1. Alekseyev, S.S. (2017). Grazhdanskoye pravo: Uchebnik. V 2 t. 1. M.: Izd. dom GU-VSHE, 65 s.
2. Belyakova, A.M. (1986). Grazhdansko-pravovaya otvetstvennost za prichineniye vreda. M., Izd-vo MGU, 235 s.
3. Azərbaycan Respublikasının Konstitusiyası. (1995-2016). (24.08.2002, 18.03.2009, 26.09.2016 tarixli əlavə və dəyişikliklərlə). Bakı: Qanun, 12 noyabr, 76 s.
4. Azərbaycan Respublikasının Mülki Məcəlləsi https://eqanun.az/framework/46944
5. Bratus, S.N. (1976). Yuridicheskaya otvetstvennosti zakonnost. M., 25 s.
6. Gadzhiyev, G.A. (2006). Konstitutsionnyye osnovy sovremennogo prava sobstvennosti. Zhurnal prava. № 12, s.5-8.
7. Ümumdünya İnsan Hüquqları Bəyannaməsi. https://www.coe.int/az/web/compass/the-universal-declaration-of-human-rights-full-version
8. “Daşınmaz Əmlakın Dövlət Reyestri haqqında” Azərbaycan Respublikası Qanunu. (2004). Bakı şəhəri, 29 iyun. № 713-IIQ https://e-qanun.az/framework/5456
9. Xəlilov, Y. (2007). Azərbaycan Konstitusiyasının preambulasının və ümumi müddəalarının şərhi. Baki: Qanun, 23 s.
10. Braginskiy, M.I. (1998). Aktualnyye problemy grazhdanskogo prava, 324 s.
11. Saurin, A.A. (2013). Pravo chastnoy sobstvennosti: konstitutsionnyye kharakteristikiş. Teoriya i praktika obshchestvennogo razvitiya. № 4, 44 s.
12. Sbornik uchenykh trudov, Grazhdanskoye pravo i sposoby yego zashchity. (1974). Vyp. Sverdlovsk, 78 s.

Göndərilib: 24.10.2023 Qəbul edilib: 05.12.2023

DOI: https://doi.org/10.36719/2663-4619/97/43-54

**Ülvi İsmayılov**
Azərbaycan Respublikası Elm və Təhsil Nazirliyi
ulvimeded@gmail.com
**Rüfət Əsədzadə**
Azərbaycan Gənc Müəllimlər Assosiasiyası
anrufat@gmail.com
**Aytac Ağarəhimli**
Azərbaycan Gənc Müəllimlər Assosiasiyası
Aytaj.agarahimli@gmail.com
**Fəridə Həsənli**
Azərbaycan Respublikası Təhsil İnstitutu İnsan Resursları Mərkəzi
farida.hasanli@arti.edu.az
**Nurlan İsmayılbəyli**
Məktəbəqədər və Ümumi Təhsil üzrə Dövlət Agentliyi
nurlan.ismayilbayli@arti.edu.az

# BAZA TƏHSİLİNİN YETƏRLİLİYİ İLƏ MÜƏLLİMLİK PEŞƏSİNƏ SADİQLİK ARASINDAKİ ƏLAQƏ (GƏNC MÜƏLLİMLƏRƏ MÜNASİBƏTDƏ)

**Xülasə**

Bu tədqiqatın məqsədi gənc müəllimlərin aldıqları bazatəhsilinin yetərliliyi ilə müəllimlik peşəsinə olan sadiqlik arasındakı əlaqəni araşdırmaqdır. Tədqiqatın hədəf kütləsi 2022-2023-cü tədris ilində respublikanın müxtəlif regionlarında yerləşən ümumi təhsil müəssisələrində işləyən 35 minə yaxın gənc müəllimdir. Tədqiqatın fokus qrupunu bu populyasiyadan təsadüfi üsulla seçilmiş 878 müəllim təşkil edir. Tədqiqatda əlaqəli sorğu modelindən istifadə edilmişdir. Məlumatların toplanması üçün Kozikoğlu və Senemoğlu (2018) tərəfindən hazırlanmış “Bazatəhsilin Yetərliliyinə Dair Müəllim Təəssüratı Ölçmə Vasitəsi” və “Müəllimlik Peşəsinə Sadiqlik Ölçmə Vasitəsi”ndən istifadə edilmişdir.

Tədqiqatın nəticələri bazatəhsilinin yetərliliyi ilə müəllimlik peşəsinə sadiqlik arasında orta səviyyədə müsbət yöndə bir əlaqənin olduğunu göstərir. Bundan əlavə bazatəhsilinin yetərliliyinin müəllimlərin peşəyə olan sadiqliyi üzərində təsirli olduğu görünmüşdür. Bazatəhsilinin yetərliliyi müəllimlərin peşəyə olan bağlılığının 10%-ni, şagirdlərə olan bağlılığının 14%-ni və onların fədakarlıqlarının 12%-ni açıqlamışdır.

***Açar sözlər:*** *gənc müəllimlər, baza təhsilinin yetərliliyi, müəllimlik peşəsinə sadiqlik*

**Ulvi Ismayilov**
Ministry of Science and Education of the Republic of Azerbaijan
ulvimeded@gmail.com
**Rufat Asadzadeh**
Azerbaijan Young Teachers Association
anrufat@gmail.com
**Aytaj Agharahimli**
Azerbaijan Young Teachers Association
Aytaj.agarahimli@gmail.com
**Farida Hasanli**
Human Resources Center of the Education Institute of the Republic of Azerbaijan
farida.hasanli@arti.edu.az
**Nurlan Ismayilbeyli**
State Agency for Preschool and General Education
nurlan.ismayilbayli@arti.edu.az

## The relationship between loyalty to the teaching profession and basic education sufficience (in attitude to young teachers)

### Abstract

The purpose of this study is to investigate the relationship between the adequacy of basic education received by young teachers and commitment to the teaching profession. The target population of the study is about 35 thousand young teachers working in general educational institutions located in different regions of the republic in the 2022-2023 academic year. The focus group of the study consists of 878 teachers randomly selected from this population. A linked survey model was used in the study. The "Measurement Tool for Teacher Impressions of Adequacy of Basic Education" and "Measuring Tool for Loyalty to the Teaching Profession" developed by Kozikoglu and Senemoglu (2018) were used to collect data.

The results of the study show that there is a moderately positive relationship between the adequacy of basic education and commitment to the teaching profession. In addition, it was seen that the adequacy of basic education has an effect on teachers' commitment to the profession. Adequacy of basic education explained 10% of teachers' commitment to the profession, 14% of their commitment to students, and 12% of their dedication.

***Keywords:*** *young teachers, adequacy of basic education, commitment to the teaching profession*

### Giriş

Təhsil bir sistem və sosial fenomendir. Bu fenomeni yaradan, onu bir sistem halına gətirən dəyişənlər düzgün təhlil edilməlidir. Təhsil siyasəti, təhsil fəlsəfəsi, kurikulum, məktəb mədəniyyəti, məktəb inzibatçısı, müəllimlər, tələbələr və valideynlər təhsilin əlaqəli olduğu sistemlərdən bəziləri sayıla bilər. Təhsil problemləri mürəkkəb bir proses kimi qarşımızda dayanır, çünki təhsil müxtəlif dəyişənləri ehtiva edir və bu sistemlərdə baş verən hər cür dəyişikliklərdən təsirlənir. Təhsilin bir səviyyəsində problem həm əvvəlki addımlara, həm də sonrakı addımlara təsir edir. Məsələn, məktəbəqədər təhsilin qeyri-adekvatlığı ibtidai təhsildə öz təsirini göstərir, öz növbəsində ibtidai təhsilin keyfiyyəti də orta təhsildə təsirlidir. Bu səbəbdən də əsas təhsildəki problemlərin təsiri həm orta təhsildə, həm ali təhsildə, həm də cəmiyyətdə əksini tapır.

Təhsil bütün dünyada dövlətlərin prioritet məsələsidir. Uşaqları məktəbdə saxlamaq və təhsilin keyfiyyətini artırmaq təşəbbüsləri böyümə və rifah ssenarisini dəyişə bilər. Sabit artıma nail olmaq və təhsilin keyfiyyətini yüksəltmək üçün tədrisin planlaşdırılması, məktəbdaxili münasibətlərin balanslaşdırılaraq nizamlanması və müəllimlərin peşələrinə bağlılığı əsas amillərdəndir. Əzbər öyrənmədən müəllim və tələbələri cəlb edə biləcək konseptual metodlara keçid, bir mövzunun bəyənilib-bəyənilməməsi tədris metodlarının yenilənməsindən asılıdır. Daha yaxşı nəticə əldə etmək üçün tədris bacarıqları inkişaf etdirilməli və təkmilləşdirməlidir.

Baza təhsilin keyfiyyətini yaxşılaşdırmaq üçün müəssisə heyəti, valideynlər, ümumilikdə, bütün icmanın maraqlı tərəflərini bir araya gətirərək öz ideyalarını, problemlərini və həll yollarını bir-birləri ilə paylaşa biləcəkləri müəssisə icmasının yaradılması əhəmiyyətlidir. Beləliklə, bu, təhsil və tədris zamanı əlaqələrin, eyni zamanda məhsuldarlığın artmasında mühüm rol oynayacaqdır. Müsbət sosial qarşılıqlı əlaqə tədrisin keyfiyyətini yüksəltməklə yanaşı, öyrənənlərin akademik uğurlarına, sonrakı həyatlarında sağlam münasibətlərin, öyrənmə və məşğulluq səviyyələrinin yüksəldilməsinə, ümumilikdə isə tədris müəssisəsinin rifahı üçün çox vacibdir. Müsbət münasibətlər qurmaq üçün erkən təməlin olması vacibdir və məktəb burada mühüm rol oynaya bilər. Müəllimlərlə yaxşı münasibətlər şagirdlərin məktəb ictimaiyyətinə daha çox aidiyyət və əlaqə hiss etməsinə kömək edir və onları daha fəal iştirak etməyə təşviq edir.

Baza təhsilin keyfiyyət dərəcəsinə təsir edən faktorlar bir digəri də müəllimlərin peşələrinə sadiqliyi və bağlılığıdır. Peşəkar bağlılıq insanın öz işinə münasibətidir. Fədakar müəllim xarakter və səriştə baxımından transformasiya olunmuş, öyrənənlərin öyrənmə üslublarına həssaslıqla yanaşan müəllim olmalıdır. Peşəyə bağlılıq faktorunun yüksək olması zamanı müəllimlər metodologiya və öyrətmə baxımından fərq yaradırlar. Eyni zamanda, şagirdlərin öyrənməsinə

bağlılıq və fədakarlıq kimi mənəvi keyfiyyətlər formalaşır. Peşəyə, tədrisə bağlılıq müəllimlərin tədris metodologiyasına, anlayışına, şəxsiyyətinə, xüsusiyyətlərinə və münasibətlərinə birbaşa və müsbət töhfə verəcəkdir. Öhdəlik təhsil uğurunda əsas rol oynayır. Bu kontekstdə belə qənaətə gəlmək olar ki, peşəyə sadiqlik müəllimlərdə istək və motivasiyanı gücləndirir.

Halbesleben (2010) vurğulamışdır ki, sosial dəstək, muxtariyyət, özünü effektivlik və nikbinlik strukturlarından ibarət olan iş resursları işə bağlılığın öncülləridir. Bu səbəbdən də müəllimlərin öz peşələrinə bağlılıqlarında muxtariyyətin təsirli olacağı düşünülür. Yəni, tədris prosesində, kurikulumda, peşəkar inkişafda, peşəkar ünsiyyətdə müstəqilliyə malik olan müəllim öz peşəsinə daha çox bağlı olacaq, şagirdlərinə daha yüksək səviyyədə bağlılıq nümayiş etdirəcək, daha fədakar işləyəcək.

Müəllimlik peşəsində fədakarlıq təhsilalanların uğurlarını artırmaq üçün işə diqqət yetirmək və diqqətini peşəyə yönəltmək istəyidir. Müəllimlərin peşəkar fədakarlığı iki vəziyyəti ehtiva edir: işini çox bəyənmək və özünü təkmilləşdirmək üçün səy göstərmək. Müəllim isə təhsil vermək öhdəliyini hiss edir və buna görə də müəllim kimi şagirdlərinin öyrənməsinə üstünlük verir.

Robert Frid (2001) bu fikri dəstəkləyir və deyir ki, sevgi, həvəs ilə yanaşılan tədris və keyfiyyətli təhsil arasında əlaqə var. Səbəbləri aşağıdakı kimi sıralamaq olar:

● Müəllimin həvəsini dərk edən şagirdlər daha çox məşğul və diqqətli olacaqlar;

● Məşğulluq müəllimə effektiv metodologiya vasitəsilə əməkdaşlıq mühiti yaratmağa kömək edir və belə bir mühitdə şagird və müəllim arasında təbii qarşılıqlı əlaqə yaranır;

● Ehtiras və bağlılıq müəllimin təqdim etdiyi qarşılıqlı əlaqə və motivasiya sayəsində şagirdlərin dərslərdə fəal iştirakını artıracaq;

● Təkcə təhsili həyata keçirənlər deyil, həm də öyrənən və müəllim arasında formalaşan qarşılıqlı özünə hörmət sayəsində təhsili sinfin dörd divarından kənarda aparacaqlar;

● Müəllimlər daha çox yenilikçi olacaqlar ki, bu da tələbələrin cansıxıcı olmasının qarşısını alacaq.

Tədrisə bağlılıq müəllimlərin tədris metodologiyasına, anlayışına, şəxsiyyətinə, xüsusiyyətlərinə və münasibətlərinə birbaşa və müsbət töhfə verəcəkdir. Fədakarlıq, həvəslə silahlanmış müəllimlər təkcə öyrənənlər üçün deyil, həm də həmkarları üçün nümunə olacaqlar. Əslində, öyrənmə mühitlərinin bu təhsil praktikləri tərəfindən formalaşdırıldığını söyləmək olar.

Öhdəlik təhsil prosesində əsas rol oynayır. Bu kontekstdə belə qənaətə gəlmək olar ki, həyatımız istəkli və həvəsli müəllimlər sayəsində daha yaxşı formalaşır. Peşəyə sadiqlik onlarda həvəs, istək və motivasiyanı alovlandırır. Bu cür pedaqoqlar və onların tələbələri üçün uğur problem deyil. Öz peşəsinin vurğunu olan müəllimlər şagirdlərinə və müəllimlik peşəsinə birbaşa təsir göstərirlər. Yuxarıda qeyd edildiyi kimi, belə müəllimlər yeni ideyaları həyata keçirəcəklər. Onlar heç vaxt sahib olduqları ilə kifayətlənməyəcəklər.

Yıldırıma (Yildirim, 2019) görə, peşəkar fədakarlığın üç alt ölçüsü var. Bunlar: peşəyə bağlılıq, şagirdə sədaqət və fədakar əməkdir. Müəllimlərin peşəyə bağlılığı təhsilverən tərəfindən öz işinə, şagirdlərin təhsilinə, tədris prosesinə və təhsil müəssisəsinə olan mənəvi təmənnasını ifadə edir. Bu bağlılıq şagirdlərin öyrənmə prosesində daha yaxşı nəticələr əldə etməsinə, təhsil müəssisəsinin uğurlarına töhfə verməsinə, ümumilikdə təhsil sisteminə pozitiv təsir edir.

Bir insanın müəllimlik peşəsinə bağlılığına əhəmiyyətli dərəcədə təsir edə biləcək bir neçə amil var. Bu amillər fərddən fərdə dəyişə bilər və onların pedaqoq roluna sadiqliyinə həm müsbət, həm də mənfi təsir göstərə bilər. Müəllimlik peşəsinə bağlılığa təsir edən bəzi əsas amillər bunlardır:

● İş məmnuniyyəti: müəllimlər işlərindən məmnunluq duyduqda onların peşələrinə sadiq qalma ehtimalı daha yüksəkdir. Müsbət təcrübələr, nailiyyət hissi və şəxsi məmnunluq daha yüksək iş məmnuniyyətinə təsir edir.

● Dəstəkləyici iş mühiti: müəllimlərin töhfələrini qiymətləndirən, peşəkar inkişaf imkanlarını təmin edən və açıq ünsiyyəti təşviq edən dəstəkləyici və əməkdaşlıq mühiti müəllimlik peşəsinə daha güclü bağlılığı artırır.

● Şagirdlərlə münasibətlər: şagirdləri ilə müsbət münasibət quran və onların inkişafına və tərəqqisinə şahidlik edən müəllimlər öz peşələrinə daha çox bağlılıq hiss edirlər.

● Daxili motivasiya: şagirdlərin təhsili, tərbiyəsi və həyatında fərq yaratmaq üçün həqiqi şövqlə motivasiya olunan müəllimlər daha yüksək motivasiya nümayiş etdirirlər.

● Effektiv liderlik: təhsil müəssisələrində güclü və effektiv liderlik müəllimlərin öhdəliklərinə təsir edə bilər. Rəhbərlik və istiqamət verən dəstəkləyici və uzaqgörən liderlər müəllimlərin öz peşələrinə bağlılığını artıra bilərlər.

● Muxtariyyət və səlahiyyətlərin verilməsi: müəllimlərə öz siniflərində muxtariyyət və səlahiyyət verildikdə, kurrikulumun hazırlanmasına töhfə vermək imkanı yaratdıqda onların öz peşələrinə bağlılıqları arta bilər.

● Tanınma və rəğbətləndirmə: çətin işlərinə və töhfələrinə görə tanındıqlarını və rəğbətləndirildiklərini hiss edən müəllimlərin sadiq qalma ehtimalı daha yüksəkdir. Şagirdlər, valideynlər, həmkarlar və idarəçilərin təşəkkürləri onların peşəyə bağlılıqlarına müsbət təsir göstərə bilər.

● Karyera inkişafı: peşəkar inkişaf, davamlı öyrənmə və karyera imkanları daha yüksək məmnunluq səviyyəsinə çatmağa kömək edə bilər. Pəşəkar inkişafı üçün imkanlarlar əldə edən müəllimlər peşələrinə daha sadiqdirlər.

Bu amillər bir-biri ilə qarşılıqlı əlaqədə olub, bir-birinə təsir edərək fərdin müəllimlik peşəsinə bağlılığını formalaşdıra bilər. Təhsil müəssisələri müxtəlif vasitələrlə, o cümlədən peşəkar inkişaf imkanlarının təmin edilməsi, inzibati işlərin azaldılması, rəğbətləndirmə və iş və şəxsi həyatın balanslaşdırılmasının təşviqiylə müəllimlərin öhdəliklərini inkişaf və davam etdirən mühitin yaradılmasında rol oynayırlar.

Peşəyə bağlılığı yüksək və aşağı olan müəllimlərin arasında kəskin fərq vardır. Belə ki, peşəkarlıq səviyyəsi yüksək və peşəkar öhdəliyi aşağı olan müəllimlər arasında aparılmış müşahidələrə əsasən, peşəyə bağlı olan müəllimlərin dərslərinə elmlə yanaşı, dəyərlərini də qatdıqları, sinif daxilində motivasiyalı mühit formalaşdırdıqları aşkarlanmışdır. Tədris prosesini yeni fəaliyyətlərlə zənginlənləşdirdikləri müəyyənləşmişdir. Bu həmin müəllimlərin peşədə uğur qazanmalarında mühüm meyardır (Bakker, Schaufeli, Leiter, Taris, 2008: 187-200).

Məlumdur ki, hər bir müəllimin işinə olan sevgisi və sadiqliyi eyni olmayacaqdır. Bu onların fərqli motivasiyalar və maraqlarının olmasına görə müxtəliflik təşkil edir. Belə ki, peşə sadiqliyi peşəkar inkişaf və iş şəraitinə bağlı olaraq dəyişə bilər. Müəllimlərin peşə sadiqliyini təmin etmək üçün əsas məsələlərdən biri onların təhsilini artırmaq, konfranslara və seminarlara iştirak etmələrinə şərait yaratmaq, yeni təhsil proqramlarından yararlanmaqlarına dəstək göstərmək və peşəkar şəbəkələrini genişləndirməkdir. İnkişaf imkanları müəllimlərin motivasiyasını artırır və onların peşəyə sadiqliyini dəstəkləyir.

**Tədqiqatın məqsədi.**

Bu tədqiqatın məqsədi gənc müəllimlərin aldıqları bazatəhsilinin yetərliliyi ilə müəllimlik peşəsinə olan sadiqlik arasındakı əlaqəni araşdırmaqdır. Bundan əlavə bazatəhsilinin yetərliliyinin müəllimlik peşəsinə sadiqlik üzərində hər hansı bir təsirinin olub olmadığını müəyyən etməkdir.

**Tədqiqatın aktuallığı.**

Təhsilin əsas məqsədi şagirdlərin var olan potensialını üzə çıxarmaq və inkişaf etdirməkdir. Bu prosesdə ən önəmli fəaliyyət müəllimlərin üzərinə düşməkdədir. Çünki keyfiyyətli təhsil üçün müəllimlərin keyfiyyət göstəricisi əsas amildir. Bu səbəblə müəllimlərin peşə fəaliyyətinə başlamadan öncə aldıqları bazatəhsilinin keyfiyyəti böyük əhəmiyyət daşımaqdadır. Alınan təhsilin müəllimlik fəaliyyəti dövründə yetərli olub olmaması müəllimin peşəsinə olan münasibətini də formalaşdırmaqdadır.

Müəllimin peşə fəaliyyətinə başlamadan öncə aldığı keyfiyyətli bazatəhsili, onun müəllimlik fəaliyyəti dövründə qarşılaşdığı çətinliklərin, problemlərin həllində, digər həmkar və tərəfdaşlarla münasibətlərində əhəmiyyətlidir.

Elmi ədəbiyyatı incələdiyimizdə ölkəmizdə istər bazatəhsilinin yetərliliyi ilə bağlı, istərsə də müəllimlik peşəsinə sadiqliklə bağlı elmi tədqiqatların olmadığı müyyən edilmişdir. Bu mənada həyata keçirdiyimiz bu tədqiqatın önəmli olduğunu, bundan sonra bu mövzularda həyata keçiriləcək tədqiqatlar üçün bir mənbə olacağını düşünürük.

**Tədqiqat metodu.**

Tədqiqatda bu başlıq altında istifadə edilən tədqiqat modeli, tədqiqata qatılan gənc müəllimlərin özəllikləri, tədqiqatda istifadə edilən ölçmə meyarları, istifadə edilən proqram və analizlərdən bəhs edilmişdir.

**Tədqiqat modeli.**

Bu tədqiqatda sorğu üsullarından əlaqəli sorğu modeli istifadə edilmişdir. Bu metod iki və daha artıq dəyişkən arasındaki dəyişikliyin varlığını və yaxud dərəcəsini müəyyən etməyi hədəfləyir. Belə ki, bu tədqiqatda əsas və asılı olmaqla iki dəyişkən vardır. Bazatəhsilinin yetərliliyi tədqiqatda əsas dəyişkən, müəllimlik peşəsinə sadiqlik isə asılı dəyişkəndir.

Tədqiqatda gənc müəllimlərə münasibətdə bazatəhsilinin yetərliliyi (tədrisin planlaşdırılması və həyata keçirilməsi və şagirdlər, həmkarlar, idarəçilər, valideynlər və cəmiyyətlə münasibətlər) ilə müəllimlik peşəsinə sadiqlik (peşəyə bağlılıq, şagirdlərə bağlılıq və fədakarlıq) arasında əlaqənin olub olmaması incələnmişdir. Bundan əlavə bazatəhsilinin yetərliliyinin (tədrisin planlaşdırılması və həyata keçirilməsi və şagirdlər, həmkarlar, idarəçilər, valideynlər və cəmiyyətlə münasibətlər) müəllimlik peşəsinə sadiqliyin alt faktorları olan peşəyə bağlılıq, şagirdlərə bağlılıq və fədakarlıq üzərində əhəmiyyətli bir təsirinin olub olmadığı da təhlil edilmişdir.

**Populyasiya və fokus qrupu.**

Tədqiqatın hədəf kütləsi 2022-2023-cü tədris ili üzrə respublikanın müxtəlif ümumi təhsil müəssisələrində fəaliyyət göstərən gənc müəllimlərdir. Gənc müəllimlərin yaşı 17-35 yaş aralığında dəyişməkdədir. Belə ki qeyd edilən yaş aralığında respublikanın ümumi təhsil müəssisələrində 35 minə yaxın müəllim fəaliyyət göstərir. Araştırmada təsadüfü nümunə seçmə metodundan istifadə edilmişdir. Təsadüfi seçmə populyasiyadaki hər bir elementin bərabər şans və seçilmə ehtimalına malik olduğu bir üsuldur. Bu üsulla tədqiqata 878 gənc müəllim qatılmışdır. Tədqiqata qatılan gənc müəllimlərin bəzi özəllikləri aşağıdaki cədvəldə verilmişdir.

**Cədvəl 1: Müəllimlərin cinsiyyət, ailə vəziyyəti, yaş, təhsil pilləsi, işlədikləri müəssisənin yerləşdiyi ərazinin statusu və pedaqoji stajları ilə bağlı sayları və faizlə ifadəsi.**

| Dəyişkənlər | Qruplar | N | % |
|---|---|---|---|
| Gender | Qadın | 779 | 88.7 |
| | Kişi | 99 | 11,3 |
| Ailə vəziyyəti | Evli | 631 | 71,9 |
| | Subay | 247 | 28,1 |
| Yaş | 16-20 | 7 | 0,8 |
| | 21-25 | 179 | 20.4 |
| | 26-30 | 345 | 39,3 |
| | 31-36 | 347 | 39.5 |
| Təhsil pilləsi | Orta peşə-ixtisas təhsili | 155 | 17,7 |
| | Ali təhsil | 723 | 82,3 |
| İşlədiyi müəssisənin yerləşdiyi ərazinin status | Kənd | 493 | 56.2 |
| | Qəsəbə | 104 | 11.8 |
| | Şəhər | 281 | 32 |
| Pedaqoji staj | 1 ilə qədər | 123 | 14 |
| | 1-3 il | 208 | 23.7 |
| | 3-5 il | 159 | 18.1 |
| | 5-10 il | 229 | 26.1 |
| | 10 ildən çox | 159 | 18.1 |

Cədvəldən göründüyü kimi tədqiqata qatılan müəllimlərin 88%-dən artığını qadın müəllimlər təşkil edir. Müəllimlərin 17.7%-i orta ixtisas təhsillidir. Müəllimlərin işlədikləri ümumi təhsil

müəssisəsinin yerləşdiyi yerin statusuna nəzər saldığımızda, 32%-nin şəhər/rayon mərkəzində yerləşən ümumi təhsil müəssisəsindən olan müəllimlər olduğunu görürük. Pedaqoji stajı 10 ildən artıq olan müəllimlər digər qruplara nisbətdə sayca üstünlük (26.1%) təşkil edir.

**Məlumat toplama vasitələri.**

Tədqiqatda gənc müəllimlərin bazatəhsilinin müəllimlik peşəsi üçün yetərliliyini müəyyən etmək üçün "Bazatəhsilin Yetərliliyinə Dair Müəllim Təəssüratı Ölçmə Vasitəsi" və müəllimlərin peşələrinə olan bağlılığını müəyyən etmək üçün isə "Müəllimlik Peşəsinə Sadiqlik Ölçmə Vasitəsi" istifadə edilmişdir. Bundan əlavə müəllimlərin bəzi özəlliklərini müəyyən etmək üçün tədqiqatçı tərəfindən hazırlanmış anket formasından istifadə edilmişdir.

**Baza təhsilin yetərliliyinə dair müəllim təəssüratı ölçmə vasitəsi.**

Ölçü meyarı Kozikoğlu və Senemoğlu (2018) tərəfindən inkişaf etdirilmişdir. 5-li Likert tipində olan meyar 25 maddədən və iki alt faktordan ibarətdir. Ölçmə vasitəsinin dərəcələndirilməsi "Qeyri-kafi" ilə "Çox yüksək səviyyədə" arasında dəyişir. Alt faktorlar "tədrisin planlaşdırılması və həyata keçirilməsi" və "Şagirdlər, həmkarlar, idarəçilər, valideynlər və cəmiyyətlə münasibətlər"dir. Tədqiqatçılar ölçmə vasitəsinin qurluşunun uyğunluğunu müəyyən etmək üçün Açıqlayıcı Faktor Analizi (AFA) nəticələrindən istifadə etmişdirlər. Belə ki, toplam varyasiyanın 53.69%-ni açıqlayan və 25 maddədən ibarət iki faktorlu qurluşu əldə etmişdirlər.

Ölçmə vasitəsinin etibarlılığını müəyyən etmək üçün tədqiqatçılar tərəfindən Cronbach Alpha güvənlik katsayısı nəticələrinə baxılmışdır. Ölçmə vasitəsinin bütünü üçün Cronbach Alpha katsayısı 0.94, alt faktorlardan tədrisin planlaşdırılması və həyata keçirilmə üçün 0.94 və şagirdlər, həmkarlar, idarəçilər, valideynlər və cəmiyyətlə münasibətlər alt faktoru üçün isə 0.89 olaraq müəyyən edilmişdir. Həyata keçirilən bu çalışmada isə Cronbach Alpha dəyəri ölçmə vasitəsinin tamamı üçün 0.98, tədrisin planlaşdırılması və həyata keçirilməsi alt faktoru üçün 0.95 və Şagirdlər, həmkarlar, idarəçilər, valideynlər və cəmiyyətlə münasibətlər alt faktoru üçün isə 0.98 olaraq tapılmışdır.

**Müəllimlik peşəsinə sadiqlik ölçmə vasitəsi.**

Türkiyəli tədqiqatçılar Kozikoğlu və Senemoğlu (Kozikoglu, Senemoglu, 2018: 2614-2625) tərəfindən inkişaf etdirilən meyar 5-li Likert tipində olub, 20 maddə və üç alt faktordan ibarətdir. Ölçmə vasitəsinin qiymətləndirilməsi "Heç razı deyiləm" ilə "Tamamilə razıyam" arasında dəyişir. Ölçmə vasitəsinin qurluşunun uyğunluğunu müəyyən etmək üçün tədqiqatçılar tərəfindən həyata keçirilən Açıqlayıcı Faktor Analizi (AFA) nəticəsində cəmi variyasiyanın 58.27%-ni açıqlayan 20 maddədən ibarət 3 faktorlu bir quruluş əldə edilmişdir. Ölçmə vasitəsinin alt faktorları "Peşəyə bağlılıq", "Şagirdlərə bağlılıq" və "Fədakarlıq"dır. Tədqiqatçılar ölçmə vasitəsini hazırlayarkən Cronbach Alpha dəyərini hesablamışdırlar. Belə ki, Cronbach Alpha dəyəri ölçmə vasitəsinin bütünü üçün .90, birinci faktor üçün .92, ikinci faktor üçün .86 və üçüncü faktor üçün isə .70 olaraq müəyyən edilmişdir. Bu tədqiqatda isə ölçmə vasitəsinin Cronbach Alpha dəyəri peşəyə bağlılıq alt faktoru üçün .95, şagirdlərə bağlılıq alt faktoru üçün .92, fədakarlıq alt faktoru üçün .88 və ölçmə vasitəsinin bütünü üçün isə .96 olaraq tapılmışdır.

**Məlumatların qiymətləndirilməsi və analizi.**

Tədqiqatın məqsədi gənc müəllimlərin bazatəhsilinin keyfiyyəti ilə onların peşələrinə olan sadaqəti arasındaki əlaqəni incələməkdir. Bundan əlavə gənc müəllimlərin baza təhsilinin keyfiyyətinin onların peşələrinə olan sədaqəti üzərində təsiri olub olmadığı da maraq mövzusu olduğu üçün tədqiqata araşdırma mövzusu olmuşdur.

Tədqiqatda ilk öncə toplanan məlumatların normal paylanıb paylanmadığını müəyyən etmək üçün Normallıq Testi (Test of Normality) nəticələrindən istifadə edilmişdir. Testə aid məlumatlar aşağıdaki cədvəldə verilmişdir.

**Cədvəl 2: Baza təhsilin yetərliliyinə dair müəllim təəssüratı ölçmə vasitəsi və müəllimlik peşəsinə sadiqlik ölçmə vasitələrinin aldıqları balların normallıq testi nəticələri**

| Faktorlar | N | p | Ortalama | SS | Medyan | Qiymətləndirmə |
|---|---|---|---|---|---|---|
| Tədrisin planlaşdırılması və həyata keçirilməsi | 878 | 0.000 | 3.82 | 1.19 | 4.18 | Razıyam |
| Şagirdlər, həmkarlar, idarəçilər, valideynlər və cəmiyyətlə münasibətlər | 878 | 0.000 | 3.91 | 1.21 | 4.33 | Razıyam |
| Peşəyə bağlılıq | 878 | 0.000 | 4.65 | 0.75 | 5 | Tamamilə razıyam |
| Şagirdlərə bağlılıq | 878 | 0.000 | 4.59 | 0.71 | 4.87 | Tamamilə razıyam |
| Fədakarlıq | 878 | 0.000 | 4.56 | 0.74 | 5 | Tamamilə razıyam |

Normallıq testi nəticələrinə nəzər saldığımızda, p dəyərinin 0.05-dən kiçik olduğu ($p<0.05$) görünür. Göründüyü kimi orta bal və medyan dəyərləri də bir birindən fərqlidir. Gənc müəllimlər bazatəhsilinin yetərliliyinin alt fakorları olan tədrisin planlaşdırılması və həyata keçirilməsi və şagirdlər, həmkarlar, idarəçilər, valideynlər və cəmiyyətlə münasibətlər faktorlarını “razı” səviyyəsində, peşəyə sadiqlik ölçmə vasitəsinin alt faktorları olan peşəyə bağlılıq, şagirdlərə bağlılıq və fədakarlıq alt faktorlarında isə “tamamilə razı” səviyyəsində dəyərləndirmişdirlər.

## Nəticə

Bu bölmədə həyata keçirilən anlizlərdən ortaya çıxan nəticələrə yer verilmişdir. İlk öncə bazatəhsilinin yetərliliyinə dair müəllimlərin təəssüratı ölçmə vasitəsinin alt faktorları olan tədrisin planlaşdırılması və həyata keçirilməsi və şagirdlər, həmkarlar, idarəçilər, valideynlər və cəmiyyətlə münasibətlər faktorları ilə müəllimlik peşəsinə sadiqlik ölçmə vasitəsinin alt faktorları olan peşəyə bağlılıq, şagirdlərə bağlılıq və fədakarlıq alt boyutları arasında hər hansı bir əlaqənin olub olmaması test edilmişdir. Anlizlər aşağıdaki cədvəldə verilmişdir.

**Cədvəl 3: Baza təhsilin yetərliliyinə dair müəllim təəssüratı ölçmə vasitəsi və müəllimlik peşəsinə sadiqlik ölçmə vasitələrinin aldıqları ballara dair korrelyasiya test nəticələri**

| Dəyişkənlər | Dəyərlər | Peşəyə bağlılıq | Şagirdlərə bağlılıq | Fədakarlıq | Müəllimlik Peşəsinə Sadiqlik |
|---|---|---|---|---|---|
| Tədrisin planlaşdırılması və həyata keçirilməsi | R | .317** | .367** | .343** | .369** |
| | P | 0.000 | 0.000 | 0.000 | 0.000 |
| Şagirdlər, həmkarlar, idarəçilər, valideynlər və cəmiyyətlə münasibətlər | R | .283** | .360** | .304** | .343** |
| | P | 0.000 | 0.000 | 0.000 | 0.000 |
| Baza təhsilin Yetərliliyinə Dair Müəllimlərin Təəssüratı | R | .315** | .376** | .340** | .372** |
| | P | 0.000 | 0.000 | 0.000 | 0.000 |
| *p< .05;<br>**p< .01 | | | | | |

Cədvəl 3-də baza təhsilinin yeterliliyi ilə müəllimlik peşəsinə sadiqlik arasında bir əlaqənin olub olmadığına dair Korrelyasiya testinin nəticələri verilmişdir. Cədvəldən də göründüyü kimi baza təhsilinin yetərliliyinin alt faktorları olan tədrisin planlaşdırılması və həyata keçirilməsi və şagirdlər,

həmkarlar, idarəçilər, valideynlər və cəmiyyətlə münasibətlər alt faktoru ilə müəllimlik peşəsinə sadiqliyin alt faktorları olan peşəyə bağlılıq, şagirdlərə bağlılıq və fərqlilik arasında pozitiv yöndə bir əlaqə vardır. Əlaqənin gücünə nəzər saldığımızda sadəcə şagirdlər, həmkarlar, idarəçilər, valideynlər və cəmiyyətlə münasibətlər alt faktoru ilə peşəyə bağlılıq alt faktoru arasında zəif dərəcədə bir əlaqənin olduğu, qalan digər hallarda orta səviyyədə pozitiv istiqamətli bir əlaqənin olduğu görünür.

Gənc müəllimlərin baza təhsilinin yetərliliyinin onların müəllimlik peşəsinə sadiqliyi üzərində hər hansı bir təsirinin olub olmadığını müəyyən etmək üçün Xətti Reqressiya Analizi nəticələrinə baxılmışdır. Belə ki, ilk öncə bazatəhsilinin yetərliliyinin müəllimlərin peşəyə sadiqliyinin ilk alt faktoru olan peşəyə bağlılıq faktoru üzərində hər hansı təsirinin olub olmadığı test edilmişdir. Aşağıdaki cədvəldə analizə dair məlumatlar verilmişdir.

**Cədvəl 4: Bazatəhsilin yetərliliyinin müəllimlik peşəsinə sadiqliyin alt faktoru olan peşəyə bağlılıq faktoru üzərindəki təsirini göstərən statistik nəticələr**

| Dəyişkən | $R^2$ | F | p | Faktorlar | β | t | P |
|---|---|---|---|---|---|---|---|
| Baza təhsilin Yetərliliyi | 0.101 | 49.046 | 0.000 | Tədrisin planlaşdırılması və həyata keçirilməsi | 0.286 | 4.509 | 0.000 |
| | | | | Şagirdlər, həmkarlar, idarəçilər, valideynlər və cəmiyyətlə münasibətlər | 0.36 | 0.562 | 0.574 |
| **Asılı** Dəyişkən: Müəllimlik Peşəsinə Sadiqliyin Alt Faktoru Olan **Peşəyə Bağlılıq** | | | | | | | |

Cədvəl 4-də gördüyümüz kimi baza təhsilinin yetərli olmasının müəllimlərin peşəyə sadiqliyinin alt faktoru olan peşəyə bağlılıq üzrərində təsiri ($p<0.05$) vardır. Belə ki, gənc müəllimlərin peşəyə bağlılığının 10%-ni onların aldıqları baza təhsilinin yetərliliyi açıqlamaqdadır. Xüsusilə bazatəhsilinin yetərliliyinin alt faktoru olan tədrisin planlaşdırılması və həyata keçirilməsi alt faktoru əhəmiyyətli dərəcədə təsir göstərməkdədir.

Baza təhsilinin yetərliliyinin müəllimlərin peşəyə sadiqliyinin ikinci alt faktoru olan şagirdlərə bağlılıq faktoru üzərində hər hansı təsirinin olub olmadığı test edilmişdir. Testə dair nəticələr cədvəl 5-də verilmişdir.

**Cədvəl 5: Baza təhsilin yetərliliyinin müəllimlik peşəsinə sadiqliyin alt faktoru olan şagirdlərə bağlılıq faktoru üzərindəki təsirini göstərən statistik nəticələr**

| Dəyişkən | $R^2$ | F | p | Faktorlar | β | t | P |
|---|---|---|---|---|---|---|---|
| Baza təhsilin Yetərliliyi | 0.142 | 72.385 | 0.000 | Tədrisin planlaşdırılması və həyata keçirilməsi | 0.286 | 3.504 | 0.000 |
| | | | | Şagirdlər, həmkarlar, idarəçilər, valideynlər və cəmiyyətlə münasibətlər | 0.36 | 2.789 | 0.005 |
| **Asılı** Dəyişkən: Müəllimlik Peşəsinə Sadiqliyin Alt Faktoru Olan **Şagirdlərə Bağlılıq** | | | | | | | |

Baza təhsilinin yetərliliyinin müəllimlərin peşəyə sadiqliyinin alt faktoru olan şagirdlərə bağlılıq faktoru üzərində hər hansı bir təsirinin olub olmadığını müəyyən etmək üçün həyata keçirilən xətti reqressiya analizi nəticəsində, bazatəhsilinin yetərliliyinin şagirdlərə bağlılıq faktoru üzərində təsirinin olduğu ($p<0.05$) müəyyən edilmişdir. Belə ki, müəllimlərin peşəyə sadiqliyinin alt faktoru olan şagirdlərə bağlılıq faktorunun 14%-ni bazatəhsilinin yetərliliyi açıqlamaqdadır. Bazatəhsilinin hər iki faktoru şagirdlərə bağlılıq faktoru üzərində əhəmiyyətli dərəcədə təsirə malikdir.

Baza təhsilinin yetərliliyinin müəllimlərin peşəyə sadiqliyinin üçüncü alt faktoru olan fədakarlıq faktoru üzərində hər hansı təsirinin olub olmadığı test edilmişdir. Testə dair nəticələr cədvəl 6-da verilmişdir.

**Cədvəl 6: Baza təhsilin yetərliliyinin müəllimlik peşəsinə sadiqliyin alt faktoru olan fədakarlıq faktoru üzərindəki təsirini göstərən statistik nəticələr**

| Dəyişkən | R² | F | p | Faktorlar | β | t | P |
|---|---|---|---|---|---|---|---|
| Baza təhsilin Yetərliliyi | .118 | 58.415 | 0.000 | Tədrisin planlaşdırılması və həyata keçirilməsi | .316 | 5.023 | 0.000 |
| | | | | Şagirdlər, həmkarlar, idarəçilər, valideynlər və cəmiyyətlə münasibətlər | .031 | .499 | .618 |
| **Asılı** Dəyişkən: Müəllimlik Peşəsinə Sadiqliyin Alt Faktoru Olan **Fədakarlıq** | | | | | | | |

Cədvəldən də göründüyü kimi p dəyəri 0.05-dən kiçikdir (p<0.05), yəni bazatəhsilinin yetərliliyinin müəllimlərin peşəyə sadiqliyinin alt faktoru olan fədakarlıq faktoru üzərində təsiri vardır. Bazatəhsilinin yetərliliyi fədakarlıq alt faktorunun 12%-ni açıqlamaqdadır. Bazatəhsilinin alt faktorları arasında tədrisin planlaşdırılması və həyata keçirilməsi faktoru əhəmiyyətli dərəcədə təsir gücünə malikdir.

**Müzakirə və təkliflər.**

Tədqiqatın məqsədi gənc müəllimlərin peşəyə başlamadan öncə aldıqları baza təhsilinin yetərli olub olmadığını onlara münasibətdə tədqiq etmək, eyni zamanda baza təhsili ilə müəllimlərin peşəyə olan sadiqliyi arasındakı əlaqəni araşdırmaqdır. Bundan əlavə baza təhsilinin müəllimlərin peşələrinə olan sadiqliyinə nə dərəcədə təsir etdiyi də tədqiqatın nəticələri arasında yer almışdır (Chelik, 2008).

Əldə edilən nəticələr gənc müəllimlərə münasibətdə baza təhsilinin yetərli olduğunu göstərir. Belə ki, tədrisin planlaşdırılması və həyata keçirilməsi və şagirdlər, həmkarlar, idarəçilər, valideynlər və cəmiyyətlə münasibətlərdə daha öncə aldıqları təhsilin yetərli olduğunu müəllimlərin böyük əksəriyyətinin baza təhsilinin yetərliliyindən razı olduqları müəyyən edilmişdir.

Elmi ədəbiyyatı araşdırdığımızda əldə edilən nəticələrə bənzər nəticələrin olduğunu görürük. Öner (2020) Türkiyənin Aydın şəhərində 304 müəllimlə həyata keçirdiyi tədqiqatda da gənc müəllim namizədlərin baza təhsilini “razı” dərəcədə qiymətləndirildiyi nəticəsini əldə etmişdir. Yenə, bir başqa tədqiqatda gənc müəllimlərin fəaliyyətə başladıqları təhsil müəssisəsində işləyən həmkarlarından gördükləri yaxın və səmimi davranışların onların sonrakı davranışları üzərində müsbət təsirə sahib olduğunu qeyd edir (Barbara, Grady, 2007). Herbet (2002), Michel (Michel, Saracaloglu, 2013) tədqiqatlarında oxşar nəticələr əldə etmişdir.

Bəzi tədqiqatlarda isə əldə edilən nəticələr bu tədqiqatla paralellik təşkil etməməkdədir. Kozikoğlu (Kozikoglu, 2016) Türkiyənin 4 şəhərində (İstanbul, Konya, Qaziantep və Van) 942 gənc müəllimlə həyata keçirdiyi tədqiqatda müəllimlərin tədrisin planlaşdırılması və həyata keçirilməsi mərhələsində, sinifin idarə edilməsi mərhələsində, həmkarlar və rəhbərlərlə münasibətlər mövzusunda çətinliklə qarşılaşdıqlarını müəyyən etmişdir. Saracaloğlu, Örer və Savcı (Saracaloglu, Orer, Sivaci, 2018) tərəfindən həyata keçirilən tədiqatda da müəllimlərin peşəyə başladıqları ilk illərdə tədrisi planlama və həyata keçirilmə mərhələsində və sinfin idarə edilməsində çətinlik yaşadıqlarını qeyd edir. Dickson və dig. (Dickson, Riddlebarger, Stringer, Tennant, Kennetz, 2014: 2-10) də çalışmalarında yeni fəaliyyətə başlayan gənc müəllimlərin tədris proqramının icrasında, dərs vəsaiti tapmaqda, sinifi idarə etməkdə, həmkarlar, rəhbərlər və valideyinlərlə münasibət qurmaqda çətinlik çəkdiklərini ifadə etmişdirlər. Müxtəlif ölkələrdə həyata keçirilən bəzi tədqiqatlarda (Roehrig, Pressley, Talotta, 2002; Jeanlouis, 2004; Erdemir, 2007: 135-149; Kavas, Bugay, 2009: 13-21; Sari, Altun, 2015: 213-226) da gənc müəllimlərin qeyd edilən mövzularla bağlı çətinlik yaşadıqları müəyyən edilmişdir. Gənc müəllimlərin müəllimlik peşəsinə olan bağlılığı, sadiqliyi ilə bağlı analiz nəticələrində, müəllimlərin yüksək dərəcədə (“tamamilə razıyam”) peşəyə sadiq olduqları müəyyən edilmişdir. Gənc müəllimlərin böyük əksəriyyəti çalışdıqları müəllimlik peşəsinə və şagirdlərinə bağlı olduqlarını, eyni zamanda fədakar olduqlarını ifadə etmişdirlər. Gənc müəllimlərin peşəyə olan sadiqliyinin yüksək dərəcədə olması, müəllimlik peşəsinin fərqliliyi ilə bağlıdır. Çünki bu peşəni seçən şəxslərin böyük əksəriyyəti fədakar, işlərini böyük istəklə həyata

keçirən insanlardır. Bundan əlavə uğur əldə etmək üçün fədakarlıq, səbr və davamlı işləmək, çalışmaq tələb edən müəllimlik peşəsində sevərək və istəyərək çalışmaq önəm daşımaqdadır. Müəllimlərin öz peşələrinə qarşı olan müsbət münasibətləri də onların peşəyə olan sadiqliyini artırmaqdadır. Bir çox tədqiqatlar bu tədqiqatla (Celep, Bulbul, Tunc, 2000: 79-86; Zog, 2007; Karagoz, 2008; Turhan, Demirli, Nazik, 2012: 179-192; Michel, 2013; Kizil, 2014; Delima, 2015: 1-12; Kozikoglu, Senemoglu, 2018: 2614-2625; Kandemir, 2019; Coban, 2020; Pehlivan-Kapan, 2020; Bulbul, 2021; Abay, 2021; Kayadelen, 2022; Kilic, 2023) paralellik təşkil etməkdədir. Belə ki, Kayadelen (Kayadelen, 2022) Türkiyənin İzmir şəhərində müxtəlif ümumi təhsil müəssisəsində çalışan 443 müəllimin iştirakı ilə həyata keçirdiyi tədqiqatda müəllimlik peşəsinə sadiqliyin alt amilləri olan peşəyə bağlılıq, şagirdlərə bağlılıq və fədakarlıq faktorlarının hər birini yüksək qiymətləndirdiyini müəyyən etmişdir. Kozikoğlu (Kozikoglu, 2016) gənc müəllimlərlə apardığı tədqiqatda müəllimlərin özlərini müəllimlik peşəsinə bağlı hiss etdiklərini və analizlər nəticəsində gənc müəllimlərin peşəyə sadiqliyinin yüksək olduğunu müəyyən etmişdir. Bozdaş (Bozdash, 2013) 406 ibtidai sinif müəllimi ilə həyata keçidiyi tədqiqatda müəllimlərin peşəyə sadiqliyinin aşağı səviyyədə olduğunu müəyyən etmişdir.

Gənc müəllimlərin müəllimlik peşəsinə başlamadan öncə aldıqları baza təhsilinin yetərliliyi ilə onların peşələrinə olan sadiqliyi arasında əlaqəni müəyyən etmək üçün həyata keçirilmiş analizlərin nəticəsi olaraq orta səviyyədə pozitiv istiqamətli əlaqənin olduğu müəyyən edilmişdir. Yəni, alınan təhsilin keyfiyyəti yüksəldikcə müəllimlərin peşəyə olan sədaqəti artmaqdadır.

Koçyiğit ve Eğmir (Kocyigit, Egmir, 2019) tədqiqatlarında müəllimlərin peşə fəaliyyətinə başlamadan öncə aldıqları baza təhsilinin nəzəri biliklər baxımından yetərli olduğunu, ancaq metodiki cəhətdən alınan biliklərin kifayət etmədiyini, tələbələrin valideynlər və şagirdlərlə bağlı kifayət qədər biliklərə yiyələnmədən məzun olduqlarını qeyd edir. Ölkəmizdə də pedaqoji kadr hazırlayan ali təhsil müəssisələrində nəzəri biliklərin öyrədilməsi qənəatbəxş olsa da, metodiki biliklər və pedaqoji təcrübə keçmə prosesinin yetərli olmadığı qeyd edilə bilər. Təlim-tədris prosesində pedaqojik bacarıqlardan ziyadə, plan-proqram, vaxtın idarə edilməsi və sinifdə davranış qaydaları kimi detallara diqqət yetirən müəllimlər şagirdlərinə lazimi səviyyədə faydalı ola bilməməkdədirlər. Nəticədə şagirdlərin motivasiyası düşdüyü üçün keyfiyyətli öyrənmə prosesi təmin edilməməkdədir (Ainley, Luntley, 2007: 1127-1138). Bu mənada pedaqoji kadr hazırlayan ali və orta ixtisas təhsili müəssisələrində nəzəri biliklərlə bərabər, metodika və metodologiyanın daha dərindən öyrədilməsi, müasir dövrdə müəllimlik peşəsi üçün vacib olan səriştələrin, bacarıqların qazandırılması peşə fəaliyyəti dövründə onların peşəyə olan bağlılığını artıracaqdır. Klassen və Chiu (Klassen, Chiu, 2011: 114-129) effektiv tədris strategiyaları və sinif idarəetməsi ilə peşəyə sadiqlik arasında əlaqənin olduğunu qeyd edir. Turhan, Demirli ve Nazik (Turhan, Demirli, Nazik, 2012: 179-192) isə ibtidai sinif müəllimləri ilə həyata keçirdikləri tədqiqatda müəllimlərin peşələrini sevdiklərini, uğur qazanmaq üçün çalışdıqlarını və peşələrinə dəyər verdiklərini, ancaq fəaliyyətləri zamanı çətinlik çəkdiklərini və müəllimlik statusunun cəmiyyətdə yetərli görmədiklərini müəyyən etmişdir. Fried (Fried, 2000: 187-200) müəllimlərin peşələrinə olan sədaqətini artıracaq üç əsas faktorun bunlar olduğunu qeyd edilir; müəllimlərin öz peşələri ilə bağlı yüksək biliyə sahib olması və peşəsinə hakim olması, dünyada baş verən ən son hadisələrə və texnoloji yeniliklərə maraq göstərməsi və şagirdlərə olan sevgisi (Guner, 2006).

## Nəticə

Tədqiqatdan əldə edilmiş nəticələr əsasında aşağıdakılar təklif edilir:

Ali və orta ixtisas təhsili müəssisələrində sinfin idarə edilməsi, şagirdlərlə iş, valideynlərlə iş, emosional zəkanın inkişaf etdirilməsi, müasir təlim üsulları, məktəbdaxili sənədlər, uşaq təhlükəsizliyi (fiziki və mənəvi), pedaqoji qabiliyyətlər (göz təması, nitq, hərəkətlər, sual-cavab alqoritmi və s.) və s. kimi mövzularda müəllim olacaq gənc mütəxəssislərə lazımı bilik və bacarıqların qazandırılması;

Pedaqoji fəaliyyətlə məşğul olan gənc müəllimlər üçün mütəmadi müasir təlim metodları, metodologiya, sosial bacarıqlar, şagirdlərlə iş, valideynlərlə iş və s. mövzularda ixtisasartırma təlimlərinin təşkili;

Müəllimlərin şagirdlərə və peşələrinə olan bağlılığını artırmağa təsir edəcək faktorların müəyyən edilməsi və bu istiqamətdə fəaliyyətlərin həyata keçirilməsi;

Müəllimlərin peşələrinə olan bağlılığını artırmaq üçün müəllimlər arasında işbirliyini və peşəkar inkişafı təmin edəcək fəaliyyətlərin həyata keçirilməsi;

Müəllimin peşəyə sədaqətini artırmaq, onların tədris prosesinə və şagirdlərə yanaşmasını daha da inkişaf etdirmək üçün metodik xidmətin təşkili.

## Ədəbiyyat

1. Yildirim, I. (2019). Examining teachers' positive psychological capital perceptions and professional commitment. (Unpublished master's thesis). Siirt: Siirt University Institute of Social Sciences.
2. Bakker, A.B., Schaufeli, W.B., Leiter, M.P., Taris, T.W. (2008). Work engagement: An emerging concept in occupational health psychology. Work and stress, pp.187-200.
3. Oner, H. (2020). Examining teachers' pre-service education efficacy perceptions, professional commitment perceptions and professional resilience beliefs. (Published master's thesis). Aydin: Adnan Menderes University Social Sciences Institute.
4. Chelik, S. (2008). The relationship between the management models of educational administrators in primary schools and the professional dedication of teachers. (Unpublished master's thesis). Istanbul: Yeditepe University Social Sciences Institute.
5. Barbara, B.L., Grady, M.L. (2007). From first-year to first-rate: Principals guiding beginner teachers. USA: Corwin Press.
6. Michel, H.A., Saracaloglu, A.S. (2013). The first five years: Novice teacher beliefs, experiences, and commitment to the profession. (Doctoral thesis). San Diego: University of California.
7. Kozikoglu, I. (2016). First year of teaching: challenges faced by first-year teachers, their pre-service training competencies and their commitment to the profession. (Published doctoral thesis). Van: Yuzuncu Yil University, Institute of Educational Sciences.
8. Kozikoglu, I., Senemoglu, N. (2018). Development of the teacher perception scale regarding the adequacy of pre-service education: Validity and reliability study. Van Yuzuncu Yil University Faculty of Education Journal, pp.552-576.
9. Saracaloglu, A.S., Orer, H., Sivaci, S.Y. (2018). First year experiences of working teachers, their perceptions of their pre-service qualifications and professional commitment. 6th International Curriculum and Instruction Congress, Kars.
10. Dickson, M., Riddlebarger, J., Stringer, P., Tennant, L., Kennetz, K. (2014). Challenges faced by Emirati novice teachers. Near and Middle Eastern Journal of Research in Education, pp.2-10.
11. Roehrig, A.D., Pressley, M., Talotta, D.A. (2002). Stories of beginning teachers: First years challenges and beyond. Indiana: University of Notre Dame Press.
12. Jeanlouis, G. (2004). High attrition of first-year teachers in the states of Texas and Lousisiana. (Doctoral thesis), Union Institute and University.
13. Erdemir, N. (2007). Problems and complaints faced by science teachers who are new to their profession. Electronic Journal of Social Sciences, pp.135-149.
14. Kavas, A.B., Bugay, A. (2009). Deficiencies seen by teacher candidates in their pre-service training and solution suggestions. Pamukkale University Faculty of Education Journal, pp.13-21.
15. Sari, M.H., Altun, Y. (2015). Problems faced by new classroom teachers. Hacettepe University Faculty of Education Journal, pp.213-226.
16. Celep, C., Bulbul, T., Tunc, B. (2000). Organizational commitment status of candidate teachers. Trakya University Journal of Social Sciences, pp.79-86.

17. Zog, H. (2007). The relationship between organizational commitment and job satisfaction of primary school teachers working in Kağıthane district of Istanbul. (Published master's thesis). Istanbul: YTU Social Sciences Institute.
18. Karagoz, A. (2008). The relationship between the ethical leadership roles of primary and secondary school administrators perceived by teachers and teachers' organizational commitment. (Published master's thesis). Istanbul: Yeditepe University Social Sciences Institute.
19. Turhan, M., Demirli, C., Nazik, G. (2012). Factors affecting the level of commitment of classroom teachers to the profession: Elazig example. Istanbul Commerce University Journal of Social Sciences, pp.179-192.
20. Kizil, Sh. (2014). The relationship between teachers' emotional intelligence and organizational commitment (Published master's thesis). Istanbul: Okan University Institute of Social Sciences.
21. Delima, V.T. (2015). Professional identity, professional commitment and teachers' performance. International Journal of Novel Research in Education and Learning, pp.1-12.
22. Kozikoglu, I., Senemoglu, N. (2018). Development of the commitment to teaching profession scale: Validity and reliability study. Journal of Human Sciences, pp.2614-2625.
23. Kandemir, M. (2019). The relationship between teachers' technological pedagogical content knowledge, their commitment to the profession and their technology usage levels. (Published master's thesis). Van: Van Yuzuncu Yil University Social Sciences Institute.
24. Coban, M.F. (2020). Examining the professional commitment and professional burnout levels of Imam Hatip high school vocational course teachers (Balikesir example). (Published doctoral thesis). Bursa: Bursa Uludag University Social Sciences Institute.
25. Pehlivan-Kapan, S.O. (2020). Examining the level of dedication of classroom teachers to the profession. (Published master's thesis). Canakkale: Canakkale Onsekiz Mart University, Institute of Social Sciences.
26. Bulbul, M. (2021). Factors determining commitment to the teaching profession and its relationship with the constructivist learning environment. (Published master's thesis). Antalya: Akdeniz University Institute of Educational Sciences.
27. Abay, M. (2021). Examining the levels of professionalism and dedication to the profession of physical education teachers. (Published master's thesis). Bolu: Bolu Abant Izzet Baysal University Institute of Social Sciences.
28. Kayadelen, M. (2022). The relationship between leadership capacity in schools and teachers' level of dedication to the profession. (Published master's thesis). Ushak: Ushak University Graduate Education Institute.
29. Kilic, H. (2023). The relationship between preschool teachers' classroom management skills, their commitment to the profession, and their level of love for children. (Published master's thesis). Sivas: Sivas Cumhuriyet University Institute of Educational Sciences.
30. Bozdash, Sh. (2013). The relationship between teachers' level of dedication to their profession and their level of implementation of values education. (Published master's thesis). Ankara: Hacettepe University Institute of Educational Sciences.
31. Kocyigit, M., Egmir, E. (2019). Teachers' pre-service education experiences: An analysis on teacher training. Mediterranean Journal of Educational Research, pp.320-346.
32. Ainley, J., Luntley, M. (2007). Towards an articulation of expert classroom practice. Teaching and Teacher Education, pp.1127-1138.
33. Klassen, R.M., Chiu, M.M. (2011). The occupational commitment and intention to quit of practicing and pre-service teachers: Influence of self-efficacy, job stress, and teaching context. Contemporary Educational Psychology, pp.114-129.
34. Fried, R.L. (2000). The passionate teacher: A practical guide. Boston: Beacon Pres., pp.44-54.
35. Guner, H. (2006). Teachers' commitment problem: A study on the example of Istanbul province. (Master's thesis). Istanbul: Marmara University Institute of Educational Sciences.

Göndərilib: 30.09.2023 Qəbul edilib: 09.11.2023

DOI: https://doi.org/10.36719/2663-4619/97/55-59

**Gülarə Sadıxova**
Bakı Slavyan Universiteti
gulara-sadixova@rambler.ru
**Səadət Cahangirova**
Bakı Slavyan Universiteti
cahangirova58@b.k.ru
**Sayalı İbrahimova**
Bakı Slavyan Universiteti
ibrahimovasayali@gmail.com

# İNKLÜZİV TƏHSİLİN DƏYƏRLƏRİ

**Xülasə**

Hər bir yeni başlanğıc istər tibbdə, istər iqtisadiyyatda, istərsə də təhsildə həmişə müsbət və mənfi cəhətlərə malik olacaqdır. Mənfi cəhətləri bilmək və onların aradan qaldırılması həmişə təkmilləşməyə kömək edir. Bu da öz növbəsində daha mükəmməl inklüziv təhsilə və inklüziv cəmiyyətə gətirib çıxaracaq.

***Açar sözlər:*** *empatiya, inklüziv təhsil, cəmiyyət, uşaqlar, bərabərlik, inteqrasiya*

**Gulara Sadikhova**
Baku Slavic University
gulara-sadixova@rambler.ru
**Saadat Jahangirova**
Baku Slavic University
jahangirova58@b.k.ru
**Sayali Ibrahimova**
Baku Slavic University
ibrahimovasayali@gmail.com

## Values of inclusive education

**Abstract**

Each new undertaking, whether in medicine, economics, or education, will always have its positive and negative features. Knowing the disadvantages and overcoming them always contributes to improvement. And this, in turn, will lead to a more perfect inclusive education.

***Keywords:*** *empathy, inclusive education, society, children, equality, integration*

## Giriş

Əlillik məsələsi yarım əsrdən çox fəaliyyət göstərən tanınmış, ən nüfuzlu beynəlxalq təşkilatın-Birləşmiş Millətlər Təşkilatının (BMT)-nin həmişə diqqət məkəzində olmuşdur. Birləşmiş Millətlər Təşkilatının əsas qanunvericiliyi ilə müəyyən etmişdir ki, əlillik məsələsi təkcə reabilitasiya və sosial təminat deyil, insan hüquqları məsələsidir

Əlilliyi olan şəxslərin hüquqlarının müəyyən edilməsində mühüm və təsirli addım 1971-ci il dekabrın 20-də BMT Baş Assambleyası tərəfindən "Əqli qüsurlu şəxslərin hüquqlarına dair" Bəyannamənin qəbul edilməsi olmuşdur. Bu Bəyannaməyə əsasən, əqli qüsurlular cəmiyyətin bütün digər üzvləri ilə eyni hüquqlara malikdirlər. 9 dekabr 1975-ci il BMT Baş Assambleyası Əlillərin Hüquqları haqqında Bəyannaməni qəbul edib. 1994 - cü il iyunun 7-10 - da YUNESKO-nun dəstəyi ilə İspaniyanın Salamanka şəhərində keçirilən Xüsusi Ehtiyacı olan Şəxslər üçün Təhsil Əlçatanlıq və Keyfiyyət üzrə Ümumdünya Konfransında sağlamlıq imkanları məhdud uşaqların tədrisi üçün innovativ təhsil konsepsiyası təqdim edilmişdir.

**İnklüziv təhsilin dəyərləri.**

Salamanka Bəyannaməsində göstərilir ki, "hər bir uşağın özünəməxsus xüsusiyyətləri, maraqları, qabiliyyətləri və öyrənmə ehtiyacları,təhsil almaq kimi əsas hüququ var və lazımı səviyyədə bilik əldə edib, inkişaf etməyə imkanı olmalıdır".

1970-ci illərdən etibarən əlilliyi olan insanlar üçün təhsil imkanlarının genişləndirilməsini təşviq etmək üçün qanunlar paketi hazırlanır və həyata keçirilir. ABŞ və Avropada müasir təhsil siyasətində bir neçə yanaşma işlənib hazırlanmışdır, o cümlədən: təhsilə yaxınolomanın geniş yayılması (widening participation), əsas istiqamətləndirmə (mainstreaming), inteqrasiya (integration), inklüzivlik, yəni "daxiledilmə" (inclusion) (1). Əsas istiqamətləndirmə (mainstreaming) ehtimal edir ki, əlil-şagirdlər də öz həmyaşıdları ilə bayramlarda, müxtəlif istirahət proqramlarında birlikdə iştirak edirlər. *İnteqrasiya*-əqli və fiziki qüsurlu uşaqların ehtiyaclarını əsasən dəyişməz qalan və onlara uyğunlaşdırılmayan təhsil sisteminə uyğunlaşdırmaq deməkdir. *İnklüziv və ya daxiledilmə* məktəblərin islahatı və sinif otaqlarının istisnasız olaraq bütün uşaqların ehtiyac və tələblərinə cavab verməsini nəzərə alınmasıdır.

Xüsusi qayğıya ehtiyacı olan uşaqlar nadir hallarda hamı ilə birlikdə oxuyurlar.

*İnklüziv təhsil (fransızca "inclusif"-"daxiledilmə")* fiziki və əqli xüsusiyyətlərindən asılı olmayaraq bütün uşaqların ümumi təhsil sisteminə daxil edildiyi təlim prosesinin təşkilidir. Bu isə o deməkdir ki, psixofiziki inkişafda (nitq, görmə, eşitmə, dayaq-hərəkət sistemi, intellekt və s.) qüsurları olan uşaqlar xüsusi yaradılmış qrupda deyil, həmyaşıdları ilə birlikdə təhsil alır.

"İnklüziya" termini 1994-cü ildə xüsusi ehtiyacı olan şəxslər üçün təhsil sahəsində prinsiplər, siyasət və təcrübələr barəsində Salamanka Bəyannaməsində təqdim edilmişdir (Bitov, 2000: 254).

*İnklüzivlik* hər bir uşağın öz qabiliyyətlərinə uyğun gələn təhsil proqramının köməyi ilə təhsil prosesinə cəlb edilməsi, hər bir şəxsin fərdi təhsil ehtiyaclarını ödəmək, onun dəstəklənməsi üçün şərait yaratmaqdır (Bitov, 2000: 254).

İnklüzivlik beynəlxalq səviyyədə universal insan hüququ kimi tanınır. Sağlam və xüsusi təhsilə ehtiyacı olan uşaqların sosial adaptasiyasını təmin etmək üçün onların birgə təhsili zəruridir. İnklüziv təhsil əlilliyi olan məktəbəqədər uşaqlara qarşı dözümlülüyü inkişaf etdirməyə imkan verir, çünki uşaqlarda hamıdan fərqli doğulmuş həmyaşıdlarına qarşı qərəzli münasibət yoxdur. Dünya təcrübəsi təsdiq edir ki, birgə qruplarda təhsil alan məktəbəqədər uşaqlar daha yaxşı nəticələr nümayiş etdirirlər. Bu həm sağlam uşaqlara, həm də xüsusi ehtiyacı olanlara aiddir (Quseva, 2010). İnklüziv yanaşma ilə müəyyən öyrənmə çətinliyi olan şagirdləri standart məktəbin mövcud tələblərinə uyğunlaşdırmaq yox, məktəblərdə islahatlar aparmaq və tədrisə digər pedaqoji yanaşmalar axtarmaq lazımdır ki, onları tam şəkildə nəzərə almaq mümkün olsun.

İnklüziv təhsilin effektivliyinin əsas meyarı bütün uşaqların, o cümlədən xüsusi təhsilə ehtiyacı olan uşaqların sosiallaşmasının, mədəniyyətə girişinin və sosial təcrübəsinin inkişafının uğurudur (Alyoxina, Semaqo, 2012: 156).

İnklüziv təhsilin səkkiz əsas prinsipi müəyyən edilmişdir:

1. İnsanın dəyəri onun qabiliyyət və nailiyyətlərindən asılı deyil;
2. Hər bir insan hiss etmək və düşünmək qabiliyyətinə malikdir;
3. Hər bir insanın ünsiyyət qurmaq və dinlənilmək hüququ vardır;
4. Bütün insanların bir-birinə ehtiyacı var;
5. Həqiqi tərbiyə ancaq real münasibətlər kontekstində baş verə bilər;
6. Bütün insanların öz yaşıdlarının dəstəyinə və dostluğuna ehtiyacı var;
7. Bütün öyrənənlər üçün əldə edə biləcəkləri irəliləyiş əldə edə bilməyəcəkləri işlərdən daha çox olur;
8. Müxtəliflik insanın həyatının hərtərəfli inkişafına səbəb olur.

2013-cü il oktyabrın 24-də Azərbaycan Prezidenti İlham Əliyevin sərəncamı ilə qəbul edilmiş "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası" ölkədə inklüziv təhsilin inkişafı üçün yeni imkanlar yaratmışdır. Təhsilin inkişafı üzrə Dövlət Strategiyasında müəyyən edilmiş əsas vəzifələri: xüsusi qayğıya ehtiyacı olan uşaqlar üçün inkişaf və inklüziv təhsil proqramlarının hazırlanması; xüsusi qayğıya ehtiyacı olan uşaqların həyata və təhsil mühitinə

inteqrasiyasını təmin edən inklüziv tədris metodikasının yaradılması; xüsusi qayğıya ehtiyacı olan uşaqların təhsili və sosial adaptasiyası üçün imkanların təmin edilməsi üçün optimal inklüziv təhsil modellərinin tətbiqi; məktəbəqədər və ümumi təhsil müəssisələrinin müəllimləri üçün inklüziv təhsil üzrə məqsədyönlü əlavə təhsilin təmin edilməsindən ibarətdir ("Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası", 2013).

2015-2016-cı tədris ilindən etibarən ölkədə sağlamlıq imkanları məhdud uşaqların ümumi təhsil müəssisələrində digər uşaqlarla birgə təhsilə cəlb edilməsi məqsədilə "İbtidai təhsil səviyyəsində inklüziv təhsilin tətbiqi" layihəsinin icrasına başlanılıb. Azərbaycan Prezidenti 2017-ci il dekabrın 14-də "2018-2024-cü illərdə Azərbaycanda sağlamlıq imkanları məhdud şəxslər üçün inklüziv təhsilin inkişafına dair Dövlət Proqramının təsdiq edilməsi haqqında" Sərəncam imzalayıb. Onun məqsədi əlilliyi olan şəxslərə bütün səviyyələrdə bərabər təhsil imkanları vermək və onların təhsili üçün maneəsiz şərait yaratmaqdır.

Lakin bu təhsil sahəsi hələ də istədiyimiz qədər fəal inkişaf etmir. İnklüziv təhsilin şübhəsiz üstünlükləri və çatışmayan cəhətləri var. Ətraf mühit və şərait xüsusi uşaqlar üçün uyğunlaşdırılmalı, digər şagirdlər və müəllimlər hər bir uşağın fərdi ehtiyaclarını başa düşməli və qəbul etməlidirlər.

İnklüziv prinsip əsasında təhsil alarkən, xüsusi ehtiyacı olan insanlar şübhəsiz üstünlüklər sayıla biləcək imkanlara malikdirlər (6) və bu üstünlüklər aşağıdakılardır:

1. Bütün uşaqların *bərabərliyi*- xüsusi qayğıya ehtiyacı olan uşaqlar başqaları ilə bərabər təhsil prosesinə daxil edilirlər. Bu, sağlamlıq məhdudiyyəti olmayanlar, başqa sözlə, adi insanlar da daxil olmaqla, daha geniş insanlarla ünsiyyət qurmaq imkanıdır. Bu, həm xüsusi qayğıya ehtiyacı olan uşaqların özləri üçün, həm də onların valideynləri üçün müəyyən bir müsbət prosesdir. Təlim yaşayış yerində aparılır, ixtisaslaşdırılmış məktəbə ehtiyac yoxdur.

2. Cəmiyyətin digər üzvləri ilə birlikdə və bərabər əsaslarla *cəmiyyətə daxil olmaq (sosiallaşma) imkanı*- uşaqlar həmyaşıdları ilə birbaşa təmasda olurlar və sosiallaşma prosesi məhz baş verməli olduğu vaxt baş verir. Statistikaya görə, digər uşaqlarla birlikdə təhsil alan sağlamlıq imkanları məhdud uşaqların ixtisas qruplarından olan həmyaşıdları ilə müqayisədə ünsiyyət bacarıqları daha çox inkişaf etmişdir.

3. Digər müsbət hal - *fərdilikdir.* Tədris prosesi daha innovativ və müxtəlif xarakter alır, buna görə də bütün iştirakçılar üçün daha səmərəlidir. İnklüziv təhsil sistemi fərdilik prinsipinə əsaslanır - bütün uşaqlar müxtəlif öyrənmə ehtiyacları olan fərdi şəxslərdir. Proses iştirakçılarının güclü tərəflərini inkişaf etdirməyə və uğursuzluqlara görə onları qınamamağa diqqət yetirilir.

*4. Həyat boyu və təhsil müddətində psixoloji, psixoloji-sosial, korreksiyaedici və ictimailəşdirici dəstək almaq imkanı.* Məktəbdə psixoloqun, loqopedin və ya xüsusi pedaqoqun olması səbəbindən bu mütəxəssislərin uşaqları öyrətmək və inklüzivliyi yaratmaq üçün müasir və effektiv texnologiyalar bildiyinə zəmanət vermir. Çox güman ki, onun da yardıma ehtiyacı olacaq. Bir çox hallarda uşağı müşayiət edən *tərbiyəçiyə-tyutora* ehtiyac yaranır. Bəziləri buna yalnız uyğunlaşma dövrü üçün, digər uşaqlar bütün təlim dövrü üçün ehtiyac duyacaqlar. Sosial və ünsiyyət bacarıqlarının inkişafı, cəmiyyətlə qarşılıqlı əlaqə təhsilin bütün mərhələlərində tyutor dəstəyi və cəmiyyətə ilkin giriş yolu ilə baş verir. Qeyd etmək lazımdır ki, əlillər və xüsusi qayğıya ehtiyacı olan şəxslər sosial və ünsiyyət bacarıqlarına malik deyillər. Bu səbəbdən tyutorluq aspekti son dərəcə vacibdir. Tyutor çox vaxt xüsusi ehtiyacı olan şəxslə cəmiyyət arasında vasitəçi rolunu oynayır. Xüsusilə sosial bacarıqların inkişafının ilkin mərhələlərində. Tyutor dərs zamanı şagird ilə işləyir: məsələn, arzuolunmaz davranışın öhdəsindən gəlməyə kömək edir və ya təlimatları daha ətraflı izah edir. Tənəffüs zamanı o, şagirdi həmyaşıdları ilə ünsiyyət prosesində dəstəkləyir və lazım olduqda məktəb ətrafında hərəkət edərkən müşayiət edir. İşini səmərəli təşkil etmək üçün tyutorlara da xüsusi təlim lazımdır. İnklüziv istiqaməti olmayan təhsil müəssisələrində tyutor yoxdur (Fətəliyeva, 2018). İnklüzivlik məktəbdəki hər kəsin, yəni müəllimlər, qarderob işçiləri, yeməkxana işçiləri, mühafizəçilər və normal inkişaf edən uşaqların valideynləri tərəfindən uşaqların ehtiyaclarının başa düşülməsini nəzərdə tutur.

İnklüziv təhsil uşaqlarda *empatiya* və *tolerantlığın* inkişafına kömək edir. *Empatiya* başqasının halına acımaq bacarığıdır. "Xüsusi ehtiyacı olan" uşaqların başqaları ilə bərabər şəraitdə mövcud olduğu cəmiyyətdə ayrı-seçkilik ehtimalı əhəmiyyətli dərəcədə azalır. İnklüziv məktəblərdə təhsil alan "xüsusi ehtiyacları" olmayan uşaqlar "əlillik" haqqında daha çox biliyə malikdirlər, bu da onlarda insan münasibətləri, bərabərlik və qarşılıqlı yardım haqqında düzgün təsəvvür formalaşdırması deməkdir. Onların ünsiyyət səviyyəsi də ənənəvi məktəblərdə oxuyan həmyaşıdlarından xeyli yüksəkdir.

İnklüziv təhsilin üstünlükləri göz qabağında olsa da, bu mərhələdə çatışmazlıqlar da var. (Xusnutdinova, 2017). Onlardan aşağıdakiları xüsusilə vurğulamaq lazımdır.

*Bunlardan biri kadrların ixtisaslaşdırılması ilə əlaqədardır,yəni k*adrların ixtisas səviyyəsi qeyri-kafidir. Hazırda inklüziv məktəblərdə dərs deyə biləcək xüsusi təlim keçmiş müəllim və tərbiyəçilər çatışmır. İxtisas çatışmazlığı ilə yanaşı, kollektivdə psixoloji problemlər də var-ənənəvi tədris metodlarına alışmış müəllimlər öz prinsiplərini dəyişməyə hazır deyildirlər, tapşırığın öhdəsindən gələ bilməməkdən qorxurlar, məsuliyyətdən qorxurlar. Bu, "xüsusi ehtiyacları" olan uşaqlara qarşı hörmətsizlik və biliyin qərəzli qiymətləndirilməsi ilə nəticələnə bilər.

*Digər problem tədris proqramı ilə bağlıdır*. Müasir dövlət kurikulumu hələ də inklüziv təhsilə uyğunlaşdırılmayıb. Təlim proqramı fərdiliyin inkişafı istiqamətində təkmilləşdirmə və dəyişikliklər tələb edir. Əlil uşaqlar müxtəlif kateqoriyalara bölünür: əqli qüsurlu və fiziki qüsurlu olanlar. Fiziki qüsurlu uşaqlar üçün heç bir xüsusi məktəb proqramına ehtiyac yoxdur, lakin əqli qüsurlu uşaqlar üçün tamamilə fərqli proqram lazımdır. Bu uşaqlar da müəyyən kateqoriyalara bölünürlər ki, onlar üçün fərdi proqramlar tələb oluna bilər. İnklüziv məktəbdə "xüsusi" uşaqların sayı məhduddur - bütün məktəb üçün 10%-dən çox, bir sinifdə isə 3 nəfərdən çox olmamalıdır (10% psixoloqların tövsiyə etdiyi rəqəmdir). Belə uşaqların qəbulu adi məktəbdə oxumağa icazə verə bilən iki komissiyanın: tibbi-psixoloji və pedaqoji komissiyanın rəyləri əsasında aparılmalıdır.

*Zəif maddi-texniki bazanı da* qeyd etmək lazımdır. İnklüzivliyin həyata keçirilməsi üçün bir çox məktəblərdə lazımi maddi-texniki baza yoxdur. "Xüsusi" uşaqların əksəriyyəti texniki və proqram vasitələrinə ehtiyac duyur. Sensor qüsurlu uşaqlar üçün məlumatı əlçatan formata çevirmək lazımdır. Belə ki, eşitmə qüsuru olan uşaqlar üçün əyani didaktik vasitələr, görmə problemi olan uşaqlar üçün isə eşitmə didaktik vasitələri lazımdır.

Digər bir problem isə *cəmiyyətin hazırlıqsız olmasıdir, yəni ç*ox vaxt sağlam uşaqların valideynləri əlilliyi olan uşaqların öz uşaqları ilə birlikdə eyni sinifdə oxumasını istəmirlər. Onların fikrini dəyişmək üçün bu istiqamətdə fəal şəkildə izahat işləri aparmaq - tədbirlər, dəyirmi masalar arxasında görüşlər, televiziya debatları təşkil etmək, videoçarxlar çəkmək və s.

Təhsilin inkişafı proqramları şöbəsinin məsləhətçisi Orxan Abbasov inklüziv təhsil sahəsinin ləng inkişafını normativ-hüquqi bazanın olmaması ilə əlaqələndirir: "Təhsil sahəsini tənzimləyən iki əsas sənəd var: bunlar "Təhsil haqqında" və "Xüsusi Təhsil haqqında" qanunlardan ibarətdir, lakin hər iki sənəddə inklüziv təhsil haqqında heç bir məlumat yoxdur. Çünki bu sənədlərin qəbulu zamanı bu təhsil növü haqqında məlumat yox idi. Əsas məqsədimiz proqramın həyata keçirilməsi üçün hüquqi baza yaradacaq qaydaların təkmilləşdirilməsi və inklüziv təhsil haqqında məlumatların daxil edilməsidir. Hazırda bu istiqamətdə işlər aparılır".

Çatışmayan bəzi cəhətlərə baxmayaraq, inklüziv təhsilin daha çox üstünlükləri var. İnklüzivliyin əsas məqsədi əlilliyi olan insanlar üçün onların cəmiyyətin həyatında iştirakına və ona töhfə verməyə imkan verəcək maneəsiz mühit yaratmaqdır. Belə inklüziv cəmiyyətdə fərqliliklərə hörmət və qiymət verilir, ayrı-seçkilik və qərəzlə mübarizə aparılır.

## Nəticə

İnklüziv təhsillə bağlı müddəalar BMT Baş Assambleyasının 2006-cı il 13 dekabr tarixli qərarı ilə təsdiq edilmiş "Əlilliyi olan şəxslərin hüquqları haqqında" BMT Konvensiyasına daxil edilib (9).

İnsan anadangəlmə inkişaf qüsuru ilə doğulur və bütün həyatını yaşayır. Buna görə də, onun təkcə məktəbdə deyil, həm də daha əvvəl dəstəyə ehtiyacı var. İnklüziv məktəbəqədər təhsil müəssisələrinin olması normal inkişaf edən uşaqlara müsbət təsir göstərir. Əlilliyi olan

həmyaşıdlarının təhsil və ictimai fəaliyyətlərdə fəal iştirakına kömək etməklə, sağlam uşaqlar özləri tərəfindən nəzərə alınmadan ən vacib həyat dərslərini öyrənirlər (Voroniç, 2013: 17-20).

İnklüziv (daxilolma) təhsil dünyanın hər hansı bir ölkəsində cəmiyyətin və əlilliyi olan insanlara həyatın müxtəlif sahələrində, o cümlədən təhsildə başqaları ilə münasibətinin vəziyyətinin yenidən nəzərdən keçirilməsi, onların bərabər imkanlar təmin etmək hüquqlarının tanınması ilə əlaqəli təhsil sisteminin inkişafının təbii mərhələsidir. İnklüziv təhsil müasir cəmiyyətdə böyük perspektivlərə malik olan mütərəqqi öyrənmə üsuludur (11). Bu, “inklüziv” cəmiyyətin yaradılmasında son məqsədə çatmaq üçün bir addımdır.

İnklüziv təhsil cinsindən, yaşından, etnik mənsubiyyətindən, qabiliyyətindən və ya inkişaf qüsurlarından asılı olmayaraq bütün uşaqlara və böyüklərə cəmiyyətdə iştirak etmək və töhfə vermək imkanı verəcək.

Çatışmayan bəzi cəhətlərə baxmayaraq, inklüziv təhsilin daha çox üstünlükləri var. İnklüzivliyin əsas məqsədi əlilliyi olan insanlar üçün onların cəmiyyətin həyatında iştirakına və ona töhfə verməyə imkan verəcək maneəsiz mühit yaratmaqdır. Belə inklüziv cəmiyyətdə fərqliliklərə hörmət və qiymət verilir, ayrı-seçkilik və qərəzlə mübarizə aparılır (Sadıxova, Mansurova, 2022).

İnklyüziv dəyərləri – müdriklik, rəhm, inam və cəsarətdir. Bunlar isə yeni dəyərlərin inkişafına gətirir – bərabərlik, iştirakçılıq, fərqliliyə hörmət, dayanıqlıq, ümid və sevincə. Həqiqi inklüziv təhsil adi təhsilə qarşı durmur, o, hər iki təhsil sistemini birləşdirir - ümumi və xüsusi (13).

## Ədəbiyyat


1. https://studfile.net/preview/9970281/
2. Bitov, A.L. (2000). “Xüsusi uşaq tədqiqatı və yardım təcrübəsi” inteqrasiya və sosiallaşma problemləri. M.: Pravda, 254 s.
3. Quseva, T.N. (2010). “İnklüziv təhsil”. M.: Mərkəzi “Məktəb kitabı”.
4. Alyoxina, S.V., Semaqo, M.M. (2012). İnklüziv təcrübə üçün psixoloji və pedaqoji dəstək modelinin yaradılması və sınaqdan keçirilməsi: Metodik vəsait. M.: MGPPU, 156 s.
5. “Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası”. (2013).
6. https://journal.tinkoff.ru/inclusive-education/?ysclid=lp8ea5mgi3536031849
7. Fətəliyeva, L.P. (2018). “İnklüziv təhsilə müasir baxış”. M.: “Elm, Mədəniyyət və Təhsil Dünyası” jurnalı.
8. Xusnutdinova, M.R. (2017). “İnklüziv təhsilin riskləri”. M.: “Təhsil və Elm” jurnalı.
9. http://www.deti.rian.ru/grani
10. Voroniç, E.A. (2013). Təhsildə inklüziv yanaşmanın mahiyyəti. “Fan Science” elmi əsərlərin dövri jurnalı, s.17-20.
11. https://nsportal.ru/nachalnaya-shkola/materialy-mo/2017/05/26/inklyuzivnoe-obrazovanie-problemy-i-puti-ih-resheniya
12. Sadıxova, G.R, Mansurova, D.A. (2022). Tibbi biliklərin əsasları və mülki müdafiə kafedrası. “İnkluziv təhsilin “müsbət” və “mənfi” halları. “İnklüziv təhsildən inklüziv cəmiyyətə” respublika elmi-praktik konfransın materialları, 15 aprel.
13. https://www.defectologiya.pro/zhurnal/inklyuzivnoe_obuchenie_detej_s_razlichnyimi


Göndərilib: 13.09.2023 Qəbul edilib: 21.11.2023

DOI: https://doi.org/10.36719/2663-4619/97/60-65

**Azər Musayev**
Azərbaycan Respublikasının Prezidenti yanında
Dövlət İdarəçilik Akademiyası
magistrant
azermusayev82@gmail.com
**Şahnaz Ələkbərli**
Azərbaycan Respublikasının Prezidenti yanında
Dövlət İdarəçilik Akademiyası
magistrant
sahnaz907.sa@gmail.com
**Zöhrə Kəngərli**
Azərbaycan Respublikasının Prezidenti yanında
Dövlət İdarəçilik Akademiyası
magistrant
kengerlizohre05@gmail.com

# ƏLİLLİYİ OLAN ŞƏXSLƏRİN ƏMƏK HÜQUQLARI VƏ MƏŞĞULLUĞU: MİLLİ VƏ BEYNƏLXALQ TƏCRÜBƏ KONTEKSTİNDƏ

**Xülasə**

Əlilliyi olan şəxslərin məşğulluğu onların sosial müdafiəsi və ən müxtəlif sosial təminatları üçün xüsusilə əhəmiyyət daşıyır. Onların məşğulluğunun təmin edilməsi ilə bağlı Azərbaycan Respublikasında kvota sistemi tətbiq edilir və bu sistemdə müəyyən təkmilləşdirmələrə ehtiyac vardır.

Məqalədə əlilliyi olan şəxslərin əmək şəraiti və əmək münasibətlərində sahib olduğu hüquqlar, Azəbaycan Respublikasının Əmək Məcəlləsi, Əlilliyi olan şəxslərin hüquqları haqqında Azərbaycan Respublikası Qanunu və digər sahəvi qanunlar və normativ-hüquqi aktlar, o cümlədən regional və universal səviyyəli beynəlxalq hüquqi sənədlər kontekstində təhlil edilmişdir.

***Açar sözlər:*** *əlilliyi olan şəxslər, əmək hüququ, məşğulluq, kvota sistemi, konvensiya*

**Azer Musayev**
The Academy of Public Administration under the
President of the Republic of Azerbaijan
master student
azermusayev82@gmail.com
**Shahnaz Alakbarli**
The Academy of Public Administration under the
President of the Republic of Azerbaijan
master student
sahnaz907.sa@gmail.com
**Zohra Kangarli**
The Academy of Public Administration under the
President of the Republic of Azerbaijan
master student
kengerlizohre05@gmail.com

## Labor rights and employment of persons with disabilities: in the context of national and international practice

**Abstract**

Employment of persons with disabilities is of particular importance for their social protection and the most diverse social guarantees. The quota system is applied in the Republic of Azerbaijan to ensure their employment, and there is a need for certain improvements in this system.

The article analyzes the labour conditions of persons with disabilities and their rights in labour relations in the context of the Labour Code of the Republic of Azerbaijan, the law of the Republic of Azerbaijan on the rights of Persons with disabilities and other sectoral laws and normative-legal acts, including regional and universal international legal documents.

***Keywords:*** *persons with disabilities, labor law, employment, quota system, convention*

### Giriş

Cəmiyyətdə əsas həssas sosial qruplardan hesab edilən əlilliyi olan şəxslərin bu və ya digər ehtiyaclarının, hüquq və azadlıqlarının təmin edilməsi Azərbaycan Respublikasının sosial siyasətinin əsas istiqamətlərindən birini təşkil etməkdədir. İstər milli, istərsə də beynəlxalq praktikada əlilliyi olan şəxslərin hüquqi statusuna yönələn xeyli miqdarda normativ-hüquqi akt qəbul edilmişdir. Hazırda başlıca beynəlxalq hüquqi sənəd əlilliyi olan şəxslərin hüquqları sahəsində ilk məcburi beynəlxalq sənəd olan Əlilliyi olan şəxslərin hüquqları haqqında BMT Konvensiyasıdır. Azərbaycan Respublikası bu Konvensiyaya 2 oktyabr 2008-ci il tarixdə qoşulmuşdur. Konvensiya əlilliyi olan şəxslərlə bağlı yeni hüquqlar müəyyən etməyərək onların əsas konstutision hüquqlarını möhkəmləndirir və burada əlilliyi olan şəxslərin əmək hüququ xüsusi əhəmiyyət daşıyır.

Ümumilikdə əlilliyi olan şəxslərin hüquqi statusu ilə bağlı məsələnin beynəlxalq hüquq arenasına gətirilməsi ötən əsrin 60-cı illərindən başlamışdır. Bu vaxta qədər qəbul olunan insan hüquq və azadlıqları ilə bağlı universal beynəlxalq sənədlərdə birbaşa əlilliyi olan şəxslərin hüquqi statusuna yönələn normalara yer verilməmişdir. 1961-ci ildə qəbul edilən Avropa Sosial Xartiyası əlilliyi olan şəxslərin hüquqi statusu ilə bağlı normanın nəzərdə tutulduğu ilk beynəlxalq hüquqi aktdır. Aktın 15-cı maddəsi əlilliyi olan şəxslərin sosial inteqrasiyasının və ya cəmiyyət həyatında müstəqil iştirak hüququnun təmin edilməsi ilə bağlı iştirakçı dövlətlərin üzərinə əlilliyi olan şəxslərin təhsil və peşə hazırlığını təmin etmək məqsədilə dövlət və mümkün qədərilə özəl sektor çərçivəsində tədbirlər görmək, onların adi şəraitdə məşğulluğunu təmin etmək, bu mümkün olmadıqda isə onların əlilliyinin xarakterik xüsusiyyətlərinə uyğun olan məşğulluq sahələri yaratmaq və əlillərin əmək reabilitasiyasını bu və ya başqa formada asanlaşdırmaq kimi öhdəliklər qoyulmuşdur.

Azərbaycan Respublikası Qanunvericiliyində əlilliyi olan şəxslərin hüquqi statusu ilə bağlı normanı özündə ehtiva edən bir sıra qanunvericilik aktlarına geniş ifadə dəyişiklikləri edilmişdir. O cümlədən Avropa Sosial Xartiyasının təsdiq edilməsi barədə 18 oktyabr 2001-ci il tarixli Azərbaycan Respublikasının Qanununun 15-ci maddəsi yeni redaksiyada verilmiş və şikəstlik ifadəsi fiziki və əqli çatışmazlıq ifadəsi ilə əvəz edilmişdir. Bununla belə, həmin maddədə əksini tapan digər şikəstlik ifadəsi maddənin mətnində qalmaqdadır. Fikrimizcə, müvafiq dəyişiklik bu hissədə də öz əksini tapmalıdır.

Əlilliyi olan şəxslərin hüquqi statusuna yönələn beynəlxalq sənədlərdə əlilliyi olan şəxslərə verilən anlayış zamanla daha da təkmilləşmişdir və hazırda Əlilliyi olan şəxslərin hüquqları haqqında Konvensiya əlilliyi olan şəxsləri *“müxtəlif maneələrlə qarşılaşdığı zaman digər şəxslərlə bərabər səviyyədə cəmiyyət həyatında tam və səmərəli iştirakına mane olan sabit fiziki, psixi, əqli və ya hissiyyat pozuntuları olan şəxs”* kimi müəyyən edir (1). Əlilliyi olan şəxslərin hüquqları haqqında Konvensiyanın 12-ci maddəsinə əsasən iştirakçı dövlətlər bütün sahələrdə əlilliyi olan şəxslərin bərabər hüquq qabiliyyətini təmin etməyi öz öhdələrinə götürürlər (1). Bu sahələr

içərisində əlilliyi olan şəxslərin məşğulluğu, əmək münasibətlərində bərabər iştirakı və peşə-əmək reabilitasiyası xüsusi yer tutur.

Əlilliyi olan şəxslərin hüquqları haqqında Konvensiyanın 27-ci maddəsi əlilliyi olan şəxslərin əmək hüququnu təsbit edir və onların məşğulluğunun təmin edilməsi ilə əlaqədar bütün sahələrdə (iş axtarılması, tapılması, işə qəbul, kariyerada irəliləmə, ədalətli, təhlükəsiz, əlverişli əmək şəraiti və s.) dövlətlərin üzərinə müvafiq öhdəliklər qoyur (1).

Beynəlxalq Əmək Təşkilatı əlilliyi məhz məşğulluq nöqteyi-nəzərindən qiymətləndirmişdir. Belə ki, BƏT-in "Əlilliyi olan şəxslərin peşə reabilitasiyası və məşğulluğu haqqında" 1983-cü il tarixli 159 nömrəli Konvensiyasının 1-ci maddəsində əlilliyi olan şəxs "fiziki və psixi çatışmazlıqları səbəbindən iş tapmaq, münasib işdə qalmaq və xidmət üzrə irəli çəkilmək imkanları məhdud olan şəxs" kimi müəyyən edilib (Əliyeva, 2019: 10). Bundan əlavə BƏT-in "Sosial təminat haqqında" 1952-ci il Konvensiyası əlilliyi olan şəxslərin məşğulluğunun təmin edilməsi ilə bağlı məsələyə onların müvafiq işlə təmin edilməsi məqsədilə müxtəlif səhiyyə xidmətləri göstərən dövlət və özəl müəssisələrin bu xidmətlərlə bağlı ümumi əməkdaşlığının təmin edilməsi və peşə reabilitasiyasının təmin edilməsi ilə bağlı zəruri müddəaların milli qanunvericilikdə nəzərdə tutulması aspektindən yanaşır (Əliyeva, 2019: 111).

Əlilliyi olan şəxslərin əmək hüquqları və məşğulluğu ilə bağlı regional aktlar da əhəmiyyət daşıyır. "Əlilliyi olan şəxslərə qarşı ayrı-seçkiliyin bütün formalarının ləğvi haqqında" 1999-cu il Amerikaarası Konvensiyada əlilliyi olan şəxslərlə bağlı əsas hədəflərdən biri əlilliyi olan şəxslərin onların imkan və bacarıqlarına uyğun işlə təmin edilməsidir. "Məşğulluq və yoxsulluğun azaldılması üzrə" 2004-cü il Afrika Bəyannaməsi və Fəaliyyət planına əhalinin həssas qrupları ilə bağlı yoxsulluğun azaldılması proqramı və siyasətinin hazırlanıb həyata keçirilməsini nəzərdə tutmuşdur ki, burada həssas qruplar sırasında əlilliyi olan şəxslər ilk olaraq vurğulananlardandır (Əliyeva, 2019: 154-156).

Azərbaycan Respublikası dövlət müstəqilliyi bərpa etdikdən sonra əlilliyi olan şəxslərin hüquqları və azadlıqları, imtiyazları ilə bağlı çoxlu sayda normativ akt qəbul edilmişdir. Burada "Əlilliyin qarşısının alınması, əlillərin reabilitasiyası, sosial müdafiəsi haqqında" (qüvvədən düşmüşdür) və "Əlilliyi olan şəxslərin hüquqları haqqında" Azərbaycan Respublikası Qanunları xüsusi əhəmiyyət daşıyır. "Əlilliyi olan şəxslərin hüquqları haqqında" Azərbaycan Respublikası Qanununun 5-ci fəsli əlilliyi olan şəxslərin məşğulluğuna həsr edilib və əlilliyi olan şəxslərin məşğulluğu ilə bağlı əsas etibarı ilə "Əlilliyin qarşısının alınması, əlillərin reabilitasiyası və sosial müdafiəsi haqqında" Qanunun müddəalarını təkrarlayır, lakin iki fərq xüsusilə qeyd olunmalıdır:

1. Birinci Qanuna əsasən əlilliyi olan şəxslərlə bağlı kvota tələblərini yerinə yetirməyən işəgötürənlər Azərbaycan Respublikası DSMF-yə respublika üzrə orta aylıq əmək haqqının 3 misli məbləğində vəsait köçürməli idilər.

2. Müəssisisənin ləğv edilməsi halları istisna olmaqla, istehsalatda bədbəxt hadisə nəticəsində əmək qabiliyyətini itirmiş, yaxud peşə xəstəliyinə tutulmuş və bunun nəticəsində əlilliyi olan işçilərlə əmək müqaviləsini ləğv edərkən işəgötürən DSMF-yə respublika üzrə orta aylıq əmək haqqının 120 misli məbləğində vəsait köçürməlidirlər.

Hazırda hər iki halla bağlı inzibati məsuliyyət nəzərdə tutulmuşdur.

Azərbaycan Respublikasının Əmək Məcəlləsində əlilliyi olan şəxslərlə əlaqədar onların digər şəxslərlə bərabər səviyyədə əmək fəaliyyəti ilə məşğul olmasını təmin etmək işəgötürənlərin vəzifələrindən biri kimi qeyd olunması istehsalat qəzası və ya peşə xəstəliyi nəticəsində əlilliyi yaranan şəxslərin işçilərin ixtisarı zamanı işdə saxlanılmaqda üstünlük hüququ, orqanizmin funksiyalarının 81-100 faiz pozulmasına görə əlilliyi müəyyən edilmiş ailə üzvü olan işçilərlə əmək müqaviləsinin ləğv edilməsi qadağan edilir. Əlilliyi olan işçilərin yalnız öz razılığı ilə və müvafiq icra hakimiyyəti orqanının müəyyən etdiyi orqanın (qurumun) rəyi nəzərə alınmaqla gecə vaxtı işlərinə cəlb oluna bilməsi, əlilliyi olan şəxslərlə bağlı əmək məzuniyyətinin müddəti 42 gündən az olmamaqla müəyyən edilməsi və s. ilə bağlı müddəalar nəzərdə tutulub (3).

Həm beynəlxalq, həm də milli qanunvericilik səviyyəsində qadağan edilməsinə baxmayaraq əlilliyi olan şəxslər əksər hallarda yoxsulluq və işsizlik kimi problemlərlə üzləşirlər və araşdırmalar

son qeyd olunan amillərin birbaşa bir-biri ilə bağlı olduğunu göstərir. Belə ki, əlilliyi olan şəxslərin işsiz qalma riski digərlərinə nisbətdə daha çoxdur və onlar adətən aşağı maaşlı işçi qruplarına aid edilirlər. O cümlədən əlilliyi olan şəxslər karyera yüksəlişinin olmaması və işə qəbul zamanı bacarıq və peşə hazırlığının qeyri-kafi dəyərləndirilməsi kimi problemlərlə üzləşirlər (George, Trichopoulou, 2012: 37).

Əlilliyi olan şəxslərin məşğulluğunun təmin edilməsi ilə əlaqədar ilkin məsələ onların işə qəbul olma və müvafiq iş yerlərinin olması imkanları ilə bağlıdır və sözügedən problemin aradan qaldırılması üçün dünya təcrübəsində bir neçə vasitə tətbiq edilməkdədir və ən özünü doğrultmuş təcrübə kvota sisteminin tətbiqidir. Sözügedən sahəyə ayrılan maliyyə dəstəyi, dövlət və özəl sektor çərçivəsində məşğulluq proqramları və s. də bu qəbildəndir. Kvota sistemi tarixdə ilk dəfə ötən əsrin 20-ci illərindən başlayaraq Qərbi Avropa dövlətlərində tətbiq edilməyə başlayıb. Bu sistem əsas etibarı ilə müəssisənin işçilərinin sayına mütənasib olmaqla işəgötürəndən müvafiq sayda əlilliyi olan şəxsi işə götürməyi tələb edir. Lakin bu tələbin məcburi və ya könüllü xarakter daşıması kvotanın həddi və işəgötürənin yerinə yetirmədiyi halda daşıdığı məsuliyyətin həcmi ilə əlaqədar fərqlər mövcuddur. Hazırda Avropa ölkələri üçün kvotaların həddi müəssisənin işçilərinin sayından asılı olmaqla 2% ilə 10% arasında dəyişir (Agefiph, 2022: 13). Bəzi ölkələrdə kvotada müəyyən olunan miqdardan daha artıq əlilliyi olan şəxsi işəgötürən müəssisələr müəyyən güzəştlər əldə edirlər. İtaliyada ən azı 30 faizi əlilliyi olan işçi qüvvəsi olan sosial kooperativlər sosial sığorta haqlarından azad edilə bilər. Digər halda bəzi ölkələrdə isə müəssisələr kvotanı doldurmadıqda dövlət büdcəsinə müəyyən məbləğdə vəsait ödəməli olurlar. Məsələn, Yaponiyada kvotadakı saya çatmayan müəssisələrə rüsum tətbiq edilir. Yığılan rüsumlar kvotadan artıq əlilliyi olan işçiləri işə götürən müəssisələrə qrant kimi ödənilir (O’Reilly, 2003: 59).

Kvota sistemi Azərbaycan Respublikasında da tətbiq olunmaqdadır və Əlilliyi olan şəxslərin hüquqları haqqında Qanunun 22.2-ci maddəsinə əsasən bu məsələ “Məşğulluq haqqında” Azərbaycan Respublikası Qanunu ilə tənzimlənməkdədir. Bununla bağlı “Sosial müdafiəyə xüsusi ehtiyacı olan və işə düzəlməkdə çətinlik çəkən vətəndaşlar üçün kvota tətbiq edilməsi Qaydası”- təsdiq edilib. Əlilliyi olan şəxslər həmin vətəndaşlar sırasında vurğulanıb və onlarla əlaqədar işəgötürənlər qarşısında işçilərin sayının müvafiq faizinə mütənasib (məs. 25-50 sayda işçisi olan müəssisədə işçilərin orta illik siyahı sayının 3 faizi miqdarında işçi həmin vətəndaşlardan ibarət olmalı, bir iş yeri isə əlilliyi olan şəxslər üçün nəzərdə tutulmalıdır) kvota tələbi vardır (7). Bu sənəddə kvota tələbinin şamil edilmədiyi müəssisələr sırasında dövlət orqanları ilk olaraq vurğulanır. Bu amil əlilliyi olan şəxslərin məşğulluğunun təmin edilməsindəki geniş imkanlardan məhrum edən səbəblərdən biridir. Buna müvafiq olaraq da həmin normadakı orqanlar sırasından dövlət orqanlarının çıxarılması və ya tələbin bütün dövlət orqanlarına şamil edilmədiyini təmin edən yeni redaksiyada verilməsi məqsədəmüvafiq hesab edilir. O cümlədən Əlilliyi olan şəxslərin hüquqları haqqında Konvensiyanın yuxarıda qeyd olunan 27-ci maddəsində əlilliyi olan şəxslərin dövlət sektorunda işlə təmin edilməsi iştirakçı dövlətlərin üzərinə vəzifə kimi qoyulmuşdur.

Əlilliyi olan şəxslərlə bağlı kvota tələbinin şamil edilmədiyi müəssisələrə dünya praktikasında yanaşma müxtəlifdir. Belə ki, Türkiyə Respublikasında əlilliyi olan şəxslərin hüquqi statusuna yönələn əsas akt 5378 saylı Əlillərin Müdafiəsi Qanunudur və bu aktda əlilliyi olan şəxslərlə bağlı kvota tələbi həm dövlət, həm də özəl sektorda bütün ölkə ərazisində və bütün işəgötürənlərə tətbiq olunur. 24 noyabr 1995-ci il tarixli Əlillərin sosial müdafiəsi haqqında Qanuna əsasən Rusiya Federasiyasında işəgötürənlər ümumi işçilərin ən azı 2%-i miqdarında əlilliyi olan şəxsi işə götürülməlidirlər. Buna baxmayaraq qeyd olunan kvota tələbi kiçik müəssisələr və kiçik və orta sahibkarlıq subyektləri, habelə əhaliyə sosial xidmətlərin göstərilməsi ilə məşğul olan dövlət və bələdiyyə qurumlarına şamil edilmir. Buna baxmayaraq əlilliyi olan şəxslərlə bağlı kvota tələbini müəyyən etməyən dövlətlər də var. Məsələn, ABŞ-da bununla bağlı federal qanun yoxdur və hökümət yalnız müvafiq məşğulluq proqramlarını həyata keçirməklə əlilliyi olan şəxslərin məşğulluğunu təmin etməyə çalışır (8).

Əlilliyi olan şəxslərin məşğulluğunun təmin edilməsi ilə əlaqədar beynəlxalq praktikada qəbul edilmiş əsas vasitələrdən biri də bu sahə üzrə maliyyə dəstəyidir və belə maliyyə dəstəyi ən

müxtəlif formalarda tətbiq edilir. Əlilliyi olan işçilərlə əlaqədar işəgötürənlərə verilən əməkhaqqı subsidiyaları maliyyə dəstəyinin əsas formalarındandır. Bəzi ölkələrdə işəgötürənlərə bu cür əməkhaqqı subsidiyaları müəyyən vaxt çərçivəsində verilir (İsveçdə 4 il, Almaniyada 8 il və s.). Subsidiyanın məbləği isə dəyişkəndir. Məsələn, Avstriyada bu, işin birinci ilində tam əmək haqqının 80 faizinə qədər ola bilər. Bəzi ölkələrdə iş yerlərinin əlilliyi olan şəxslər üçün müyəssərliyinin, və yaxud çatımlılığının təmin edilməsi ilə əlaqədar çəkilən xərclərlə bağlı işə götürənlər vergi güzəştləri tələb edə bilirlər (O'Reilly, 2003: 55).

Əlilliyi olan şəxslərin məşğulluğu və əmək bazarında inklüziv iştirakı onların sosial müdafiəsi üçün xüsusilə əhəmiyyət daşıyan faktordur. Belə ki, əhalinin həssas sosial qruplarının maddi ehtiyaclarını qarşılamaq üçün, demək olar ki, bütün dünya dövlətlərində sosial pensiya və müavinətlər sistemi tətbiq edilir və əlilliyə və ya digər əsaslara görə sosial pensiyalara hüququn yaranması üçün qanunvericilikdə müvafiq əmək stajı, yaxud da sosial sığorta stajı tələbi nəzərdə tutulur.

Azərbaycan Respublikasında da əlilliklə bağlı sosial pensiya və müavinət sistemi tətbiq edilməkdədir və əlilliyi olan şəxslərlə bağlı qeyd olunan hüququn yaranmasının əsasları, şərtləri, məbləği və s. sahəvi qanunlarla müəyyən edilir ("Əmək pensiyaları haqqında" və "Sosial müavinətlər haqqında" Azərbaycan Respublikası Qanunları) (9).

Qanunverici əlilliyə görə əmək pensiyasına anlayış verərkən məhz əmək hüququ nöqteyi nəzərdən çıxış etmiş və sözügedən pensiyanın əqli və ya fiziki pozuntulara görə əmək qabiliyyətinin məhdudlaşması ilə bağlı olaraq təyin edildiyini qeyd etmişdir. Əlilliyi olan şəxslərin orqanizmin funksiyalarının pozulma faizlərindən asılı olaraq əmək pensiyasının təyin edilməsi üçün tələb olunan sosial sığorta stajının müddətləri dəyişir. Belə ki, orqanizmin funksiyalarının 81-100 faiz pozulması halında 5 ildən az olmayan sosial sığorta stajı və əmək qabiliyyətli yaş dövrünün hər tam ili üçün 4 ay sığorta stajı tələb edilir (10).

Orqanizmin funksiyalarının 31-80 faiz pozulma halında isə yuxarıda qeyd olunan sosial sığorta stajı müddəti tələblərindən əlavə şəxsin fərdi hesabının sığorta hissəsində qeydə alınmış pensiya kapitalının əmək pensiyasının minimum məbləğindən az olmayan pensiya təminatına imkan verməsi tələb edilir. Sonuncu tələblərə cavab vermədikdə əlilliyə görə sosial müavinət hüququ yaranır (11).

Əlilliyi olan şəxslərin əmək şəraiti ilə bağlı Azərbaycan Respublikası qanunvericiliyində konkret tələblər vardır. Belə ki bunlara həm əlilliyi olan şəxslərlə bağlı ümumi tələblər (onların işlədiyi binaların dəhlizlərinin eninin 1,8 m-dən, qapılarının girişinin eninin 0,9 m-dən az olmaması, habelə həmin binalarda işıq-çağırış siqnallarının və səsin işıq indikatorunun quraşdırılması və s.) habelə ayrı-ayrı kateqoriyadan olan əlilliyi olan şəxslərlə bağlı (əlilliyi olan şəxs üçün arabada hərəkət edənlər, görmə qabiliyyətini tam itirmiş əlilliyi olan şəxslər, eşitmə qabiliyyətini tam itirmiş əlilliyi olan şəxslər və s.) aid etmək olar (12).

## Nəticə

Əlilliyi olan şəxslərin əmək hüquqları onların əsas konstitusion hüquqlarından biridir və bu hüquqla bağlı bir sıra beynəlxalq və regional xarakterli hüquqi aktlar qəbul edilmişdir və burada əsas sənəd "Əlilliyi olan şəxslərin hüquqları haqqında" BMT Konvesiyasıdır. Əlilliyi olan şəxslərin əsas sosial təminatlarından olan əmək pensiyası əksər dövlətlərin qanunvericiliyində əmək stajı ilə şərtləndirildiyindən əlilliyi olan şəxslərin məşğulluğunun təmini onların sosial müdafiəsi üçün xüsusi əhəmiyyət daşımaqdadır. Azərbaycan Respublikasında mövcud olan əlilliyi olan şəxslərlə bağlı sosial imtiyaz sistemi olduqca mütərəqqi xarakter daşıyır və müasir beynəlxalq standartlara cavab verir.

Buna baxmayaraq əlilliyi olan şəxslərin məşğulluğunun təmin edilməsi ilə bağlı özünü doğrultmuş və əksər dünya dövlətlərində, o cümlədən Azərbaycan Respublikasında da tətbiq edilən kvota sistemi ilə əlaqədar müəyyən təkmilləşdirilmələrə ehtiyac vardır.

## Ədəbiyyat

1. "Əlilliyi olan şəxslərin hüquqları haqqında" Konvensiyaya qoşulmaq barəsində Azərbaycan Respublikasının Qanunu https://e-qanun.az/framework/15641
2. Əliyeva, S. (2019). Əlillərin hüquqlarının müdafiəsi sahəsində beynəlxalq hüquq normalarının Azərbaycan Respublikası qanunvericiliyinə implementasiyası. Bakı: Red N Line.
3. Azərbaycan Respublikasının Əmək Məcəlləsi https://e-qanun.az/framework/46943
4. George, N., Trichopoulou, A. (2012). Employment Status For People With Disabilities In Greece. South-Eastern Europe Journal of Economics.
5. Agefiph, (2022). Employment of people with disabilities. Studies and Statics.
6. O'Reilly, A. (2003). The right to decent work of persons with disabilities. ILO.
7. "Sosial müdafiəyə xüsusi ehtiyacı olan və işə düzəlməkdə çətinlik çəkən vətəndaşlar üçün kvota tətbiq edilməsi Qaydası"nın və "Kvota şamil edilməyən müəssisələrin Siyahısı"nın təsdiq edilməsi haqqında" Azərbaycan Respublikası Nazirlər Kabinetinin Qərarı https://e-qanun.az/framework/11456
8. "Əmək pensiyaları haqqında" Azərbaycan Respublikasının Qanunu https://e-qanun.az/framework/11566
9. "Əlilliyi olan şəxslərin iş yerlərinin standartları"nın təsdiq edilməsi barədə" Azərbaycan Respublikası Nazirlər Kabinetinin Qərarı https://e-qanun.az/framework/43242
10. Azərbaycan Respublikasının İnzibati Xətalar Məcəlləsi https://e-qanun.az/framework/46960
11. "Əlilliyi olan şəxslərin iş yerlərinin standartları"nın təsdiq edilməsi barədə" Azərbaycan Respublikası Nazirlər Kabinetinin Qərarı https://e-qanun.az/framework/43242
12. "Avropa Sosial Xartiyasının təsdiq edilməsi barədə" Azərbaycan Respublikasının Qanunu https://e-qanun.az/framework/5409

Göndərilib: 06.10.2023 Qəbul edilib: 18.11.2023

DOI: https://doi.org/10.36719/2663-4619/97/66-70

**Mirçıraq Həşimov**
Azərbaycan Respublikasının Prezidenti yanında
Dövlət İdarəçilik Akademiyası
magistrant
mirciraqhesimov@gmail.com
**Oktay Səfərov**
Azərbaycan Respublikasının Prezidenti yanında
Dövlət İdarəçilik Akademiyası
magistrant
oktay.safarov.059@gmail.com
**Vüqar Rufulla**
Azərbaycan Respublikasının Prezidenti yanında
Dövlət İdarəçilik Akademiyası
magistrant
vuqarrufulla@gmail.com
**Nərmin Əhmədli**
“NESHVE_Baku” MMC
nerminehmedli31@gmail.com

# YERLİ ÖZÜNÜİDARƏETMƏNİN NƏZƏRİ-HÜQUQİ ƏSASLARI

**Xülasə**

Yerli özünüidarəetmə qloballaşan dünyada yerlərdə idarəçiliyin təmin edilməsi baxımından mühüm əhəmiyyətə malik olan institutlardandır. Məqalədə yerli özünüidarəetmənin tarixi nəzəriyyələri, Avropada və Azərbaycan Respublikasında hüquqi əsasları araşdırılmış, müasir yerli özünüidarəetmələrin əsas təşkil edilmə prinsipləri tədqiq edilmişdir. Tədqiqatlar zamanı yaxın keçmişdə Respublikamızın bələdiyyələrin təşkili zamanı qarşılaşdığı problemlər göstərilmiş, bu fonda aparılmış islahatlara nəzər yetirilmişdir.

***Açar sözlər:*** *yerli idarəetmə, bələdiyyə, qloballaşma, desentralizasiya, prinsip, nəzəriyyə*

**Mirchirag Hashimov**
The Academy of Public Administration under the
President of the Republic of Azerbaijan
master student
mirciraghesimov@gmail.com
**Oktay Safarov**
The Academy of Public Administration under the
President of the Republic of Azerbaijan
master student
oktay.safarov.059@gmail.com
**Vugar Rufulla**
The Academy of Public Administration under the
President of the Republic of Azerbaijan
master student
vuqarrufulla@gmail.com
**Narmin Ahmadli**
"NESHVE_Baku" LLC
nerminehmedli31@gmail.com

## Theoretical-legal basis of local self-government

**Abstract**

Local self-government is one of the most important institutions in terms of ensuring local governance in the globalized world. In the article, the historical theories of local self-government, legal bases in Europe and the Republic of Azerbaijan, and the basic principles of modern local self-government were searched. In the course of the research, the problems faced by our Republic during the organization of municipalities in the recent past were shown, and the reforms carried out against this background were reviewed.

***Keywords:*** *local government, municipality, globalization, decentralization, principle, theory*

## Giriş

Müasirləşən dünyada effektiv dövlət idarəçiliyinin, sosial-iqtisadi tərəqqinin təmin edilməsi bu və ya digər dövlətin təcrübəsində bir sıra çətinliklərlə müşahidə edilir. Demokratik hüquqi prisipləri mənimsəmiş ölkələrin idarəetmələrinin müşahidəsi göstərir ki, ölkəni demokratiya və iqtisadi tərəqqiyə aparan yol azad bazar münasibətlərinin bərqərar edilməsindən və iqtisadiyyatın liberallaşdırılmasından keçir. Siyasi-iqtisadi sistemin liberallaşması isə, hər şeydən əvvəl ölkədə əks-mərkəzləşdirmənin (desentralizasiya) dərinləşdirilməsini, həmçinin müstəqil, habelə inzibati və iqtisadi baxımdan güclü yerli özünüidarəetmə institutlarının – bələdiyyələrin formalaşdırılmasını tələb edir.

Avropa Şurası tərəfindən 15 oktyabr 1985-ci ildə Strasburqda qəbul edilmiş "Yerli özünüidarə haqqında Avropa Xartiyası"nın 3-cü maddəsinə əsasən, yerli özünüidarə dedikdə, yerli özünüidarə orqanlarının dövlət işlərinin xeyli hissəsini reqlamentləşdirmək və qanun çərçivəsində fəaliyyət göstərərək, məsuliyyəti öz üzərinə götürməklə onu yerli əhalinin maraqlarına uyğun idarə etmək hüququ və real qabiliyyəti başa düşülür (1). Azərbaycan Respublikasının qanunvericiliyində də (Bələdiyyələrin statusu haqqında Azərbaycan Respublikası Qanununun 1-ci maddəsi) oxşar anlayış verilərək yerli özünüidarəetmənin vətəndaşların fəaliyyətinin təşkilinin sistemi olduğu və bu sistemin onlara qanun çərçivəsində yerli əhəmiyyətli məsələləri müstəqil və sərbəst şəkildə həll etmək hüququnu həyata keçirmək və yerli əhalinin mənafeyi naminə Azərbaycan Respublikası Konstitusiyasının 144-cü maddəsinin II hissəsinə uyğun olaraq dövlət işlərinin bir hissəsini yerinə yetirmək imkanı verdiyi bildirilir (2).

Yerli özünüidarəetmə qloballaşan dünyada dövlət idarəetməsini asanlaşdıran və modernizasiya edən vasitə kimi çıxış edir. Belə ki, daimi inkişafda olan dövlətlər üçün dövlətdaxili məsələlərin həyata keçirilməsi kifayət qədər vaxt və maddi vəsait tələb etdiyi üçün onlar üzərinə düşən öhdəlikləri azaltmaq və yerli əhali ilə əlaqəli şəkildə həyata keçirmək məqsədilə yerli özünüidarə orqanlarından istifadə edirlər.

Yerli özünüidarəetmənin fəaliyyətinin böyük bir hissəsini dövlətin müxtəlif vasitələrlə (hüquqi, maliyyə-iqtisadi və s.) təsir göstərə bildiyi məsələlər təşkil edir. Bu heç də yerli özünüidarəetmənin "dövlət içində dövlət" olduğu anlamına gəlmir. Belə ki, yerli özünüidarəetmə yalnız yerli məsələlərin həlli üçün özünütəşkil forması deyil, həmçinin xalq hakimiyyəti və ictimai hakimiyyətin həyata keçirilmə forması olsa belə, dövlətdən fərqli olaraq yerli özünüidarəetmə orqanları suverenliyə malik deyil və müstəqil olaraq öz səlahiyyətləri dairəsini təyin etmək ixtiyarları yoxdur (İsmayılova, 2008: 12). Bununla yanaşı yerli özünüidarəetmə orqanlarının öz qanunvericilik hakimiyyətini həyata keçirmək hüququ yoxdur. Başqa sözlə desək, bu və ya digər yerli əraziyə aid olan və ümumi qanunları əvəz edən qanunlar qəbul edə bilməzlər. Doğrudur, yerli özünüidarəetmə orqanları ümumi xarakterli davranış qaydalarını şərh edən normativ aktlar qəbul edirlər. Lakin qəbul edilən sözügedən normativ aktlar qanunlara şamil edilmir və öz mahiyyəti etibarı ilə inzibati aktlardır. Beləliklə, yerli özünüidarəetməyə konstitusiyalı quruluşun əsası, əhalinin yerli məna kəsb edən məsələləri müstəqil həll etmək hüququ, xalq hakimiyyəti forması və s. kimi baxmaq olar. Bu baxımdan qeyd etməliyik ki, yerli özünüidarəetmə aşağıdakı prinsiplərə əsaslanır (Jered, 2006):

- **Müstəqil idarəetmə:** Yerli idarə vahidlərinin özlərini müstəqil şəkildə idarə etməsi və yerli qərarlarını qəbul etməsinə imkan verən prinsip;
- **Sərbəst qərar qəbul etmə:** Yerli özünüidarəetmə sistemi demokratik prinsiplər əsasında fəaliyyət göstərməlidir. Yerli əhalinin iştirakını və qərar qəbuletmə prosesinə aktiv təsir imkanlarını təmin etmək üçün demokratik normativlər və prosedurların olması vacibdir;
- **Müstəqil maliyyə:** Bu prinsip yerli idarə vahidlərinin özünü idarə etməsi və inkişaf etməsi üçün müstəqil maliyyə resurslarına sahib olmasını ehtiva edir. Bu, özünüidarəetmənin inkişafına və yerli iqtisadiyyatın güclənməsinə imkan verir;
- **Əməkdaşlıq və ittifaq:** Mərkəzi hökumət və yerli idarə vahidləri arasında əməkdaşlıq və ittifaqın mövcud olması da olduqca mühüm amildir. Hər iki tərəfin bir-birilə qarşılıqlı əməkdaşlıq çərçivəsində fəaliyyət göstərməsi, müstəqil ərazi idarəsini təmin etməsi üçün bir-birinə yardım göstərməsi yerli özünüidarə sistemlərinin bir xeyli güclənməsinə səbəb olar;
- **Məsuliyyət və hesabatlılıq:** Yerli idarə vahidlərinin öz nümayəndələrinə və əhalisinə qarşı məsuliyyət daşımaları və tədbirlərini şəffaflaşdırmaları mükəmmələ yaxın özünüidarəetmə institutlarının formalaşdırılmasına yardım göstərir. Bu baxımdan məsuliyyət və hesabatlılıq prinsipinə, şəffaflığa əsaslanan bir idarəetmə sistemi təmin edilməlidir;
- **Ərazi birləşmələrinin təminatı:** Ərazi birləşmələrinin siyasi təminatları isə güclü və müstəqil yerli özünüidarəetmə vahidlərinin formalaşmasına bir xeyli yardım edir .

Tarixi araşdırmalara əsasən, icmalarda idarəçiliyin təşkili və onun dövlət hakimiyyəti ilə münasibətlərinin nizamlanması barədə düşüncə məhz orta əsrlərdə Avropada formalaşmağa başlamışdır. Bu, əsas etibarilə ayrı-ayrı şəhərlərdə mövcud olan icmaların inkişafı ilə şərtlənirdi. XIX əsrdə alman hüquqşünasları Qneyst, Şteyn və Laband yerli özünüidarənin əsası kimi "azad icma nəzəriyyəsini" irəli sürmüşlər. Belçikanın 1813-cü ildə qəbul edilən Konstitusiyasında yerli özünüidarəetmələrə icma idarəçiliyi statusu verilmiş və bu orqanlar 4-cü hakimiyyət kimi tanınmışdır (Kuznetsova, 2002: 51). Bu mövqe hələ 1790-cı ildə fransız alimi Turc tərəfindən əsaslandırılmışdı və yerli özünü idarəetmənin iki alternativ fəaliyyət növü irəli sürülmüşdü: sırf icma xarakterli və dövlət tərəfindən verilən. Bu müddəalara söykənən "azad icma" nəzəriyyəsi icmanın öz işlərini idarə etməsi cəhdi insan hüquqları, azadlıqları kimi təbii xarakter daşıdığını sübut etməyə cəhd göstərirdi. Belə ki, sözügedən nəzəriyyənin tərəfdarları icmaların dövlətdən əvvəl yarandığını əsas gətirərək, dövlətin icma idarəçiliyinin sərbəstliyinə hörmətlə yanaşmalı olduğunu bildirirdilər. Belə ki, bu müddəalar 1831-ci ildə qəbul edilən Belçikanın Konstitusiyasında 4-cü hakimiyyət (icmalar) qismində, həmçinin Frankfurtun 1849-cu ildə qəbul olunmuş və icmanın əsas hüquqlarını göstərən Konstitusiyasında da təsbit olunmuşdu. "Azad icma" nəzəriyyəsi tərəfdarları yerli özünüidarəetmənin səlahiyyətlərindən irəli gələn vəzifələri özünün yerinə yetirdiyini iddia edərək dövlətə qarşı dayanır (Elma, 2007).

Böyük ictimai fikir xadimi, liberalizmin görkəmli nümayəndələrindən biri olan ingilis iqtisadçısı Con Stüart Mil hələ XIX əsrin ortalarında bildirirdi ki: "hökumət tərəfindən qəbul edilən hər bir yeni vəzifə onsuz da vəzifələrlə həddindən artıq yüklənmiş bir təsisat üçün yeni, əlavə yükdür, vəzifələrin mərkəzi və yerli orqanlar arasında düzgün bölündüyü ölkədə isə həmin problemi aradan qaldırmaq bir xeyli asanlaşır". Beləliklə, yerli idarəçilik sahəsində "icma" nəzəriyyəsinin yerinə "dövlətçilik" nəzəriyyəsi meydana çıxdı. Bu nəzəriyyənin tərəfdarları belə hesab edirdi ki, özünüidarəçilik dövlət idarəçiliyinin bir formasıdır. Bu nəzəriyyəyə görə bələdiyyələr dövlət orqanlarının yerlərdəki icra strukturları ilə bağlı olmayan nümayəndəlikləridir. Belə yanaşma hər şeydən əvvəl onunla əsaslandırılır ki, yerli özünüidarəetmə orqanlarının büdcəsinin əsas hissəsi mərkəzi büdcənin hesabına formalaşdırılır. Onların prinsipial məsələlərə dair siyasəti dövlət orqanları ilə bir olmalı və mərkəzi idarəetmə tərəfindən müəyyənləşdirilməlidir.

Hüquqi demokratik dövlət quruculuğunu özünün başlıca məqsədlərindən biri elan edən respublikamız Konstitusiyada digər ümumbəşəri dəyərlərlə yanaşı hüquqi demokratik dövlətin və vətəndaş cəmiyyətinin ən mühüm elementlərindən biri olan yerli özünüidarənin də konstitusion əsaslarını müəyyən edir. Müasir dövrdə cəmiyyətin və dövlətin səmərəli şəkildə idarə olunması üçün hakimiyyətin təkcə üfüqi deyil, həm də şaquli bölgüsü də mühüm əhəmiyyət kəsb edir. Dövlət

yerli əhəmiyyətli məsələlərin və yerli səviyyədə bir sıra dövlət məsələlərinin həlli səlahiyyətlərini bələdiyyələrin səlahiyyətləri kimi tanıyır və ona təminat verir (7). Azərbaycan Respublikasının sonrakı konstitusion inkişafı da yerli özünüidarəetmədən yan keçməmiş, həm 24 avqust 2002-ci il tarixli referendumla, həm də 18 mart 2009-cu il tarixli referendumla yerli özünüidarəetmənin konstitusion əsaslarını müəyyən edən müddəalara onların təkmilləşdirilməsi istiqamətində əlavə və dəyişikliklər edilmişdir. Bununla da, Azərbaycan Respublikasında yerli özünüidarəetməni həyata keçirən bələdiyyələrin müstəqilliyinin əlavə 32 təminatları nəzərdə tutulmuşdur.

Müstəqilliyimizin əvvəllərində yerli özünüidarəetmə sahəsində bır sıra problemlər mövcud olmuşdur. Bunlara aşağıdakıları aid etmək olar (8):

- Xidmətlərin keyfiyyətini artıran, uzunmüddətli təsirə malik olan inkişaf, orta və uzun müddətli planlaşdırma strategiyasından istifadə edilməməsi;
- Bələdiyyələrin qərarlarında ictimai iştirak səviyyəsinin aşağı olması;
- Rayon İcra Hakimiyyətləri və bələdiyyələr arasında əlaqələndirmənin və iş bölgüsünün zəif səviyyədə olması;
- Bələdiyyə ərazilərində iş prosesinin düzgün aparılmaması.

Lakin yuxarıda göstərilən halların aradan qaldırılması məqsədilə ölkəmizdə davamlı islahatlar aparılır, bələdiyyələrin fəaliyyətini tənzimləyən normativ hüquqi aktlar qəbul edilir, inkişaf proqramları hazırlanır və icra edilir.

Bələdiyyələrin fəaliyyətini tənzimləyən normativ-hüquqi aktlar aşağıdakılardır (Şahbazov, Həsənov, Məmmədov, 2011):

- Azərbaycan Respublikasının Konstitusiyası;
- "Bələdiyyələrin statusu haqqında" Azərbaycan Respublikasının Qanunu;
- Azərbaycan Respublikasının Seçki Məcəlləsi;
- "Bələdiyyələrin əraziləri və torpaqları haqqında" Azərbaycan Respublikasının Qanunu;
- "Bələdiyyənin nümunəvi nizamnaməsinin təsdiq edilməsi haqqında" Azərbaycan Respublikasının Qanunu;
- "Yerli rəy sorğusu haqqında" Azərbaycan Respublikasının Qanunu;
- "Bələdiyyə qulluğu haqqında" Azərbaycan Respublikasının Qanunu;
- "Bələdiyyə mülkiyyətinə əmlakın verilməsi haqqında" Azərbaycan Respublikasının Qanunu;
- "Bələdiyyələrin maliyyəsinin əsasları haqqında" Azərbaycan Respublikasının Qanunu;
- "Bələdiyyələrin daimi və başqa komissiyaları haqqında Əsasnamənin təsdiq edilməsi barədə" Azərbaycan Respublikasının Qanunu;
- "Bələdiyyə üzvünün statusu haqqında" Azərbaycan Respublikasının Qanunu;
- "Bələdiyyələrin birgə fəaliyyəti, birləşməsi, ayrılması və ləğv edilməsi haqqında" Azərbaycan Respublikasının Qanunu;
- "Yerli vergilər və ödənişlər haqqında" Azərbaycan Respublikasının Qanunu.

Ümumilikdə isə ayrı-ayrı ölkələrdə yerli özünüidarəetmə sistemləri əhalinin tarixi təcrübəsi, adət-ənənəsi və hüquq mədəniyyətindən asılı olaraq müxtəlif olduğu kimi, bu halları nəzərə alan müxtəlif nəzəri baxışlar mövcuddur. Azərbaycan Respublikasında da problemə yanaşma «Bələdiyyələrin statusu haqqında» Azərbaycan Respublikası Qanununa müvafiq olaraq həm yerli özünüidarənin azad icma nəzəriyyəsi və həm də dövlət nəzəriyyəsi prinsiplərinə əsaslanır (10).

Azərbaycanda yerli özünüidarəetmə sahəsində əhəmiyyətli təşəbbüslərdən biri də ölkəmizdə 2022-ci ilin martında "Birləşmiş Millətlər Təşkilatının İnkişaf Proqramının (BMTİP) "İqtisadi İnkişafı Dəstəkləyən Bələdiyyə Sədrləri" layihəsi üzrə proqrama start verilməsidir (11). Avropa İttifaqının maliyyə dəstəyi ilə BMT İnkişaf Proqramı tərəfindən həyata keçirilən bu layihə Azərbaycanda yerli özünüidarəetmə orqanları üçün ilk təşəbbüsdür. Proqram "yaşıl keçid", təhsil, iqtisadi artım və s. sahələrdə bələdiyyələrə dəstək verilməsi daxil olmaqla çox geniş məsələləri əhatə edir (Görmez, 1997).

## Nəticə

Azərbaycan Respublikasında yerli özünüidarəetmə bələdiyyələr tərəfindən ölkənin dayanıqlı sosial-iqtisadi, sənaye inkişafına mütənasib olaraq uğurla davam etdirilir və bu sahədə inkişaf proqramlarını, orta və uzun müddətli strategiyaların hazılanması və həyata keçirilməs xüsusi əhəmiyət kəsb edir.

Dövlət və bələdiyyə idarəetməsində, onların qarşılıqlı fəaliyyətində müasir və desentralizasiya əsaslı istiqamətlər ortaya çıxmışdır. Bələdiyyələr yerli əhalinin ehtiyaclarının ödənilməsi, rifah halının yüksəldilməsi kimi digər xüsusi əhəmiyyət kəsb edən məsələlərin həllində daha təsirli qurumlar hesab edilir.

Yerli idarəetmə faktiki olaraq müstəqil idaretmə, sərbəst qərar qəbul etmə, müstəqil maliyyə, əməkdaşlıq və ittifaq, məsuliyyət və hesabatlılıq, ərazi birləşmələrinin təminatı prinsiplərinə əsaslanmaqla, əhalinin yerli məsələlərin həyata keçirilməsində iştirak səviyyəsini artırmaqla, habelə, qanunvericilik bazasının təkmilləşdirilməsi ilə həyata keçirilir.

Azərbaycan Respublikası bələdiyyələrin faəliyyətinə dəstək vermək məqsədilə "Birləşmiş Millətlər Təşkilatının İnkişaf Proqramının (BMTİP) "İqtisadi İnkişafı Dəstəkləyən Bələdiyyə Sədrləri" layihəsinə qoşularaq yerli özünüidarəetmə sahəsində bir sıra məsələlərin həllinə töhfə verəcəyini hədəfləyir.

## Ədəbiyyat

1. Avropa Şurası tərəfindən 15 oktyabr 1985-ci ildə Strasburqda qəbul edilmiş "Yerli özünüidarə haqqında Avropa Xartiyası".
2. «Bələdiyyələrin statusu haqqında» Azərbaycan Respublikasının 2 iyul 1999-cu il tarixli Qanunu, https://e-qanun.az/framework/4770
3. İsmayılova, A. (2008). "Azərbaycan Respublikasinda bələdiyyələrin formalaşmasının sosial-iqtisadi problemləri". Bakı: "Elm", 12 s.
4. Jered, B.C. (2006). Local Government Autonomy and State Reliance on Special District Governments: A Reassessment, Political Research Quarterly.
5. Kuznetsova, O. (2002).Teoreticheskiye osnovy gosudarstvennogo regulirovaniya ekonomicheskogo razvitiya pei ionov. Voprosy ekonomiki, 51 s.
6. Elma, F. (2007). "Türkiye'nin Belediyecilik Deneyimi ve Azerbaycan Belediyeciliği". Journal of Qafqaz University.
7. Azərbaycan Respublikasının Konstitusiyası. https://e-qanun.az/framework/897
8. Kərimova, G. "Müasir idarəetmə sistemində bələdiyyə Və Dövlət Orqanlari Arasinda Qarşılıqlı Münasibətlərin Tədqiqi" Mövzusunda Magistr Dissertasiyası.
9. Şahbazov, K.A., Həsənov, H.S., Məmmədov, H.M. (2011). "Dövlət və Bələdiyyə idarəçiliyi". Bakı: "İqtisad Universiteti" nəşriyyatı, dərslik.
10. Frederickson, G., Smith, K.B. (2003). "The Public Administration Theory Premier". Cambridge: Westview Pres.
11. İbrahimov, İ.M. (2014). "Bələdiyyə idarəçiliyinin beynəlxalq təcrübəsi". Bakı: "Ziya".
12. Görmez, K. (1997). "Yerel Demokrasi ve Türkiye". İstanbul: Vadi Yayınları.

Göndərilib: 21.10.2023 Qəbul edilib: 03.12.2023

DOI: https://doi.org/10.36719/2663-4619/97/71-76

**Şahnaz Ələkbərli**
Azərbaycan Respublikasının Prezidenti yanında
Dövlət İdarəçilik Akademiyası
magistrant
sahnaz907.sa@gmail.com
**Azər Musayev**
Azərbaycan Respublikasının Prezidenti yanında
Dövlət İdarəçilik Akademiyası
magistrant
azermusayev82@gmail.com
**Zöhrə Kəngərli**
Azərbaycan Respublikasının Prezidenti yanında
Dövlət İdarəçilik Akademiyası
magistrant
kengerlizohre05@gmail.com

# HÜQUQİ YARDIM ALMAQ HÜQUQU: MİLLİ QANUNVERİCİLİK VƏ XARİCİ TƏCRÜBƏ (İTALİYA VƏ POLŞA ÖLKƏLƏRİNİN TİMSALINDA)

**Xülasə**

Hüquqi yardım almaq hüququ ölkəmizdə müstəqil Azərbaycan Respublikası Konstitusiyasının qəbulu ilə təsbit olunmuşdur. Belə ki, əvvəlki konstitusiyalardan fərqli olaraq, qüvvədə olan Konstitusiyanın 61-ci maddəsi məhz yüksək keyfiyyətli hüquqi yardım almaq hüququnu özündə ehtiva edir.

Eyni zamanda bu cür yardımın qanunla nəzərdə tutulmuş hallarda dövlət hesabına göstərildiyi qeyd edilmişdir. Ödənişsiz hüquqi yardım aztəminatlı şəxslərin digər şəxslərlə bərabər şəkildə hüquqi yardımla təmin olunması üçün nəzərdə tutulmuşdur. İstər milli, istərsə də digər dövlətlərin qanunvericiliklərində və həmçinin BMT-nin sənədlərində bu məsələ diqqətdən kənarda qalmamışdır. Bu məqalədə hüquqi yardıma həm Azərbaycan Respublikası, həm də İtaliya və Polşa kimi ölkələrin aspektindən nəzər salınmış, müqayisəli təhlil aparılmışdır.

***Açar sözlər:*** *hüquqi yardım, vəkil, ədalətli məhkəmə araşdırması, cinayət işi, qanunvericilik*

**Shahnaz Alakbarli**
The Academy of Public Administration under the
President of the Republic of Azerbaijan
master student
sahnaz907.sa@gmail.com
**Azer Musayev**
The Academy of Public Administration under the
President of the Republic of Azerbaijan
master student
azermusayev82@gmail.com
**Zohra Kangarli**
The Academy of Public Administration under the
President of the Republic of Azerbaijan
master student
kengerlizohre05@gmail.com

## The right to legal aid: national legislation and foreign experience (on the example of Italy and Poland)

### Abstract

The right to access legal aid is enshrined in our country by the adoption of the Constitution of the Independent Republic of Azerbaijan. Thus, unlike previous constitutions, Article 61 of the current Constitution contains the right to access high-quality legal aid.

At the same time, it was noted that such assistance is provided at the expense of the state in cases provided for by law. Free legal aid is designed to provide low-income persons with legal assistance on an equal basis with other persons. This issue was not ignored in the legislation of borh national and other countries, as well as in the documents of the UN. This article reviewed legal aid from the perspective of the Republic of Azerbaijan, as well as countries such as Italy and Poland, and conducted a comparative analysis.

***Keywords:*** *legal aid, lawyer, fair trial, criminal case, legislation*

### Giriş

Hüquqi yardım hüququ müxtəlif ölkələrdə müxtəlif hüquq normaları əsasında tanınır və qorunur. Bu hüquq ölkəmizdə müstəqil Azərbaycan Respublikasının Konstitusiyasında təsbit olunmuşdur.

Hüquqi yardımla əlaqədar bir sıra BMT sənədləri, həmçinin xarici ölkələrin qanunvericilikləri maraq doğurur. Bu məqaləni yazmaqda məqsədimiz hüquqi yardımı, həmçinin onun növlərindən biri olan ödənişsiz hüquqi yardımı həm milli, həm də xarici ölkələrin kontekstində araşdırmaq və müqayisəli təhlil etməkdir. Hüquqi yardım ədalətli məhkəmə hüququ da daxil olmaqla digər hüquqların həyata keçirilməsi üçün əsasdır, başqa sözlə, bu cür hüquqların həyata keçirilməsinin ilkin şərtidir.

Birləşmiş Millətlər Təşkilatının beynəlxalq standartlara və tanınmış ən yaxşı təcrübələrə əsaslanan Cinayət Mühakimə Sistemlərində Hüquqi Yardıma Giriş Prinsipləri və Təlimatları dövlətlərə cinayət mühakimə sistemində hüquqi yardım sisteminin əsaslanmalı olduğu əsas prinsiplərə dair tövsiyələr vermək və təsirli olması üçün lazım olan xüsusi elementləri müəyyənləşdirmək məqsədi daşıyır.

Prinsiplər və təlimatlara əsasən "hüquqi yardım" tutulan, həbs olunan, cinayət törətməkdə şübhəli bilinən və ya təqsirləndirilən şəxslərin, habelə cinayət mühakiməsi prosesində zərərçəkmiş və şahidlərin kifayət qədər vəsaiti olmadıqda və ya ədalət maraqları tələb etdikdə hüquqi məsləhət, hüquqi yardım və təmsil olunmalarını əhatə edir.

Qeyd etmək lazımdır ki, dövlətlər hüquqi yardım göstərmək üçün müxtəlif modellərdən istifadə edirlər. Bunlar özəl hüquqşünaslar, müqavilə əsasında vəkillər, pro bono proqramları, paraleqallar və s. ola bilər.

Dövlətlər hüquqi yardımın göstərilməsini öz məsuliyyəti hesab etməlidirlər. Bu məqsədlə öz milli hüquq sistemlərində konkret qanunvericilik və qaydaların qəbul edilməsinin mümkünlüyünü düşünməli və əlçatan, təsirli, davamlı və etibarlı hüquqi yardım sisteminin olmasını təmin etməli, hüquqi yardım sistemi üçün lazımi insan və maliyyə mənbələrini ayırmalı və cinayətkar davranışların qarşısını almaq üçün müvafiq vasitələrlə əhalinin hüquq və vəzifələri barədə məlumatlılığını artırmalıdırlar. Dövlətlər hər kəsə qanun və məhkəmə qarşısında bərabərliyini nəzərə alınmaqla hüquqi yardımın göstərilməsini təmin etməlidirlər.

Dövlətlər hüquqi yardım almaq hüququnu müəyyənləşdirmək üçün vəsait yoxlamasından istifadə edirlər. Bu məqsədlə dövlətlər vəsaitlər üçün nəzərdə tutulmuş meyarların geniş şəkildə dərc olunmasını təmin etməli; polis məntəqələrində, həbsxanalarda və ya məhkəmələrdə təcili olaraq hüquqi yardıma ehtiyacı olan şəxslərə bu cür yardım almaq hüququnun müəyyən edilməsi müddəti üçün ilkin hüquqi yardım göstərilməli; məhkəmə, şəxsin konkret hallarını nəzərə alaraq və hüquqi yardımdan imtina səbəblərini nəzərdən keçirərək, ədalət mənafelərinin tələb etdiyi zaman həmin şəxsə onun iştirakı ilə və ya iştirakı olmadan hüquqi yardım göstərilməsi barədə qərar qəbul

etməli. Vəsait yoxlaması ailənin ümumi gəlirlərinə əsasən hesablanırsa, lakin fərdi ailə üzvləri bir-biri ilə ziddiyyət təşkil edirsə və ya ailə gəlirlərinə bərabər çıxışı yoxdursa, yalnız hüquqi yardım istəyən şəxsin gəliri vəsait yoxlanılmasına məruz qalmalıdır (1).

Hüquqi yardım və onun növlərindən biri olan ödənişsiz hüquqi yardım həm milli qanunvericiliyimizdə, həm bir sıra beynəlxalq sənədlərdə, həmçinin BMT-nin sənədlərində öz əksini tapmışdır. Belə ki, Cinayət mühakimə sistemlərində hüquqi yardım haqqında Model Qanununa əsasən, hüquqi yardım almaq hüququ olan hər bir şəxs hüquqi yardıma çıxışda ayrı-seçkiliyə yol verməmək hüququ; cinayət mühakiməsi prosesinin bütün mərhələlərində operativ və effektiv hüquqi yardım göstərmək hüququ; hər hansı bir istintaq orqanı tərəfindən dindirmə zamanı və məhkəmənin bütün mərhələlərində hüquqi yardım göstərən şəxsin olması hüququ və s. bu kimi hüquqlara malik olmalıdır (2).

Mülki və Siyasi Hüquqlar haqqında Beynəlxalq Paktın 14-cü maddəsinə əsasən, hər bir şəxs ona qarşı irəli sürülən istənilən cinayət ittihamına baxılarkən bərabərlik əsasında aşağıdakılarla təmin olunmaq hüququna malikdir: öz iştirakı ilə mühakimə olunmaq və özünü şəxsən və ya öz seçdiyi müdafiəçisi vasitəsilə müdafiə etmək; əgər müdafiəçisi yoxdursa, bu hüququ barədə xəbərdar edilmək və ədalət məhkəməsinin mənafeyi bunu tələb etdiyi istənilən halda onun üçün təyin edilmiş müdafiəçiyə, bu müdafiəçinin haqqını ödəməyə kifayət qədər vəsaiti olmadığı istənilən halda isə pulsuz müdafiəçiyə malik olmaq (3).

Dövlətdaxili qanunvericiliyimizə nəzər salsaq, ödənişsiz hüquqi yardım hüququ Konstitusiyamızda təsbit olunan və hər kəsin yekun nəticədə məhkəmə müdafiəsini təmin edən hüquqdur. Konstitusiyamızın 61-ci maddəsinə əsasən hər kəsin yüksək keyfiyyətli hüquqi yardım almaq hüququ vardır və qanunla nəzərdə tutulmuş hallarda hüquqi yardım ödənişsiz, dövlət hesabına göstərilir (4).

Həm milli qanunvericiliyimizdə, həm də xarici ölkələrin qanunvericiliyində hüquqi yardım və onun növlərindən biri kimi ödənişsiz hüquqi yardım keçən əsrin ortalarından etibarən ilk olaraq sosioloqlar tərəfindən öyrənilməyə başlanmışdır. Sosioloqlar qeyd edirdilər ki, ödənişsiz hüquqi yardım göstərilməsi iki modelə - "judicare" və "welfare" modellərinə əsaslanır. "Judicare" modelinin əsasında ilk dövrlər xeyriyyə işlərinin görülməsi dururdu. Bu cür xeyriyyə işləri çərçivəsində hüquqşünaslar heç bir ödəniş almadan və könüllü olaraq insanlara hüquqi yardım göstərirdilər və bu model 80-ci illərinə qədər davam etmişdir. Bu sistemə əsasən vəkillərə müəyyən olunmuş şəxslər qrupuna hüquqi yardım göstərilməsi üçün dövlət büdcəsindən pul ödənilir.

Ödənişsiz hüquqi yardımın göstərilməsi üzrə "welfare" modeli 1960-cı illərdə ABŞ-da o zamankı prezident Lindon Consonun "Yoxsulluqla mübarizə" proqramı əsasında tətbiq olunmağa başlanılmışdır. Bu modelə əsasən, yerli icmaların nəzdində daimi hüquqşünas ştatları formalaşdırılır və bu hüquqşünaslar "judicare" modeli əsasında fəaliyyət göstərən peşəkar vəkillərin qatılmadıqları işlərə cəlb olunurlar (5).

Ödənişsiz hüquqi yardım yalnız Konstitusiyamızda deyil, bir sıra digər qanunvericilik aktlarında da öz əksini tapmışdır. Belə ki, Azərbaycan Respublikası Cinayət Prosessual Məcəlləsinin 193.2-ci maddəsində göstərilir: Şübhəli və ya təqsirləndirilən şəxsin müdafiəçinin xidmətlərini ödəməyə kifayət qədər vəsaiti yoxdursa və müdafiəçinin cinayət prosesində iştirakı bu Məcəllənin 92.3-cü maddəsində nəzərdə tutulmuş hallarda (müdafiəçinin iştirakının məcburi olduğu hallar) təmin olunmalıdırsa, cinayət prosesini həyata keçirən orqan həmin şəxsə hüquqi yardımın göstərilməsini Azərbaycan Respublikasının dövlət büdcəsi vəsaiti hesabına təmin etməlidir (6). O cümlədən Azərbaycan Respublikasının Mülki-Prosessual Məcəlləsinin 14.5-ci maddəsinə əsasən, bu Məcəllə ilə müəyyən edilmiş hallarda, vəkilin xidmətlərini ödəmək üçün kifayət qədər vəsaiti olmayan şəxs maraqlarının təmsil olunması və prosessual hüquqlarının həyata keçirilməsi üçün dövlət hesabına peşəkar hüquqi yardım almaq hüququna malikdir (7).

"Vəkillər və vəkillik fəaliyyəti haqqında" Qanunun 20-ci maddəsinə əsasən, inzibati qaydada tutulmuş şəxslərə, cinayət işləri üzrə şübhəli və ya təqsirləndirilən şəxslərə və məhkəmədə vəkilin xidmətlərini ödəmək üçün kifayət qədər vəsaiti olmayan şəxslərə hər hansı bir məhdudiyyət qoyulmadan vəkil tərəfindən göstərilən hüquqi yardım dövlət hesabına həyata keçirilir. Maddi

vəziyyətinə görə öz hesabına vəkil tutmaq imkanı olmayan tutulmuş şəxsə dövlət hesabına hüquqi yardım göstərən növbətçi vəkil öz vəzifələrini yerinə yetirməkdən imtina edə bilməz (8).

Başqa ölkələrlə müqayisədə ölkəmizdə adambaşına düşən vəkillərin sayı azdır. Belə ki, hər 100.000 əhaliyə Avropadakı median göstərici 120.4 ilə müqayisədə ölkəmizdə 15.7-dir. Statistik göstəricilərə əsasən, ölkəmizdə vəkillərin sayının az olması, fəaliyyətdə rəqabəti təşviq etməyə, keyfiyyətli hüquqi yardımın artırılmasına yönəlmiş tədbirlərə səbəb olmuşdur. Bununla əlaqədar olaraq Azərbaycan Respublikası Prezidentinin "Azərbaycan Respublikasında vəkilliyin inkişafı ilə bağlı əlavə tədbirlər haqqında" 22.02.2018-ci il tarixli Sərəncamı Vəkillər Kollegiyası Rəyasət Heyəti tərəfindən Hüquqi Yardım və Tədris Mərkəzinin təsis edilməsi ilə nəticələnmişdir. Mərkəz vətəndaşlara peşəkar hüquqi yardım göstərilməsi, mövcud qanunvericiliyə uyğun olaraq dövlət hesabına hüquqi yardımın göstərilməsində iştirak edən vəkillərin işinin təşkil edilməsi; məhkəmə qərarı ilə müəyyən olunmuş vəkil haqlarının vaxtında ödənilməsinin təmin edilməsi; vəkillərin peşəkarlığını daha da artırmaq üçün onların təlimlərə cəlb edilməsini təmin etmək məqsədi güdür.

Eyni zamanda, vəkillər pulsuz hüquqi yardım (dövlət büdcəsi hesabına) göstərilməsinə təşviq edilmişdir. 2018-ci ilin may ayında Azərbaycan Respublikası Nazirlər Kabinetinin qərarı ilə vəkilə hüquqi yardım göstərilməsinin hər iş saatı üçün ödənilən məbləğ üç dəfə artırılaraq 6 manat müəyyən edilmişdir. Bununla belə, bu haqq digər ölkələrə nisbətən çox aşağıdır. Hesab edirik ki, vəkillərə verilən saatbaşı ödənişin artırılması şəxslərə peşəkar hüquqi yardım göstərilməsində daha çox marağa səbəb ola bilər.

Hüquqi yardımın əldə edilməsinə dair BMT prinsipləri ilə dövlətlər üçün bəzi strategiyalar müəyyən edilmişdir: vəkil köməkçiləri və digər təşkilatlar tərəfindən hüquqi yardım xidmətləri göstərilməsinə təşviq etmək; universitetlərin nəzdində hüquqi yardım klinikaları vasitəsilə hüquqi yardım xidmətləri göstərilməsinin dəstəklənməsi və s. Hüquqi yardım əldə etmə hüquqlarının qanunla mövcud olmasına baxmayaraq, mövcudluğu barədə məlumatlar heç də həmişə rəsmi, yazılı və/və ya təqsirləndirilən şəxslərin ehtiyaclarına uyğun şəkildə verilmir. Bunun nəticəsində hüquqi yardıma səmərəli çıxış imkanı olmur. Hüquq xidmətlərinin coğrafi bölgüsü kənd yerlərində yaşayan insanlara daha kəskin təsir göstərir və bu qrupların və xüsusilə qadınların hüquqi yardıma çıxış imkanına təsir edir. Azərbaycan Respublikasının Vəkillər Kollegiyası aztəminatlı əhaliyə pulsuz hüquqi yardım göstərmək üçün mütəmadi olaraq bölgələrə səfərlər təşkil edir. Bundan əlavə, ASAN xidmət mərkəzlərində və Bakı Dövlət Universitetinin hüquq klinikalarında (3 və 4-cü kurs tələbələri müəllimlərin nəzarəti altında hüquqi yardım xidmətləri göstərir) və Ədliyyə Akademiyasında pulsuz hüquqi məsləhətlər verilir (9).

Digər ölkələrdə hüquqi yardımın göstərilməsinə nəzər saldıqda görürük ki, Polşada vahid hüquqi yardım sistemi və onun sistemli və mütəşəkkil şəkildə verilməsini tənzimləyən xüsusi hüquqi yardım qanunvericiliyi yoxdur. Cinayət işlərində hüquqi yardımın göstərilməsi barədə qərar hakim tərəfindən qəbul edilir. Hakim hüquqi yardım tələbinin yerinə yetirilib-yetirilməməsinə və hansı vəkilin təyin olunacağına qərar verir. Hüquqi yardım işləri ilə məşğul olan ayrı bir vəkil qrupu yoxdur: hakim Vəkillər Kollegiyası tərəfindən verilən siyahıdan vəkil təyin edir. Hakim vəkilin ixtisasına və ya mövcudluğuna diqqət yetirmək məcburiyyətində deyil, yəni cinayət qanununda az təcrübəsi olan və ya ümumiyyətlə olmayan vəkillər mürəkkəb cinayət proseslərində iştirak etmək üçün təyin edilə bilər (10).

İtaliyada isə hüquqi yardım hüququ ilk dəfə 19-cu əsrdə tanınmışdır. Dövlət tərəfindən maliyyələşdirilən hüquqi yardım milli, regional və yerli səviyyədə mövcuddur. Regional və yerli səviyyədə vətəndaş cəmiyyəti təşkilatları, paraleqallar və pro bono könüllüləri də Vəkillər Kollegiyası və Hüquqi Yardım İdarəsi ilə koordinasiyada hüquqi yardım xidmətləri göstərirlər. İtaliya Respublikası Konstitusiyasının 24-cü maddəsinə əsasən, hər hansı bir şəxs mülki və inzibati qanunvericiliyə uyğun olaraq hüquqlarını qorumaq üçün məhkəməyə müraciət edə bilər. Müdafiə məhkəmənin hər mərhələsində və instansiyasında ayrılmaz bir hüquqdur. Qanuna görə, yoxsullar bütün məhkəmələrdə iddia qaldırmaq və ya müdafiə etmək üçün lazımi vəsait almaq hüququna malikdirlər. Qanun məhkəmə səhvləri halında dəymiş ziyanın şərtlərini və formalarını müəyyənləşdirir (11).

"Patrocinio a spese dello Stato" kimi tanınan hüquqi yardım, İtaliya Konstitusiyasının 24-cü maddəsinin həyata keçirilməsinə və kifayət qədər vəsaitləri olmadığı üçün vəkil xidmətləri ilə təmin oluna bilməyən şəxslərin (mülki, inzibati və cinayət işləri üzrə) müdafiə hüququna çatmasını təmin etmək məqsədi daşıyır (12).

İtaliyada hüquqi yardım ərizəçinin gəlirindən asılıdır (əgər onun tələbi cinayət mühakiməsinə aiddirsə, həmçinin onunla birlikdə yaşayan qohumları). Dövlət hesabına himayə almaq üçün ərizəçinin illik gəliri 11.746.68 avrodan çox olmamalıdır (13).

Hüquqi yardımın alınması prosesi hüquqi yardıma ehtiyacı olan şəxsin tələbi ilə başlanır. Cinayət işlərində ərizəçi kifayət qədər vəsaiti olmaması barədə meyarlara cavab verdiyini dürüst şəkildə bildirməlidir. Hakim/vəkil də ərizəçidən həmin meyarlara cavab verdiyinə dair sübutlar istəyə bilər. Hüquqi yardım göstərən şəxslər ali hüquq təhsili almalı, peşə imtahanından keçdiyini təsdiqləyən sənədləri təqdim etməli və təcrübəli vəkillə təcrübə keçməlidirlər. Onlar həmçinin milli vəkillər kollegiyasının üzvü olmalı və dövlət tərəfindən təsdiqlənmiş hüquqi yardım təminatçıları reyestrində qeydiyyatdan keçməlidirlər.

Cinayət işlərində cinayət ittihamı ilə həbs olunan şəxslərə, cinayət törətməkdə ittiham olunan şəxslərə, cinayət ittihamı ilə azadlıqdan məhrum edilmiş şəxslərə, cinayət qurbanlarına, istintaq altında olan şəxslərə və cinayət törətdiyinə görə mülki və ya inzibati məsuliyyət daşıyan şəxslərə (mütləq cinayətkarlara deyil) hüquqi yardım verilir. Xüsusi şiddət kateqoriyasındakı qurbanlara isə (məsələn, təcavüz, məişət zorakılığı, təcavüz, uşaq pornoqrafiyası və s.) hüquqi yardım maddi vəziyyətindən asılı olmayaraq verilir.

Hüquqi yardım göstərənlərdən Vəkillər Kollegiyası tərəfindən müəyyən edilmiş etik qaydalara riayət etmələri tələb olunur. Bir şəxs hüquqi yardım almaq hüququna malikdirsə, lakin hüquqi yardım təminatçısı yoxdursa və ya hazırlıqsız və ixtisassızdırsa, ixtisaslı hüquqi yardım təminatçısı gəlməmişdən əvvəl məhkəmə prosesi dayandırılmalıdır.

Hüquqi yardım təminatçısı işə baxmaqdan imtina edə bilər və ya müəyyən bir hüquqi yardım alıcısını təmsil etmək öhdəliyindən azad edilməsini istəyə bilər. Cinayət işlərində, iş hüquqi yardım təminatçısına təhvil verildikdən sonra, hüquqi yardım qurumları eyni provayderin təqsirləndirilən/ şübhəli şəxsin işin bütün mərhələlərində təmsil olunmasını təmin etməyə çalışırlar (14).

Hüquqi yardım xidmətlərinin keyfiyyətini izləmək üçün rəsmi bir mexanizm yoxdur, bu, əsasən vətəndaş cəmiyyəti təşkilatları tərəfindən izlənilir.

İtaliyada vəkillərin edə biləcəyi hər bir peşə hərəkəti üçün minimum və maksimum mükafatlar nəzərdə tutulur. Lakin ölkədə hüquqi yardım haqqı azdır; hüquqi yardım üzrə vəkil sadə bir iş üçün 1000-1500 avro, özəl hüquqşünas isə eyni iş üçün 4000-5000 avro qazanır. Hüquqi yardım haqqı o qədər aşağıdır ki, bir çox hüquqşünas təyinatdan imtina edir və eyni zamanda təyinatla razılaşanların da işi hərtərəfli araşdırmaq üçün kifayət qədər vəsaiti və ya motivasiyası olmur (15).

## Nəticə

Hüquqi yardım hüququ bir çox ölkələrdə müxtəlif hüquqi çərçivələr və konstitusiya müddəaları əsasında tanınır və qorunur. Ödənişsiz hüquqi yardım isə bərabərlik, qərəzsizlik və ədalətli məhkəmə hüququ ilə sıx bağlıdır. Aztəminatlı şəxslərə hüquqi yardım göstərməklə, bu hüquq maddi vəziyyətindən asılı olmayaraq ədalətin hamı üçün əlçatan olması prinsipini qorumağa kömək edir. Ümumiyyətlə, ödənişsiz hüquqi yardım hüququ ədalət mühakiməsinə bərabər çıxışın təmin edilməsinin və hər kəsin əsas hüquq və mənafelərinin qorunmasının vacibliyini özündə əks etdirir. Ölkəmizdə bu sahədə bir sıra islahatlar aparılsa da, hesab edirik ki, bir sıra dövlət qurumları, o cümlədən müxtəlif qeyri-hökumət təşkilatları tərəfindən hüquqşünasların və vəkillərin iştirakı ilə debatlar keçirilməli və əhalinin hüquqi yardım barədə məlumatlılığı artırılmalı, hüquqi yardım üçün vəkillərə verilən saatbaşı ödəniş artırılmalı, ali təhsil müəssisələrinin nəzdində hüquq klinikaları yaradılmalı, o cümlədən regionlarda vəkillərin sayı artırılmalı və peşəkar hüquqi yardımın təmin edilməsinə daha çox diqqət ayrılmalıdır. Onu da qeyd edək ki, 2012-ci ildə "Ödənişsiz hüquqi yardım haqqında" qanun layihəsi hazırlansa da, bu sənəd konsepsiya olaraq qalmışdır. Hesab edirik ki, bu sahədə qanun qəbul edilməsi məqsədəmüvafiqdir.

## Ədəbiyyat

1. Azərbaycan Respublikasının Cinayət-Prosessual Məcəlləsi. https://e-qanun.az/framework/46950
2. Azərbaycan Respublikasının Mülki-Prosessual Məcəlləsi. https://e-qanun.az/framework/46945
3. https://www.unodc.org/documents/justice-and-prison-reform/UN_principles_and_guidlines_on_access_to_legal_aid.pdf
4. https://www.unodc.org/documents/justice-and-prison-reform/LegalAid/Model_Law_on_Legal_Aid.pdf
5. Mülki və Siyasi Hüquqlar haqqında Beynəlxalq Pakt. https://www.migration.gov.az/content/pdf/5acb034968016_M%C3%BClki%20v%C9%99%20siyasi%20h%C3%BCquqlar%20haqq%C4%B1nda%20Pakt.pdf
6. Azərbaycan Respublikasının Konstitusiyası https://e-qanun.az/framework/897
7. http://www.lawreform.az/upload/file_17102012_az.pdf
8. Vəkillər və vəkillik fəaliyyəti haqqında Azərbaycan Respublikasının Qanunu. https://e-qanun.az/framework/257
9. https://rm.coe.int/access-to-justice-for-vulnerable-groups-in-azerbaijan-aze/1680a31565
10. https://www.justiceinitiative.org/uploads/f1742acc-fcac-4744-b894-bb553591429c/eu-legal-aid-poland-20150427.pdf
11. https://www.senato.it/documenti/repository/istituzione/costituzione_inglese.pdf
12. https://en.wikipedia.org/wiki/Legal_aid
13. https://www.gazzettaufficiale.it/eli/id/2021/01/30/21A00437/s/
14. https://www.unodc.org/documents/justice-and-prison-reform/LegalAid/GSLA_-_Country_Profiles.pdf
15. https://www.justiceinitiative.org/uploads/52a18cdc-4650-449b-a200-eb7f4c9a6934/eu-legal-aid-italy-20150427.pdf

Göndərilib: 10.10.2023 Qəbul edilib: 29.11.2023

DOI: https://doi.org/10.36719/2663-4619/97/77-83

**Vüqar Rufulla**
Azərbaycan Respublikasının Prezidenti yanında
Dövlət İdarəçilik Akademiyası
magistrant
vuqarrufulla60@gmail.com
**Oktay Səfərov**
Azərbaycan Respublikasının Prezidenti yanında
Dövlət İdarəçilik Akademiyası
magistrant
oktay.safarov.059@gmail.com
**Mirçıraq Həşimov**
Azərbaycan Respublikasının Prezidenti yanında
Dövlət İdarəçilik Akademiyası
magistrant
mirciraqhesimov@gmail.com

# SEÇKİ HÜQUQU VƏ ONUN TƏMİNİ MEXANİZMLƏRİ

**Xülasə**

Vətəndaşların siyasi hüquqlarından biri hesab edilən seçki hüququ öz əhəmiyyəti və mühümlüyü ilə digərlərindən fərqlənir. Bu hüququn təmini mahiyyət etibarı ilə demokratik cəmiyyətin əsas ünsürlərindən biri sayılır.

Belə ki, vətəndaşların öz seçki hüquqlarından istifadəsi nəticəsində dövlət hakimiyyəti orqanlarının seçkilər yolu ilə təşkilinə nail olunur ki, bu da həmin orqanların vətəndaşların iradəsi əsasında formalaşması və fəaliyyət göstərməsi kimi müsbət nəticələr verir. Bundan əlavə, seçkilər nəticəsində vətəndaşların siyasi fəallığına da nail olunur və dövlət, cəmiyyət üçün mühüm məsələlər məhz xalqın iradəsi nəzərə alınmaqla həll edilir. Seçki hüququnun təmini sahəsində əsas sənədlərdən biri ATƏM-in Kopenhagen Müşavirəsinin sənədi hesab edilir. Bu məqalədə vətəndaşların seçki hüququ və onun müdafiəsinin təmini ilə bağlı məsələlər, eyni zamanda bu sahədə beynəlxalq sənədlər və dövlətdaxili qanunvericilik aktları tədqiq edilmişdir.

***Açar sözlər:*** *seçki, seçki hüququ, referendum, vətəndaş, qanunvericilik*

**Vugar Rufulla**
The Academy of Public Administration under the
President of the Republic of Azerbaijan
master student
vuqarrufulla60@gmail.com
**Oktay Safarov**
The Academy of Public Administration under the
President of the Republic of Azerbaijan
master student
oktay.safarov.059@gmail.com
**Mirchirag Hashimov**
The Academy of Public Administration under the
President of the Republic of Azerbaijan
master student
mirciraghesimov@gmail.com

## Suffrage and the mechanisms of its provision


### Abstract

Suffrage, which is considered one of the political rights of citizens, differs from others in its significance and importance. Ensuring this right is essentially one of the main elements of a democratic society.

Thus, as a result of citizens' use of their electoral rights, the formation of state power bodies is achieved through elections, which gives positive results such as the formation and functioning of these bodies based on the will of citizens. In addition, political activity of citizens is achieved as a result of elections, and important issues for the state and society are resolved precisely by taking into account the will of the people. One of the main documents in the field of ensuring the right to vote is the document of the Copenhagen Council of the OSCE. In this article, the issues related to the right of citizens to vote and ensuring its protection, as well as international documents and domestic legislative acts in this field have been searched.


***Keywords:*** *election, suffrage, referendum, citizen, legislation*

### Giriş

İnsanlar doğulduğu andan onlarla bağlı olan və ayrılmaz, pozulmaz hüquqlara və azadlıqlara malik olurlar. Bu hüquqlar insanların var olması, cəmiyyətdə mövcud olan ən müxtəlif ictimai münasibətlərdə bir fərd kimi iştirak edə bilməsi üçün vacibdir. Hüquq və azadlıqlar şəxsin cəmiyyət və digər şəxslər qarşısında məsuliyyətini və vəzifələrini də əhatə edir. Eyni zamanda onlar siyasi, etnik, dini, milli, sosial və digər mənsubiyyətindən asılı olmayaraq hər bir şəxsə şamil edilir.

Ümumiyyətlə, hüquqları sistemləşdirsək, onların insan və vətəndaş hüquqları olaraq bölgüsünü apara bilərik. İnsan hüquq və azadlıqları hər bir halda fərdin doğulduğu andan ona məxsus olan hüquqlar hesab edilir. Vətəndaşın hüquqları isə insan hüquqlarından fərqli olaraq, şəxsin müəyyən dövlətin vətəndaşı olması ilə bağlıdır. Yəni bu hüquqlar dövlət tərəfindən məhz həmin dövlətin vətəndaşlarına şamil edilir, eyni zamanda dövlət tərəfindən qorunur.

Vətəndaş hüquqlarına, əsasən, siyasi məzmun daşıyan hüquqlar daxil olur. Bu da onların bilavasitə vətəndaşların ictimai-siyasi məsələlərin tənzimlənməsində iştirakının təmin olunması ilə bağlı elementləri özündə cəmləşdirməsi ilə əlaqəlidir. Belə hüquqlardan biri və ən mühümü də seçki hüququdur.

Seçki hüququ ən ümumi formada vətəndaşların seçmək və seçilmək hüququdur. Bu hüququn təmini demokratik cəmiyyətin əsas əlamətlərindən biri sayılır. Onun mühümlüyü ondan ibarətdir ki, məhz seçki hüququ sayəsində vətəndaşların dövlətin siyasi həyatında iştirakı, siyasi sistemin formalaşdırılması, seçkili hakimiyyət orqanlarının təşkili təmin edilir. Bu, eyni zamanda vətəndaşların digər hüquqlarının təmini üçün də əsasdır. Belə ki, seçki hüququnun önəmini nəzərə alan ABŞ Ali Məhkəməsinin 1964-cü ildə Reynolds Sims-ə qarşı qərarında da o, digər mülki və siyasi hüquqların qoruyucusu kimi qeyd edilirdi (Reynolds, 1964).

Seçki hüququ kompleks bir hüquq olaraq özündə bir neçə elementi birləşdirir:

- Vətəndaşların referendumda iştirak etmək hüququ;
- Vətəndaşların dövlət orqanlarına seçmək hüququ;
- Vətəndaşların seçilmək hüququ (Allahverdiyev, 2018: 49).

Bunlardan ilki vətəndaşların referendumda iştirakı ilə əlaqəlidir. Ümumxalq səsverməsi olan referendum ilə cəmiyyətin ictimai həyatında mövcud olan ən mühüm məsələlər bilavasitə vətəndaşların iştirakı ilə həll edilir. Referendum ilə bağlı məsələlər konstitusiya və seçki qanunları ilə tənzimlənir. Məsələn, Azərbaycan Respublikasının Konstitusiyasının 3-cü maddəsi referendumla bağlı normaları özündə əks etdirir. Konstitusiyanın 3.2-ci maddəsində yalnız referendumla həll olunan məsələlər göstərilmişdir ki, onlara aiddir:

- Azərbaycan Respublikası Konstitusiyasının qəbul edilməsi və ona dəyişikliklər edilməsi;
- Azərbaycan Respublikasının dövlət sərhədlərinin dəyişdirilməsi (Azərbaycan Respublikasının Konstitusiyası, 1995: 4).

Burada qeyd edilən məsələlərin öz mühümlük dərəcəsinə görə hər hansı dövlət orqanı vasitəsilə deyil, bilavasitə vətəndaşların özlərinin iştirakı ilə həll edilməsi zəruridir.

Seçki hüququna daxil olan digər element vətəndaşların seçmək hüququdur. Seçmək hüququ vətəndaşların seçdiyi namizədləri dövlət orqanlarına seçmək üçün belə seçkilərdə iştirak hüququnu özündə əks etdirir. Vətəndaşlar yerli özünüidarə orqanlarına (bələdiyyə orqanlarına) seçkilərdə də iştirak edə bilərlər.

Yuxarıda qeyd edilən ikinci element aktiv seçki hüququ da adlanır (Əsgərov, 2011: 200). Bu hüququn aktiv seçki hüququ adlanmasında əsas səbəb ondan ibarətdir ki, onun həyata keçirilməsi vətəndaşın öz hərəkətləri ilə mümkün olur. Belə hərəkətlərə aiddir: seçki məntəqəsinə gəlmək, bülleteni alıb onu doldurmaq, səs vermək istədiyi namizədləri, yaxud siyasi partiyanı seçərək, bülleteni seçki qutusuna atmaq. Ümumiyyətlə, aktiv seçki hüququna xalqın suveren hakimiyyətinin realizəsi məqsədilə ölkənin öz vətəndaşları malikdirlər. Lakin əcnəbi və vətəndaşlığı olmayan şəxslərin də müəyyən şərtlərlə seçkilərdə iştirakına yol verilir. Məsələn, Seçki Məcəlləsinə əsasən Azərbaycan Respublikası vətəndaşları üçün nəzərdə tutulan şərtləri ödəyən və əlavə olaraq Azərbaycan Respublikasında 5 ildən az olmayaraq daimi yaşayan vətəndaşlığı olmayan şəxslər Prezident seçkiləri, Milli Məclisə seçkilər, bələdiyyə seçkiləri və ya referendum zamanı səsvermədə iştirak edə bilərlər (Azərbaycan Respublikasının Seçki Məcəlləsi, 2003).

Sonuncu element isə vətəndaşların seçilmək hüququdur. Belə ki, vətəndaşlar sadəcə seçkilərdə iştirak edərək öz namizədlərini nümayəndəli orqanlara seçmək hüququna malik deyillər. Onlar özləri də nümayəndəli orqanlara və ya seçkili vəzifələrə seçkilərdə qanunla müəyyən olunmuş qaydada namizəd kimi iştirak edə bilərlər. Buna hüquq ədəbiyyatında passiv seçki hüququ da deyilir ki, bu halda seçki hüququ subyektiv xarakter daşıyır (Allahverdiyev, 2018: 49).

Yuxarıda da qeyd etdiyimiz kimi demokratik cəmiyyətin əsas ünsürlərindən olan seçkilərin önəmi təkcə ölkədaxili qanunvericiliklərdə deyil, müxtəlif beynəlxalq sənədlərdə də vurğulanmışdır. Belə ki, Ümumdünya İnsan Hüquqları Bəyannaməsinin 21-ci maddəsində qeyd edilmişdir: "Xalqın iradəsi hökumətin hakimiyyətinin əsası olmalıdır; bu iradə, vaxtaşırı və saxtalaşdırılmadan, ümumi və bərabər seçki hüququ əsasında, gizli səsvermə yolu ilə və yaxud səsvermə azadlığını təmin edən digər eynimənalı formalar vasitəsilə keçirilən seçkilərdə öz əksini tapmalıdır" (Ümumdünya İnsan Hüquqları Bəyannaməsi, 1948: 21).

Avropa İnsan Hüquqları Konvensiyasının 1 saylı Protokolunda da bu mövzuya toxunularaq üzv dövlətlərin üzərinə qanunverici hakimiyyət orqanını seçərkən xalqın iradəsini sərbəst ifadə edə biləcəyi şəraitdə ağlabatan dövriliklə gizli, azad seçkilər keçirmək kimi öhdəlik qoyulmuşdur (Avropa İnsan Hüquqları Konvensiyasının 1 saylı Protokolu, 1952: 3).

Bu normalara diqqət yetirsək hər birində seçkilərin həyata keçirilməsi ilə bağlı bəzi prinsiplərin əks olunduğunun şahidi olarıq. Ümumilikdə isə seçki hüququna aid olan prinsiplərə daxildir:

**Ümumi seçki hüququ**. Seçki hüququnun ən əsas prinsiplərindən hesab edilən bu prinsipə əsasən, irqindən, etnik mənsubiyyətindən, dilindən, cinsindən, gəlirindən, var-dövlətindən və s. xüsusiyyətlərindən asılı olmayaraq bütün yetkinlik yaşına çatmış şəxslərə səsvermə hüququ verilir (8). Müasir dövrdə yuxarıda qeyd olunan vətəndaşların geniş qrupuna bu hüquq aid edilsə də, tarixin müxtəlif dövrlərində bu hüquqa müxtəlif məhdudiyyətlər qoyulmuş, XX əsrin əvvəllərinə qədər isə dünyanın əksər hissəsində qadınların seçki hüququ tanınmamışdır.

Ümumi seçki hüququna aid bəzi senzlər bu gün də mövcud olsa da, bu senzlər qanunvericiliklə (konstitusiya və seçki qanunları) tənzimlənir. Bunlardan biri kimi yaş senzini qeyd edə bilərik. Bu senzə əsasən vətəndaşlar müəyyən yaş həddinə çatdıqdan sonra seçki hüququnu əldə edirlər. Yəni, yaş senzi vətəndaşın müəyyən yaşa çatması ilə seçki hüququna malik olmasını nəzərdə tutur. Demək olar ki, dünya ölkələrinin böyük əksəriyyətində olan bu senz tətbiq olunduğu ölkədən asılı olaraq 18-25 yaş arasında dəyişir. Azərbaycan Respublikasında seçkilərdə iştirak etmək üçün minimum yaş 18 yaş olaraq müəyyən edilmişdir (Azərbaycan Respublikasının Seçki Məcəlləsi, 2003)

Digər bir məhdudiyyət oturaqlıq senzi hesab edilir. Bu məhdudiyyətin mahiyyətində o dayanır ki, müəyyən dövlət daxilində keçirilən seçkilərdə həmin dövlətin ərazisində qanunla nəzərdə tutulan müddətdə yaşayan şəxslər iştirak edə bilərlər (8).

Bundan başqa, fəaliyyət qabiliyyətini itirmiş şəxslərin də seçkilərdə iştirakı məhdudlaşdırılır ki, Azərbaycan Respublikasında da fəaliyyət qabiliyyətsizliyi məhkəmə qaydasında təsdiq olunmuş şəxslərə bu şamil edilmişdir (Azərbaycan Respublikasının Seçki Məcəlləsi, 2003: 12.4).

Başqa bir məhdudiyyət seçkilərdə namizədliyini irəli sürən vətəndaşlara aid olan təhsil senzidir. Əmlak senzi isə müəyyən əmlaka malik olan və ya müəyyən olunmuş məbləğdə vergilərini ödəyən şəxslərin seçkilərdə iştirak etmək hüququ əldə etməsini nəzərdə tutur. Lakin müasir dövrdə bu senzdən əksər hallarda istifadə edilmir.

Seçki hüququna məhdudiyyətlərin dövlətlər tərəfindən müəyyən olunmasına münasibət beynəlxalq səviyyədə də müsbətdir. Məsələn, Avropa İnsan Hüquqları Məhkəməsinə görə seçki prosesində kifayət qədər yetkinləşmiş şəxslərin iştirakını təmin etmək üçün minimal yaş həddinin müəyyənləşdirilməsi mümkündür (9).

**Bərabər seçki hüququ.** Bərabər seçki hüququ dedikdə, vətəndaşların onlara heç bir fərq qoyulmadan bərabər əsasların qanunla təmin olunduğu şəraitdə seçkilərdə iştirakı başa düşülür. Bərabər seçki hüququnda prosesdə iştirak edən hər bir vətəndaşın səsi eyni, bərabər hüquqi qüvvə daşıyır. Yəni hər bir vətəndaşın bir səs vermək hüququ vardır. Seçki qanunvericiliyində bu prinsiplə bağlı vətəndaşların hər birinin səsinin eyni hüquqi qüvvəyə malik olduğu və hər bir vətəndaşın bir səsinin olduğu qeyd edilmişdir (Azərbaycan Respublikasının Seçki Məcəlləsi, 2003: 4). Bu hüquq sadəcə aktiv seçki hüququna aid deyil, həmçinin vətəndaşların seçilmək hüququna da aiddir.

**Birbaşa seçki hüququ**. Birbaşa seçki hüququna əsasən, vətəndaşlar seçkilərdə namizədin lehinə, referenduma çıxarılan məsələnin lehinə və ya əleyhinə şəxsən səs verirlər (Azərbaycan Respublikasının Seçki Məcəlləsi, 2003). Bu prinsip dünyanın əksər ölkələrində mövcuddur. Bununla vətəndaşların seçkilərdə namizədi seçən hər hansı şəxsə deyil, birbaşa namizədə öz qərarlarına uyğun səs verməsi təmin edilir (Əsgərov, 2011: 202).

Bunun əksi olan dolayı seçki sistemi də mövcuddur. Bu halda şəxslər seçkilərdə namizədlərini özləri seçmirlər, həmin namizədi təyin edəcək şəxslərə səs verirlər. Bu seçki növü ABŞ-də mövcuddur. Belə ki, vətəndaşlar burada ABŞ Prezidentini seçəcək şəxslərə səs verir, sonra da bu şəxslər prezidentliyə namizədlər arasından birinin seçilməsi ilə bağlı seçkilərdə iştirak edir (9).

**Seçkilərdə iştirakın sərbəstliyi**. Bu prinsipə görə, vətəndaşlar seçkilərdə iştirak ilə bağlı tamamilə sərbəstdirlər. Bu, onların hüququdur və vətəndaşlar onun realizə edilməsini könüllü surətdə həyata keçirirlər. Vətəndaşlar səsvermə prosesində də sərbəstdirlər. Yəni onlar istəsə səs verə bilər, istəmədiyi halda isə bundan imtina edə bilərlər. Bu prinsip də bəzi ölkələrdə tətbiq olunmur. Məsələn, Türkiyədə seçkilərdə iştirak etmək məcburi hesab edilir. Burada seçkilərdə iştirak etməyən şəxslərə qanunvericiliklə müəyyən olunmuş cəza tətbiq edilir.

**Şəxsi səsvermə**. Bu prinsipə görə vətəndaşlar səsvermədə yalnız öz adından səs verə bilərlər. Yəni onlar kiminsə yerinə bu prosesə daxil olub, həmin şəxsin adından səs verə bilməzlər. Hər bir vətəndaş öz hüququnu bilavasitə özü icra etməlidir. Vətəndaşlar başqalarının əvəzinə səs verdikdə və ya buna şərait yaratdıqda Azərbaycan Respublikasının Cinayət Məcəlləsində və ya İnzibati Xətalar Məcəlləsində göstərilən məsuliyyətə cəlb olunurlar.

**Gizli səsvermə**. Gizli səsvermə demokratiyanın əsas ünsürlərindən biri hesab edilməklə, vətəndaşın səsvermədə verdiyi səsin heç kəs tərəfindən öyrənilə və ya bu məqsədlə vətəndaşa hər hansı müdaxilə oluna bilinməzliyini özündə ehtiva edir. Səsvermə zamanı müvafiq yerə daxil olan vətəndaşdan hər hansı namizədə səs verməyi tələb etmək və ya xahiş etmək qanunvericiliklə qadağandır və bilavasitə bu prinsipin pozulması hesab edilir. Gizli səsvermə bu mənada səsvermənin sərbəstliyi ilə də bilavasitə əlaqəlidir (Əsgərov, 2011: 203).

Seçki hüququnun həyata keçirilməsi, eyni zamanda onun yuxarıda qeyd olunan prinsiplərinin pozulmasının qarşısının alınması məqsədilə bir sıra tədbirlər həyata keçirilir, qanunvericiliyə bununla bağlı bir sıra dəyişikliklər edilir. Demokratiyanın təməl daşlarından hesab edilən bu hüququn təmini zamanı ölkə daxilindəki mövcud siyasi, hüquqi mühit, tarixi şərait də nəzərə alınmalıdır. Belə ki, AİHM-ə görə "...hər hansı ölkənin seçki qanunvericiliyini həmin ölkənin siyasi təkamülü kontekstində qiymətləndirməyin zəruriliyi..." nəzərə alınmalı məsələlərdən biridir (11).

Həm beynəlxalq səviyyədə, həm də milli səviyyədə seçki hüququnun təmini və müdafiəsi üçün bir çox tədbirlər həyata keçirilir. BMT İnsan Hüquqları üzrə Ümumi Bəyannamənin 21-ci maddəsi, Mülki və Siyasi Hüquqlar haqqında Beynəlxalq Paktın 10 və 25-ci maddələri, İrqi Ayrı-seçkiliyin Bütün Formalarının Ləğv Edilməsi haqqında Konvensiyanın 5-ci maddəsində şəxslərin seçki hüququ ilə bağlı normalaar öz əksini tapmışdır.

Regional səviyyədə qəbul edilmiş sənədlərdən biri 1990-cı ilin iyununda baş tutmuş ATƏT-in (O dönəm ATƏM) Kopenhagen Müşavirəsinin sənədi hesab oluna bilər. Belə ki, bi sənədin 7-ci maddəsində iştirakçı dövlətlərin öz qanunvericilikləri ilə müəyyən edilmiş qaydada ağlabatan müddətlərdə mütəmadi seçkilər həyata keçirmək, bütün mandatların namizədlərin azad rəqabətinə dayanan seçkilərdə qazanılmasını təmin etmək; seçkilərdə iştirak etmək hüququna malik olan hər kəs üçün ümumi, bərabər seçki hüququnu təmin etmək, eyni zamanda gizli səsvermə keçirmək, nəticələri ədalətli şəkildə müəyyən etmək, onları rəsmi dərc etmək və digər seçki ilə bağlı yerinə yetirməli olduğu normalar öz əksini tapmışdır (Document of the Copenhagen Meeting of the Conference on the Human Dimension of the CSCE, 1990: 7). Eyni zamanda bu öhdəliklərin təmini ilə bağlı üzv dövlətlərin qanunvericiliklərini təkmilləşdirmək, müvafiq təsisatları yaratmaqla əlaqədar tədbirlər görməsi zəruri hesab edilmişdir.

Seçki ilə bağlı məsələlərin tənzimi və seçki hüququnun müdafiəsi ilə əlaqədar dövlətlər tərəfindən qanunlar qəbul edilsə də, əsas üstünlük bütün normaları özündə cəmləşdirən seçki məcəlləsinin qəbuluna verilir. Azərbaycan Respublikasında da seçki məsələlərinin həlli ilə bağlı vahid məcəllə qəbul edilmişdir. 27 may 2003-cü il tarixli Seçki Məcəlləsində seçkilərin keçirilməsi, vətəndaşların seçki hüququ, bu hüququn müdafiəsi ilə bağlı və digər normalar qeyd edilmişdir.

Seçki Məcəlləsində vətəndaşların seçki hüququnun təmini vasitələrindən biri kimi vətəndaşların seçki hüququnu pozan hərəkətlərdən (hərəkətsizlikdən) və qərarlardan şikayət edilməsi qaydası nəzərdə tutulmuşdur. Məcəllənin 112-ci maddəsinə əsasən müvafiq subyektlər vətəndaşların seçki hüquqlarını pozan qərar və hərəkətlərdən (hərəkətsizlikdən) həmin qərarın dərc edildiyi və ya alındığı, hərəkətin (hərəkətsizliyin) baş verdiyi gündən və ya maraqlı şəxsin bu haqda məlumat aldığı gündən başlayaraq 3 gün müddətində şikayət edə bilərlər.

Burada şikayət vermə hüququna malik subyektlərə seçicilər, namizədlər, qeydə alınmış namizədlərin, siyasi partiyaların, siyasi partiyalar bloklarının səlahiyyətli nümayəndələri və vəkil edilmiş şəxsləri, müşahidəçilər və seçki komissiyalarının üzvləri aid edilmişdir (Azərbaycan Respublikasının Seçki Məcəlləsi, 2003: 112).

Ölkəmizdə seçki hüququnun təmini ilə bağlı məsuliyyət tədbirlərinin tətbiqi də nəzərdə tutulmuşdur. Bununla bağlı Azərbaycan Respublikasının 20 iyun 2003-cü il tarixli, 30 dekabr 2003-cü il tarixli və 2 iyun 2008-ci il tarixli qanunları ilə Cinayət və İnzibati Xətalar məcəllələrinin vətəndaşların seçki hüquqlarının pozulmasına görə məsuliyyət müəyyən edən normalarına müvafiq əlavə və dəyişikliklər edilmişdir. Sonrakı illərdə də hər iki Məcəllədə bu istiqamətdə təkmilləşdirmələr aparılmışdır.

Azərbaycan Respublikasının Cinayət Məcəlləsinin aşağıdakı normaları bilavasitə bu hüququn müdafiəsinə istiqamətlənmişdir.

- seçki (referendumda iştirak) hüquqlarının həyata keçirilməsinə mane olma (159-cu maddə),
- seçkilərdə (referendumda) iştirak qaydalarını pozma (159-1-ci maddə),
- seçki (referendum) komissiyalarının işinə müdaxilə etmə və ya təsir göstərmə (160-cı maddə),
- seçki (referendumda iştirak) sənədlərini saxtalaşdırma, bilə-bilə səsləri düzgün hesablamama, yaxud səsvermənin gizliliyini pozma (161-ci maddə)
- seçkinin (referendumun) nəticələrinə təsir məqsədilə vəzifə səlahiyyətlərindən sui-istifadə etmə (308.2-ci maddə) (5)

Seçki Məcəlləsinin 115-ci maddəsində vətəndaşların seçki hüquqlarının pozulmasına görə məsuliyyətə cəlb edilə bilən şəxslər konkret olaraq müəyyən edilmişdir. Bununla bir növ pozuntulara qarşı adekvat tədbirlərin görülməsi prosesində subyektin müəyyənləşdirilməsi zamanı ola biləcək çətinliklərin aradan qaldırılmasına nail olunmuşdur. Həmin şəxslərin dairəsi Məcəllədə ətraflı şəkildə əks edilmişdir ki, onlardan bəzilərinə aiddir (Azərbaycan Respublikasının Seçki Məcəlləsi, 2003).

- zor tətbiqi ilə, aldatma, hədə ilə vətəndaşın seçmək və seçilmək hüququna mane olanlar;
- seçkinin (referendumun) nəticələrinə təsir məqsədi ilə vəzifə səlahiyyətlərindən sui-istifadə edənlər;
- namizədin lehinə imza atmağa vətəndaşları məcbur edən və ya namizədin müdafiəsi üçün imza yığılmasına mane olan və ya bu imzaların saxtalaşdırılmasında iştirak edən şəxslər;
- seçiciləri ələ alanlar, yəni bu Məcəllənin 88.6-cı maddəsi ilə qadağan edilmiş hərəkətləri edənlər;
- qeydə alınmış seçicilər barəsində məlumatları vaxtında rəsmiləşdirməyənlər və dəqiqləşdirməyənlər;
- namizədlər barəsində bilərəkdən yalan məlumatlar yayanlar və ya namizədlərin şərəf və ləyaqətini təhqir edən digər hərəkətləri edənlər (bu müddəa Azərbaycan Respublikası Konstitusiyasında təsbit edilmiş söz və fikir azadlığının məhdudlaşdırılması üçün əsas ola bilməz);
- seçkiqabağı təşviqatın aparılması qaydalarını pozanlar, o cümlədən səsvermə gününə bir gün qalmış və ya səsvermə günü təşviqat aparan şəxslər;
- bu Məcəllənin müəyyən etdiyi qaydaların pozulmasına səbəb olan kommersiya və digər reklamları hazırlayanlar və yayanlar yaxud xeyriyyə xidmətləri göstərənlər;
- səsvermənin gizliliyini pozanlar;
- seçiciləri öz iradələrinə zidd səs verməyə məcbur edənlər və s.

Bundan başqa Seçki Məcəlləsinin 116-ci maddəsində məntəqə və dairə seçki komissiyaları, Mərkəzi Seçki Komissiyasının müvafiq subyektlər barəsində qanun pozuntularına görə cərimənin tətbiqi üçün məhkəməyə müraciət etmək hüququ da nəzərdə tutulmuşdur (Azərbaycan Respublikasının Seçki Məcəlləsi, 2003).

## Nəticə

Mühümlüyü ilə digər hüquqlardan fərqlənən seçki hüququnun dövlətlər tərəfindən təmini beynəlxalq və regional səviyyədə qəbul edilmiş aktlarda nəzərdə tutulmuşdur. Belə sənədlərdən biri kimi 1990-ci il Kopenhagen Müşavirəsi sənədini göstərə bilərik ki, burada da üzv dövlətlərin öz üzərinə vətəndaşların seçki hüququnun düzgün qaydada həyata keçirilməsinə əsas olan öhdəlikləri götürməsi əks edilmişdir. Ümumiyyətlə, hər bir demokratik və hüquqi dövlət vətəndaşların seçki hüququnun təmin edildiyi şəraitdə seçkiləri mütəmadi olaraq həyata keçirməli, bu istiqamətdə qanunvericiliklərini təkmilləşdirməli və seçki hüququnun müdafiə mexanizmlərini müəyyən etməlidir. Azərbaycan Respublikasında seçki hüququ və onun təmini ilə bağlı qanunvericiliyin müddəaları beynəlxalq normalara uyğundur və qanunvericilikdə seçki hüququnun müdafiəsinin bir çox mütərəqqi mexanizmi əks edilmişdir. Lakin qanunvericilikdə seçki və seçki hüququ ilə bağlı məsələlər ətraflı şəkildə tənzimlənsə də, bəzən onların icrasında müəyyən problemlər yaranır. Məhz bu istiqamətdə seçki prosesi, seçki hüququnun təmini ilə bağlı müəyyən tənzimləmələrin nəzərdə tutulması həmin problemlərin həllində müsbət nəticələr əldə olunmasına köməklik göstərəcək.

## Ədəbiyyat

1. Reynolds, V.S. (1964). 377 U.S. 533.
2. Allahverdiyev, S. (2018). Azərbaycan Respublikası Konstitusiyasının və hüququnun əsasları. Bakı: Hüquq Yayın Evi, 452 s.
3. Azərbaycan Respublikasının Konstitusiyası. (1995). 12 noyabr.
4. Əsgərov, Z. (2011). Konstitusiya hüququ. Dərslik. Bakı, 760 s.
5. Azərbaycan Respublikasının Seçki Məcəlləsi. (2003). 27 may.
6. Ümumdünya İnsan Hüquqları Bəyannaməsi. (1948). 10 dekabr.
7. Avropa İnsan Hüquqları Konvensiyasının 1 saylı Protokolu. (1952). 20 mart.
8. https://az.wikipedia.org/wiki/Ümumi_seçki_hüququ
9. Hörst Birləşmiş Krallığa qarşı (№2), [BP], 74025/01, ECHR 2005-IX.
10. Əsgərov, Z. (2011). Konstitusiya hüququ. Dərslik. Bakı, 760 s.
11. https://www.usa.gov/election

DOI: https://doi.org/10.36719/2663-4619/97/84-91

**Sara Aliyeva**
The Academy of Public Administration under the
President of the Republic of Azerbaijan
master student
saraalievaa2@gmail.com
**Maryam Mammadova**
The Academy of Public Administration under the
President of the Republic of Azerbaijan
master student
maryam.mamedova2001@gmail.com
**Yagub Abdulla**
The Academy of Public Administration under the
President of the Republic of Azerbaijan
master student
abdullayev-yaqub@mail.ru

# CONSTITUTIONAL GUARANTEES OF RIGHTS AND FREEDOM OF HUMAN AND CITIZEN

**Abstract**

This article examines the relevance and importance of constitutional guarantees of the rights and freedom of individuals in contemporary society. The research aims to classify types of constitutional rights, define types of constitutional guarantees of rights and freedom, as well as analyze the mechanisms for protecting such guarantees and their actual impact in modern legal societies. To achieve these goals, the authors analyze the activities of state authorities in protecting constitutional guarantees. The role of constitutional norms and principles in safeguarding fundamental individual rights, preventing abuses of power, and uniting society around common values is emphasized. The authors provide a conceptual framework for constitutional guarantees of rights and freedom, distinguish them, determine their primacy and necessity among other types of guarantees, and analyze the mechanisms for guarantee protection. The theoretical propositions presented in the research can be utilized in further studies of the institute of constitutional guarantees of rights and freedom.

***Keywords:*** *guarantees, rights and freedom of human and citizen, Constitution, government bodies, mechanisms, protection and provision, legislation, law and order*

**Sara Əliyeva**
Azərbaycan Respublikasının Prezidenti yanında
Dövlət İdarəçilik Akademiyası
magistrant
saraalievaa2@gmail.com
**Məryəm Məmmədova**
Azərbaycan Respublikasının Prezidenti yanında
Dövlət İdarəçilik Akademiyası
magistrant
maryam.mamedova2001@gmail.com
**Yaqub Abdulla**
Azərbaycan Respublikasının Prezidenti yanında
Dövlət İdarəçilik Akademiyası
magistrant
abdullayev-yaqub@mail.ru

## İnsan və vətəndaş hüquq və azadlıqlarının konstitusiya təminatları


### Xülasə

Bu məqalədə müasir cəmiyyətdə insan və vətəndaş hüquq və azadlıqlarının konstitusiya təminatlarının aktuallığı və əhəmiyyəti müzakirə olunur. Tədqiqatın məqsədləri konstitusiya hüquqlarının növlərini təsnif etmək, hüquq və azadlıqların konstitusiya təminatlarının növlərini, habelə bu cür təminatlarının qorunması mexanizmlərini və müasir hüquqi cəmiyyətdə real təsirlərini müəyyənləşdirməkdir. Tədqiqatın məqsədlərinə çatmaq üçün müəlliflər tərəfindən konstitusiya təminatlarının qorunması sahəsində dövlət orqanlarının fəaliyyətini təhlil etmək vəzifəsi qoyulmuşdur. Konstitusiya norma və prinsiplərinin fərdin fundamental hüquqlarının müdafiəsinin təmin edilməsində, hakimiyyətdən sui-istifadə hallarının qarşısının alınmasında və cəmiyyətin ümumi dəyərlər ətrafında birləşməsində rolu vurğulanır. Müəlliflər hüquq və azadlıqların konstitusiya təminatlarının anlayışını verməyə, onları fərqləndirməyə, habelə digər təminat növləri arasında üstünlük və zəruriliyi müəyyənləşdirməyə, təminatların qorunması mexanizmlərini təhlil etməyə çalışdılar. Tədqiqat zamanı irəli sürülən nəzəri müddəalardan hüquq və azadlıqların konstitusiya təminatları İnstitutunun sonrakı tədqiqatlarında istifadə edilə bilər.


***Açar sözlər:*** *təminatlar, insan və vətəndaşın haqları və azadlıqları, Konstitusiya, hökumət orqanları, mexanizmlər, qoruma və təminat, qanunvericilik, qanun və qayda*

### Introduction

The relevance and importance of constitutional guarantees of the rights and freedom of individuals remain unchanged in modern society and are crucial for ensuring justice, legality, and the protection of fundamental individual rights, equality, and stability in the contemporary world. Constitutional guarantees serve as a mechanism to limit power, preventing its abuse. They establish boundaries for the actions of government bodies and protect citizens from arbitrariness and unlawful interference. The novelty and relevance of constitutional guarantees of rights and freedom of a man and citizen are evident in their ability to effectively respond to changing social and legal contexts, creating a sustainable and just legal foundation for modern society. The relevance of constitutional guarantees also stems from their alignment with international human rights norms. In the modern world, it is important for national constitutions to adhere to universally recognized standards, providing a unified level of protection for citizens' rights.

Constitutional guarantees serve as the foundation for protecting the fundamental rights and freedom of every individual and citizen. These guarantees create a structural framework ensuring that citizens can rely on the law and justice in the event of a violation of their rights. The implementation of human rights and freedom in the Russian Federation depends on the quality of the regulatory framework for public relations, the effectiveness of the activities of the organs ensuring the observance and protection of the rights and freedoms of citizens, as well as the presence of civil society in society itself (Romanovskaya, 2020: 52).

The Declaration of Independence, adopted during the period of the first democratic and secular state in the Muslim East - the Azerbaijan Democratic Republic, having the status of a constitutional act, for the first time enshrined a set of rights and freedom inherent to democratic states.

During the Azerbaijan SSR, Constitutions were adopted in 1921, 1927, 1937, and 1978, each outlining certain rights and freedom of individuals. The 1921 Constitution introduced the concept of Azerbaijani citizenship for the first time. The 1937 Constitution formally granted broad democratic rights and freedom to the citizens of Azerbaijan. Universal and direct voting rights were proclaimed. The Constitution of the independent Republic of Azerbaijan was adopted through a nationwide referendum on November 12, 1995. On August 24, 2002, March 18, 2009, and September 26, 2016, the first amendments to the Constitution of Azerbaijan were made through nationwide voting (referendum). The Constitution enshrines the fundamental rights and freedom for every individual and citizen.

The concept of constitutional rights: Constitutional, also known as fundamental, rights and freedom of an individual and citizen are inalienable rights and freedoms belonging to them from birth (in some cases - by virtue of citizenship), protected by the state, forming the basis of the legal status of an individual (Zharkov, 2006: 99). The constitutional and legal status of an individual represents their legally established position in society and the state, as defined by the norms of the national constitution and international humanitarian law. This status enables individuals to fully enjoy their natural, inalienable rights inherent to every person from birth.

The constitutional and legal status of a citizen encompasses political rights, freedom, and responsibilities. These are granted by the state with the aim of ensuring active participation in public governance and realizing the potential to engage without any restrictions in relationships with the state (Kazannik, 2015: 268). According to paragraph 2 of Article 24 of the Constitution of the Republic of Azerbaijan, everyone possesses inviolable, unassailable, and inalienable rights and freedoms from birth (4).

Constitutional rights and freedom of an individual and citizen provide a constitutionally guaranteed opportunity for an individual and citizen to enjoy various social benefits to satisfy their needs.

Constitutional rights and freedom have certain features that determine the legal nature of constitutional rights and freedom, distinguishing them among other types of rights and freedoms. These features include:

Supremacy: Constitutional rights and freedom have the highest force throughout the territory of the entire state. According to paragraph 6 of Article 71 of the Constitution of the Republic of Azerbaijan, on the territory of the Republic of Azerbaijan, the rights and freedoms of an individual and citizen are directly applicable.

No provision of the Constitution can be interpreted as aimed at abolishing the rights and freedoms of individuals and citizens. No legal act or decision contradicting constitutional rights and freedoms, as well as the overall provisions of the Constitution, has legal force. In case of a collision, the constitutional norm always prevails.

Only constitutional rights and freedom apply throughout the territory of the state concerning all citizens, foreigners, and stateless persons.

Constitutional rights, freedom, and duties enjoy enhanced legal protection. This is because all Constitution norms are under special state protection.

Constitutional rights and freedom serve as the legal basis for all other rights, freedoms, and duties established by legislation.

Constitutional rights and freedom of individuals and citizens have a continuously effective, uninterrupted nature. They can be limited by law to the extent necessary for the protection of the foundations of the constitutional order, the rights and legitimate interests of others, and the defense and security of the state.

Classification of constitutional rights. Rights and freedom are conditionally divided into three groups – personal, political, economic, social, and cultural. Chapter 3 of the Constitution of the Republic of Azerbaijan establishes the fundamental rights and freedoms of individuals and citizens. Some of these rights include (Shevchenko, 2009: 74):

Personal constitutional rights and freedoms:

Right to life;

Right to equality;

Right to freedom, personal inviolability, and the inviolability of private life;

Right to personal and family secrets;

Right to protect honor and dignity;

Right to national identity;

Right to use the native language;

Right to freedom of conscience;

Right to freedom of thought and speech;

Right to information;
Political constitutional rights and freedom:
Right to citizenship;
Right to association;
Citizens' right to participate in state governance;
Electoral right;
Right to petition.
Economic, social, and cultural rights and freedoms outlined in the Constitution:
Right to private property;
Right to work;
Right to rest;
Right to health protection;
Right to education;
Right to culture and creativity.

Thus, constitutional guarantees constitute a system of means, ways, and methods to ensure and protect the fundamental rights and freedom of individuals and citizens established in the norms of the Constitution. Constitutional guarantees of rights and freedoms encompass groups such as political, socio-economic, organizational, institutional, spiritual, and legal guarantees (Əsgərov, 2011: 106).

Political guarantees of rights and freedom of individuals and citizen represent the objective political conditions in the state and society, creating factual opportunities for the realization and effective protection of these rights and freedom. Including the diversity of political institutions, the development of civil society, democratic institutions, and forms of power, as well as their activity and legal regulation, these guarantees should be distinguished from formally declared ones at the constitutional level. Being an integral part of the constitutional order, these guarantees can be considered constitutional if they are not only enshrined in the text of the constitution but are also effectively aimed at ensuring the rights and freedom of individuals, maintaining a democratic legal regime, political stability, and civil concord, in line with modern scientific concepts regarding their nature and content.

Social-economic constitutional guarantees of rights and freedom of individuals and citizen constitute the fundamental and programmatic provisions of the development of the constitutional system, enshrined in the Constitution, as well as the existing favorable socio-economic conditions in the state and society that contribute to the realization of these rights and freedoms. These guarantees include stability and progressive economic development, state support and protection of all forms of property, profitable spheres of production and entrepreneurial activity, as well as the implementation of a balanced state policy in the development of the financial and credit system. The main focus should remain on a socially-oriented state policy based on the principles of equality before the law, respect for the rights and legitimate interests of social partnership, as well as the interaction of all members of civil society. These guarantees encompass areas such as healthcare, education, housing and communal services, providing benefits to various categories of socially vulnerable population, pension provision, stabilization of the demographic situation, tolerant national state policy, and ensuring a decent standard of living for every individual and citizen.

Organizational and institutional guarantees of rights and freedom of individuals and citizen are aimed at creating optimal conditions for ensuring these rights and freedom, as well as mechanisms for their protection and restoration. This includes the formation of a system of state bodies, institutions, and public organizations engaged in activities related to human rights. These include judicial bodies, the prosecutor's office, human rights ombudsmen, trade unions, human rights NGOs, and others. Measures taken by the state to ensure the comprehensive realization of rights and freedom include state programs for socio-economic development, support for specific categories of citizens, and the provision of certain groups of rights. This also involves the adoption

of special legislative acts in the field of public relations and the formation of specific mechanisms for their implementation.

Legal guarantees of rights and freedom of individuals and citizen constitute a set of interconnected legal means established by the Constitution, ensuring the protection of these rights and freedom. They include normative, procedural, institutional, and organizational aspects. Normative guarantees are based on a system of laws and provisions defining the legal status of individuals in this area. Procedural guarantees are related to the legal order and procedures, including judicial and other processes. Legal guarantees are further divided into two groups: formal-legal and institutional guarantees.

Formal-legal guarantees involve normative enactment (directly in the Constitution of the Republic of Azerbaijan and other laws) and other provisions aimed at ensuring rights and freedoms.

However, despite the significance of formal-legal guarantees, the leading role in the protection of rights and freedoms belongs to institutional guarantees. If a person in a particular state lacks the real opportunity to defend and restore their rights, formal-legal guarantees lose their value.

Institutional guarantees encompass various state bodies to which individuals turn for the protection of their rights, as well as procedural guarantees ensuring the protection of rights and freedoms (judicial procedures, procedures for amnesty and pardon, etc.).

Two methods of implementing rights and freedom are distinguished:

*Natural method*: Implementation of rights and freedoms without the need for permission or notification to any authorities. This includes freedom of thought and speech, freedom of conscience, property rights, participation in cultural life and creativity, etc.

*Notification Method*: This method is associated with the necessity to obtain permission from competent state authorities to exercise certain rights and freedoms (e.g., the right to strike, for specific types of entrepreneurial activities, freedom of assembly, visiting specific areas and objects, etc.).

Spiritual guarantees of rights and freedoms of individuals and citizen, established as the foundations and programmatic provisions of the development of the constitutional system in the norms or separate provisions of the Constitution, as well as existing factually favorable political, socio-economic, and other conditions in the state and society, contribute to creating factual opportunities for the realization of spiritual rights and freedoms. These include cultural, moral, aesthetic, religious, intellectual, and other legitimate interests in this area, as well as their effective protection (Fokina, 2011: 233).

The executive, legislative, and judicial authorities are tasked with ensuring and protecting the rights and freedoms of individuals. The Constitution of the Republic of Azerbaijan defines specific mechanisms for ensuring and protecting constitutional rights and freedoms, which include:

1. The President of the Republic of Azerbaijan.
2. Prosecution authorities, responsible for promptly responding to any violations of laws in the Republic of Azerbaijan.
3. The Commissioner for Human Rights, whose status is enshrined in the Constitutional Law of the Republic of Azerbaijan dated December 28, 2001, "On the Commissioner for Human Rights (Ombudsman) of the Republic of Azerbaijan".
4. Various executive authorities (internal affairs, justice, health, education, transport, etc.), tasked with resolving issues raised by citizens.
5. All other state and non-governmental organizations.

According to Article 8 of the Constitution, the President of the Republic of Azerbaijan is the Head of the Azerbaijani state. The President plays a crucial role in this mechanism, serving as the head of the state and a guarantor of constitutional rights and freedom of individuals. The President can and should use all authority and opportunities in this regard. The staff of the presidential structure, the Presidential Administration, consistently handles written appeals from citizens to the President, organizing receptions to assist them in realizing their rights.

edilməsi, iqtisadi fəaliyyət üçün əlverişli şəraitin yaradılması və mülkiyyətlərin bütün növlərinn mühafizəsi və s.

İnsan hüquqlarının məhdudlaşdırıla bilməsi ideyası hələ 1789-cu ildə Fransada qəbul olunmuş İnsan və vətəndaş hüquqları Bəyannaməsində təsbit edilmişdi. Bəyannamənin 4cü maddəsində deyilirdi: «Azadlıq başqasına zərər vurmayan hər şeyi etmək imkanından ibarətdir; beləliklə, hər bir insanın təbii hüquqlarının həyata keçirilməsi yalnız cəmiyyətin digər üzvlərinin həmin hüquqlardan istifadəsini təmin edən hədlərlə məhdudlaşır. Bu hədlər yalnız qanunla müəyyən edilə bilər» (İnsan və Vətəndaş Hüquqları üzrə Fransa Bəyannaməsi, 1789: 46).

Bu vacib müddəalar Ümumdünya İnsan Hüquqları Bəyannaməsinin 29-cu maddəsinin II hissəsində də öz əksini tapmışdır. Həmin maddədə deyilir: «Hər bir insan öz hüquq və azadlıqlarını həyata keçirərkən yalnız o məhdudiyyətlərə məruz qala bilər ki, onlar müstəsna olaraq, başqalarının hüquq və azadlıqlarının lazımi qaydada tanınması və onlara hörmət edilməsinin təmin edilməsi və demokratik cəmiyyətdə əxlaq qaydalarının, ictimai qaydanın və ümumi rifahın ədalətli tələblərinin ödənilməsi məqsədi ilə qanunla müəyyən edilmişdir» (Ümumdünya İnsan Hüquqları Bəyannaməsi, 1948: 6).

Göstərilən müddəanın əsasında belə bir məlum ideya dayanır ki, insan cəmiyyətində fərdin hüquqları heç bir halda qeyri-məhdud və mütləq başa düşülə bilməz. Hər bir hüquqi, demokratik dövlətdə müəyyən məhdudiyyətlərin olması zəruridir. Onlarsız cəmiyyətdə ümumi qaydaların, toplumun bütün üzvlərinin əsas hüquq və azadlıqlarına hörmətin təmin edilməsi mümkün deyildir (Abdullayev, 2011: 1).

Hüquqi məhdudiyyətlər insanın maneəsiz olaraq öz fikirlərini qorumaq, bu fikirləri yazılı və şifahi şəkildə mətbuatda, yaxud öz seçiminə görə digər üsullarla ifadə etmək hüququnu nəzərdə tutan mülki və siyasi hüquqlar haqqında Beynəlxalq Paktın 19-cu maddəsində göstərilir. 19-cu maddənin 3-cü hissəsində qeyd olunur ki, bu hüquqlardan istifadə edilməsi insan üzərinə xüsusi vəzifə və məsuliyyət qoyur (İnsan hüquqlarının və əsas azadlıqlarının müdafiəsi haqqında Konvensiya, 1950: 65).

Avropada mövcud olan insan hüquqlarının müdafiəsi mexanizminin əsasını «İnsan hüquqlarının və əsas azadlıqlarının müdafiəsi haqqında» 1950-ci il tarixli Konvensiya təşkil edir. Bu sənədin insan hüquqlarının qorunmasına dair beynəlxalq standartların bərqərar olunması istiqamətində müstəsna rolu olmuşdur. Təsadüfi deyildir ki, Konvensiyanın 8-11-ci maddələrinin 2-ci hissələri və 4 nömrəli protokolun 2-ci maddəsinin üçüncü və dördüncü hissələrində müvafiq insan hüquqları üçün yol verilən məhdudiyyətlər nəzərdə tutulmuşdur. Belə ki:

1) Şəxsi və ailə həyatına hörmət hüququ adlanan 8-ci maddədə qeyd edilir:

Hər kəs öz şəxsi və ailə həyatına, mənzilinə və yazışına sirrinə hörmət hüququna malikdir. Milli təhlükəsizlik və ictimai asayiş, ölkənin iqtisadi rifah maraqları naminə, iğtişaşın və ya cinayətin qarşısını almaq üçün sağlamlığı, yaxud mənəviyyatı mühafizə etmək üçün və ya digər şəxslərin hüquq və azadlıqlarını müdafiə etmək üçün qanunla nəzərdə tutulmuş və demokratik cəmiyyətdə zəruri olan hallar istisna olmaqla, dövlət hakimyyəti orqanları tərəfiındən bu hüququn həyata keçirilməsinə mane olmağa yol verilmir (İnsan hüquqlarının və əsas azadlıqların müdafiəsi haqqında Konvensiyasının 4 saylı Protokolu, 1963: 1).

2) Fikir, vicdan və din azadlığı adlanan 9-cu maddədə göstərilir:

Hər kəsin fikir, vicdan və din azadlığı hüququ var: bu hüquqa Öz dinini və əqidəsini və ya əqidəsini dəyişmək azadlığı, öz dininə və ya əqidəsinə həm təkbaşına və başqaları ilə birlikdə etiqad etmək və açıq yaxud şəxsi qaydada ibadəti, təlimləri, dini və mərəsim ayinlərini yerinə yetirmək azadlıqları daxildir. Öz dininə və baxışlarına etiqad etmək azadlığı yalnız ictimai əsayiş maraqları naminə, ictimai qaydanı, sağlamlığı yaxud mənəviyyatı qorumaq üçün və ya digər şəxslərin hüquq və azadlıqlarını müdafiə etmək üçün qanunla nəzərdə tutulmuş və demokratik cəmiyyətə zəruri olan məhdudiyyətlərə məruz qala bilər (İnsan hüquqlarının və əsas azadlıqların müdafiəsi haqqında Konvensiyasının 4 saylı Protokolu, 1963: 1).

3) İfadə etmək (ekspression) azadlığı adlanan 10-cu maddədə qeyd edilir :

Hər kəs ifadə etmək azadlığı hüququna malikdir. Bu hüquqa öz rəyində qalmaq azadlığı, dövlət hakimiyyəti orqanları tərəfindən hər hansı maneçilik olmadan və dövlət sərhədlərindən asılı olmayaraq, məlumat və ideyaları almaq və yaymaq azadlığı daxildir. Bu maddə dövlətlərin radioyayım, televiziya və kinematoqrafiya

müəssisələrinə lisenziya tələbi qoymasına mane olmur. Bu azadlıqların həyata keçirilməsi milli təhlükəsizlik, ərazi bütövlüyü və ya ictimai asayiş maraqları naminə, iğtişaşın və ya cinayətin qarşısını almaq üçün, sağlamlığın, yaxud mənəviyyatın mühafizəsi üçün, digər şəxsin nüfuzu və hüquqlarının müdafiəsi üçün gizli əldə edilmiş məlumatların açıqlanmasının qarşısını almaq üçün və ya ədalət mühakiməsinin nüfuz və qərəzsizliyini təmin etmək üçün qanunla nəzərdə tutulmuş və demokratik cəmiyyətdə zəruri olan müəyyən formallıqlara, şərtlərə, məhdudiyyətlərə və ya sanksiyalara məruz qala bilər (İnsan hüquqlarının və əsas azadlıqların müdafiəsi haqqında Konvensiyasının 4 saylı Protokolu, 1963: 1).

4) Yığıncaqlar və birləşmək azadlığı adlı 11-ci maddədə göstərilir :

Hər kəsin dinc toplaşmaq azadlığı və öz maraqlarını müdafiə etmək üçün həmkarlar ittifaqları yaratmaq və onlara qoşulmaq hüququ da daxil olmaqla başqaları ilə birləşmək azadlığı hüququ vardır. Bu hüquqların həyata keçirilməsinə milli təhlükəsizlik və ictimai asayiş maraqları naminə, iğtişaşın və cinayətin qarşısını almaq üçün, sağlamlığın və mənəviyyatın mühafizəsi üçün və ya digər şəxşlərin hüquq və azadlıqlarının müdafiəsi üçün qanunla nəzərdə tutulmuş və demokratik cəmiyyətə zəruri olanlardan başqa heç bir məhdudiyyətlər qoyula bilməz. Bu maddə silahlı qüvvələr, polis və ya inzibati dövlət orqanları üzvlərinin belə hüquqlarının həyata keçirilməsinə qanuni məhdudiyyətlər qoyulmasına mane olmur (İnsan hüquqlarının və əsas azadlıqların müdafiəsi haqqında Konvensiyasının 4 saylı Protokolu, 1963: 1).

Bununla yanaşı Konvensiyanın 4 saylı protokolunun 2-ci maddəsində hərəkət etmək azadlığı təsbit olunmuş və qeyd edilmişdir ki, Qanuni əsaslarla hər hansı dövlətin ərazisində olan hər kəsin həmin ərazidə sərbəst hərəkət etmək və özünə yaşayış yeri seçmək hüququ vardır və Hər kəs öz ölkəsi də daxil olmaqla hər hansı ölkəni tərk etməkdə azaddır. Bu hüququn məhdudlaşdırılmasına dair 3-cü və 4-cü bəndində göstərilir : Bu hüquqların həyata keçirilməsinə milli təhlükəsizlik və ictimai asayiş maraqları naminə, ictimai qaydanı qorumaq üçün, cinayətin qarşısını almaq üçün, sağlamlığın və mənəviyyatın qorunması üçün və ya digər şəxslərin hüquq və azadlıqlarının müdafiəsi üçün qanunla nəzərdə tutulmuş və demokratik cəmiyyətdə zəruri olanlardan başqa heç bir məhdudiyyət qoyula bilməz.Birinci bənddə təsdiq edilmiş hüquqlar müəyyən ərazilərdə qanuna müvafiq olaraq tətbiq edilən və demokratik cəmiyyətdə ictimai maraqlarla əsaslandırılan məhdudiyyətlərə məruz qala bilər (Azərbaycan Respublikasının Konstitusiyası, 1995).

İnsan və vətəndaşın hüquq və azadlıqlarının məhdudlaşdırılmasının konstitusion tənzimində əsas məsələlərdən biri həmin hüquqların məhdudlaşdırılması prinsipləridir. Məhz konstitusion-hüquqi normalar məhdudiyyət ölçülərinin tətbiqini müəyyən edən əsas müddəaları təsbit edirlər. İnsan və vətəndaşın hüquq və azadlıqlarının məhdudlaşdırılması prinsipləri dedikdə, məhdudlaşdırdığı tədbirlərin tətbiqini müəyyənləşdirən əsas başlanğıc müddəaları başa düşmək lazımdır. Məhdudlaşdırma prinsiplərinin istifadəsi hüquqların məhdudiyyəti hədlərini, həmçinin dövlət üçün hüquq və azadlıqların məhdudlaşdırılması sərhədlərini müəyyən etməyə imkan verir. «İnsan Hüquqları üzrə Ümumi Bəyannamə»də (maddə29), «Mülki və Siyasi hüquqlar haqqında Beynəlxalq Pakt»da (maddə19), «İnsan hüquq və azadlıqlarının müdafiəsi haqqında Avropa Konvensiyası»nda (maddə11, 2-ci hissə) və digər beynəxalq hüquqi aktlarda, həmçinin Azərbaycan Respublikasının Konstitusiyasında, «İnsan və vətəndaşın hüquq və azadlıqlarının həyata keçirilməsinin tənzimlənməsi haqqında» Azərbaycan Respublikasının Konstitusiya qanununda aşağıdakı prinsiplər təsbit olunmuşdur (Ələsgərov, 1993: 29):

1) **İnsan hüquq və azadlıqlarına hörmət və təminat prinsipi.**

Kostitusiyaya uyğun olaraq, insan və vətəndaşın hüquq və azadlıqlarının təmin edilməsi dövlətin ali məqsədidir (maddə12, 1-ci hissə), onları gözləmək və qorumaq isə dövlət hakimiyyəti orqanlarının borcudur. (maddə71, 1ci hissə)

Qeyd etmək lazımdır ki, bu prinsip ümumidir və dövlətin xüsusi hüquqi rejimləri dövründə də öz qüvvəsini saxlamış olur.

2) **Zərurət prinsipi.** «Mülki və Siyasi hüquqlar haqqında Beynəlxalq Pakt»ın 19-cu maddəsinin 3-cü bəndində qeyd olunub ki, bu hüquqlardan istifadə olunması xüsusi vəzifələr qoyur və məsuliyyət yaradır. Deməli, bu qanunla təyin olunan məhdudiyyətlərlər müşayiət oluna bilər (Ələsgərov, 1993: 19):

a) digər şəxslərin hüquq və nüfuzuna hörmət üçün zəruridir; (Səfixanlı, 2003: 128)

b) dövlət təhlükəsizliyi, ictimai asayiş, əhalinin sağlamlığı və ya mənəviyyatını mühafizə etmək üçün lazımdır.

3) **Məhdudiyyətlərin hüquqi formada təsbit olunması prinsipi.** Bu prinsipə görə hüquq və azadlıqlar yalnız qanunla məhdudlaşdırıla bilər;

4) **Proporsionallıq prinsipi.** İnsan və vətəndaşın hüquq və azadlıqları yalnız göstərilən məqsədlərə nail olmaq üçün lazım gələn ölçüdə məhdudlaşdırıla bilər.

5) **Məhdudiyyətlərin bərabərliyi prinsipinə riayət.** "İnsan hüquqlarının və əsas azadlıqlarının müdafiəsi haqqında Konvensiya"nın 14-cü maddəsində qeyd edilir ki, Bu konvensiyada təsbit olunmuş hüquq və azadlıqlardan istifadə cins, irq, rəng, dil, din, siyasi və digər baxışlar, milli və ya sosial mənşə, milli azlıqlara mənsubiyyət, əmlak vəziyyəti, doğum və ya digər status kimi hər hansı əlamətlərinə görə ayrı-seçkilik olmadan təmin olunmasıdır. Bu normaya görə, əgər məhdudiyyətlər varsa, deməli onlar göstərilən əlamətlərdən asılı olmayaraq hər kəs üçün bərabərdir, yəni hər kəs bərabər ölçüdə azadlıqla təmin olunur (Belgium, 1979: 32).

6) **Qanunverici tərəfindən təyin olunan məhdudiyyətlərin beynəlxalq hüquq normalarına uyğunluğu prinsipi.** Bu prinsipə əsasən əsas qanunda təsbit olunmuş hüquq və azadlıqlar beynəlxalq sazişlərə uyğun şəkildə təsbit edilir (Artico, 1980: 50).

## Nəticə

Qeyd etdiyimiz kimi, insan hüquq və azadlıqlarının məhdudlaşdırılması yəni cəmiyyətdə insanın azadlığının hüdudlarının müəyyən edilməsi şübhəsiz ki, insan və dövlət arasındakı münasibətlərin vacib aspektlərindən biridir. Lakin belə məhdudiyyətlərin tətbiqi dövlət tərəfindən gözlənilən nəticəyə mütənasib olmalıdır. Bu məqsədlə hüquq və azadlıqların məhdudlaşdırılmasına dair mövcud qanunvericilik daim təkmilləşdirilməli, bu məhdudiyyətlərin nəzəri və praktiki tətbiqində zamanı yarana biləcək boşluqlar, səlahiyyətdən sui-istifadə nəticəsində hüquqların və azadlıqların qanunsuz olaraq məhdudlaşdırılması halları aradan qaldırılmalıdır. Çünki insan və vətəndaş hüquqlarının qorunmadığı bir cəmiyyətdə hüquqi dövlət və vətəndaş cəmiyyəti anlayışlarından söhbət gedə bilməz.

## Ədəbiyyat


1. https://www.pa.edu.az/library/3/28/217_movzu_9._insan_ve_vetendashin_huquq_ve_azadliqlarinin.pdf
2. İnsan və Vətəndaş Hüquqları üzrə Fransa Bəyannaməsi. (1789). 46 s.
3. Ümumdünya İnsan Hüquqları Bəyannaməsi. (1948). 6 s.
4. Abdullayev, M. (2011). Azərbaycan Respublikasında insan hüquq və azadlıqlarının konstitusion əsasları. 5 s.
5. Mülki və Siyasi Hüquqlar Haqqında Beynəlxalq Pakt. (1966). 14 s.
6. İnsan hüquqlarının və əsas azadlıqlarının müdafiəsi haqqında Konvensiya. (1950). 65 s.
7. İnsan hüquqlarının və əsas azadlıqların müdafiəsi haqqında Konvensiyasının 4 saylı Protokolu. (1963). 3 s.
8. Azərbaycan Respublikasının Konstitusiyası. (1995). https://e-qanun.az/framework/897
9. Ələsgərov, F.M. (1993). Azərbaycan Respublikasının Konstitusiyası və insan hüquqları «İnsan hüquqları». Bakı: Bülleten. № 1, 29 s.

10. Səfixanlı, A. (2003). İnsan hüquqlarının və əsas azadlıqların müdafiəsi haqqında Avrpa Konvensiyasında insan hüquq və azadlıqları ilə bağlı müddəaların Azərbaycan Respublikasının qanunvericilik sistemində təsbiti. Bakı: Azərnəşr, 128 s.
11. Belgium, M. (1979). Publications of the European Court of Human Rights, Series A. №31, 32 p.
12. Artico, V. (1980). Publications of the European Court of Human Rights Series A. №37, 50 p.

Göndərilib: 05.09.2023 Qəbul edilib: 11.11.2023

DOI: https://doi.org/10.36719/2663-4619/97/124-129

**Firəngiz Səlimli**
Azərbaycan Respublikasının Prezidenti yanında
Dövlət İdarəçilik Akademiyası
magistrant
fira.selimli2001@gmail.com
**Yağmur Hüseynova**
Azərbaycan Respublikasının Prezidenti yanında
Dövlət İdarəçilik Akademiyası
magistrant
h.yaghmur.78@gmail.com
**Ləman Daşdəmirova**
Azərbaycan Respublikasının Prezidenti yanında
Dövlət İdarəçilik Akademiyası
magistrant
lamandashdamir@gmail.com

# VƏKİL ARAŞDIRMASINDA XÜSUSİ BİLİKLƏRİN TƏTBİQİ MƏSƏLƏLƏRİ

**Xülasə**

"Vəkillər və vəkillər fəaliyyəti haqqında" Azərbaycan Respublikası Qanununun 15-ci maddəsi vəkillərin hüquqlarını tənzimləyir və ədalət mühakiməsinin əsas prinsiplərini müəyyən edir. Vəkillər müstəqillik prinsipinə uyğun olaraq qanunvericiliklə müəyyən edilmiş qaydada hüquqi yardım göstərmək, müştərilərini təmsil etmək və fəaliyyətlə məşğul olmaq hüququna malikdirlər. Onların peşəkar fəaliyyətləri zamanı müstəqil araşdırmalar aparmaq, sənədlər toplamaq, ekspert rəyləri almaq və texniki vasitələrdən istifadə etmək səlahiyyəti var. Onlar həmçinin daşınmaz əmlakın dövlət reyestrindən məlumat tələb etmək və qorunan şəxslə maneəsiz əlaqə saxlamaq hüququna malikdirlər. Hüquqşünaslar qanunvericiliyə uyğun olaraq, müştərilərini ən yaxşı şəkildə təmsil etmək üçün lazımi addımları ata bilərlər. Qanun qanunun aliliyini qorumaq və ədalətli hüquq sisteminin fəaliyyətini təmin etmək məqsədi daşıyır. Bu hüquqlar vəkillərə öz peşələrini etik dəyərlərə uyğun şəkildə həyata keçirməyə imkan verir. Azərbaycanda hüququn əsas prinsiplərini tənzimləyən bu maddə ədalətə və qanunun düzgün işləməsinə öz töhfəsini verir.

***Açar sözlər:*** *vəkil, hüquq, bilik, məhkəmə, məcəllə, hüquq-mühafizə orqanları*

**Firangiz Salimli**
The Academy of Public Administration under the
President of the Republic of Azerbaijan
master student
fira.selimli2001@gmail.com
**Yagmur Huseynova**
The Academy of Public Administration under the
President of the Republic of Azerbaijan
master student
h.yaghmur.78@gmail.com
**Laman Dashdamirova**
The Academy of Public Administration under the
President of the Republic of Azerbaijan
master student
lamandashdamir@gmail.com

## Issues of application of specialized knowledge in lawyer research


### Abstract

Article 15 of the Law of the Republic of Azerbaijan "On Lawyers and Lawyers' Activity" regulates the rights of lawyers and defines the basic principles of justice. Lawyers have the right to provide legal assistance, represent their clients and engage in activities in accordance with the principle of independence, as determined by legislation. They have the authority to conduct independent research, collect documents, obtain expert opinions and use technical tools in the course of their professional activities. They also have the right to request information from the state register of immovable property and to have unhindered contact with the protected person. Lawyers can take the necessary steps to best represent their clients in accordance with the law. The law aims to protect the rule of law and ensure the functioning of a fair legal system. These rights allow lawyers to practice their profession in accordance with ethical values. This article, which regulates the basic principles of law in Azerbaijan, contributes to justice and the proper functioning of the law.


***Keywords:*** *lawyer, law, knowledge, court, code, law enforcement agencies*

### Giriş

Hüquq həyatın bir çox sahələrini tənzimləyən və fərdlərin haqlarını qoruyan mürəkkəb sistemdir. Buna görə də hüquqi problemlərlə qarşılaşdıqda ekspert məsləhətinə müraciət etmək qaçınılmazdır. Hüquqşünas tədqiqatlarında ekspert biliklərinin tətbiqi hüquqi problemlərə daha dərindən yanaşmaq və daha səmərəli həll yolları tapmaq məqsədi daşıyır.

Vəkillərin ümumi hüquqi bilikləri və təcrübəsi onlara hüquqi problemlərə hərtərəfli yanaşma təklif etməyə imkan verir. Əsas hüquqi məsələlər üzrə möhkəm bilik bazası vəkillərə müştərilərinə geniş spektrli xidmətlər göstərməyə imkan verir. Bura mülki hüquq, cinayət hüququ, ailə hüququ, əmək hüququ kimi ümumi sahələr daxildir. Ümumi bilik və təcrübə vəkilin hüquqi məsələləri anlamaq və həll etmək bacarığını təmin edir.

Hər bir vəkilin müəyyən bir ixtisas sahəsində dərinləşməsi onlara hüquqi məsələlərdə daha konkret və effektiv həllər təklif etməyə imkan verir. Məsələn, əqli mülkiyyət hüquqşünası əqli mülkiyyət hüquqları ilə bağlı mürəkkəb məsələlər haqqında xüsusi biliyə malik ola bilər. Bu xüsusi təcrübə müştərinin ehtiyaclarını daha birbaşa və effektiv şəkildə həll etməyə imkan verir.

Vəkilin keçmiş işlərlə bağlı təcrübəsi onun hüquqi problemləri həll etmək qabiliyyətini dərinləşdirir. Praktik biliklər nəzəri biliklərdən praktikada istifadə etmək bacarığına aiddir. Bu, vəkilə üzləşdiyi çətinlikləri daha effektiv həll etməyə və müştərisinin maraqlarını müdafiə etməyə kömək edir.

"Vəkillər və vəkillik fəaliyyəti haqqında" Azərbaycan Respublikası Qanununun 15-ci maddəsi və Azərbaycan Respublikası Cinayət Prosessual Məcəlləsinin 92-ci maddəsi çərçivəsində vəkilin xüsusi bilik tələb edən məsələlərin araşdırılması üçün ekspertlərdən və ya mütəxəssislərdən rəy almaq hüququ təsbit edilmişdir. Bu hüquq, şübhəli və ya təqsirləndirilən şəxsin müdafiəsinin həyata keçirilməsi ilə əlaqədar məsələlərin aydınlaşdırılması üçün sübutların toplanması üçün tədbirlər həyata keçirmək, cinayət təqibi xüsusi ittiham qaydasında həyata keçirildiyi halda fiziki və hüquqi şəxslərin razılığı ilə onları sorğu-suala tutmaq, habelə müqavilə əsasında ekspertin rəyini almaq və mütəxəssisin fikrini öyrənmək hüququ olaraq təyin edilmişdir (Cinayət prosesində vəkil araşdırması: terminin formalaşma mərhələləri, 2012: 281-284).

Həmin Məcəllənin 97.1.-ci maddəsində isə ekspertin yalnız cinayət prosesini həyata keçirən orqan və ya onun tələbi ilə ekspert müəssisəsinin rəhbərliyi tərəfindən təyin edilmiş şəxs olması təsbit olunur. Bu isə müdafiəçi-vəkil tərəfindən və ya vəkilin sifarişi ilə ekspert müəssisəsinin ekspert təyin etməsini mümkün qılmır. Cinayət Prosessual Məcəlləsinin bu maddəsinin dəyişdirilməsi, müdafiəçinin ekspert rəyi almaq hüququnun reallaşdırılması üçün vəkil tərəfindən ekspert müəssisəsinin təyin edilməsinə imkan verəcək bir dəyişiklik tələb edir (Cinayət mühakimə icraatında müdafiə funksiyasının məzmunu barədə, 2015: 171-178).

"Dövlət Məhkəmə ekspertizası fəaliyyəti haqqında" Azərbaycan Respublikasının Qanunu əsasında isə məhkəmə ekspertizası tədqiqat, ibtidai istintaq orqanının və ya məhkəmənin (hakimin) icraatında olan işin halları barədə informasiya daşıyan maddi obyektlər, hadisələr və proseslər haqqında xüsusi elmi biliklər əsasında aparılan tədqiqatı təmsil edir. Həmin Qanunun 21-ci maddəsində isə məhkəmə ekspertizasının aparılmasının əsasları nəzərdə tutulur və məhkəmə ekspertizası Azərbaycan Respublikasının prosessual qanunvericiliyində nəzərdə tutulmuş hallarda təhqiqatçının, müstəntiqin və ya prokurorun qərarı, yaxud məhkəmənin (hakimin) qərarı ilə təyin edilir (Vəkil kriminalistikası kriminalistikada yeni istiqamət kimi, 2017: 138-141).

Məhkəmə ekspertizasının prosessual əsaslarını düzgün şəkildə təşkil etmək üçün Azərbaycan Cinayət Məcəlləsi və Dövlət Məhkəmə ekspertizası fəaliyyəti haqqında Qanunun tələblərinin bərabər şəkildə nizamlanması önəmli bir məsələdir. Hər iki qanunvericilikdə ekspertizin obyektiv və müstəqil olması təmin edilməlidir. Məhkəmə ekspertizası məhkəmə tərəfindən təyin edilən ekspertlər tərəfindən aparılmalıdır və onların fikirləri hüquqi prosesin ədalət və obyektivliyini təmin etmək məqsədilə dəyərləndirilməlidir.

Vəkillər və vəkillik fəaliyyəti haqqında qanunvericiliyin dəyişdirilməsi məqsədilə, müdafiəçilərin daha çox müstəqil ekspertlərdən rəy almağa və müdafiəsi üçün daha effektiv şəkildə işləməyə imkan verilməlidir. Bu, hüquqi tədqiqatların daha dəqiq və ədalətli aparılmasına kömək edəcək və hüquq-mühafizə prosesində daha çox inam yaradacaqdır (Vəkil araşdırması müasir kriminalistika elminin obyektidir, 2015: 13-17).

Həmçinin, ekspertizin müstəqil və obyektiv olması üçün təlim və sertifikasiya proqramları təşkil edilməlidir. Bu, ekspertlərin ən yüksək standartlarda təhsil almalarını və təcrübə qazanmalarını təmin edəcək və hüquqi prosesin keyfiyyətini artıracaqdır.

Ədalət təminatını artırmaq məqsədilə, məhkəmə ekspertizası prosedurlarının şəffaf və açıq olması vacibdir. Həmin prosedurların izahlı və anlaşılan olması, hüquqi tərkibin və ictimaiyyətin güvənini qazanmağa kömək edəcəkdir.

Məclisdə müzakirə olunan bu məsələlərin əhəmiyyəti və cəmiyyət üçünə olan təsiri gözlənilməzdir. Hüquqi sistemin daha effektiv funksionlaşması və ədalət təminatının artırılması üçün hər bir addımın vacib olduğuna inanıram.

Əvvəlcə, məhkəmə ekspertizası sahəsində əlavə tədbirlər görmək üçün müxtəlif təcrübələr və tədqiqatlar aparılmalıdır. Bu, mövcud qanunvericiliyin effektiv tətbiqini qiymətləndirmək və təklif edilən dəyişikliklərə uyğun olaraq yeni qaydaların tətbiqini nəzərdə tutmağa kömək edəcəkdir.

Həm də, ictimaiyyət və müstəqil təşkilatlar bu məsələlərə diqqət yetirməlidir. Məhkəmə ekspertizası prosesinin şəffaf və ədalətli olması üçün cəmiyyətin səsini eşitmək və müşahidə etmək vacibdir. Bu, hüquq-mühafizə sisteminin güvənilirliyini artırmağa və cəmiyyətin hüquqi prosesə etirazını azaltmağa kömək edəcəkdir (Vəkil araşdırması cinayət-prosessual hüququn tədqiqat obyekti kimi: vəzifələrin müəyyən edilməsi, 2012: 88-91).

Əlavə olaraq, hüquqi təlim təşkilatları və universitetlər müdafiə və məhkəmə ekspertizası sahəsində təhsilin keyfiyyətini artırmağa nail olmalıdır. Hüquqşünasların və ekspertlərin daha yüksək səviyyəli təhsil almaları və müasir tədqiqatlarla yaxından tanış olmaları, bu sahədə inkişafı təmin edəcəkdir.

Ən əsası, məhkəmə ekspertlərinin müstəqil və obyektiv olmalarını təmin etmək üçün daha dəqiq təyinat və tədris prosesləri qurulmalıdır. Hüquqşünasların və tədqiqatçıların məhkəmə ekspertləri olmağa hazırlaşdıqları tədqiqat laboratoriyalarında real hüquqi təcrübələrə daha çox yer verilməlidir. Bu, təlim alan ekspertlərin hüquqi proseslərə daha çox hakim olmalarına və məsuliyyət sahibi olmalarına kömək edəcəkdir (Alternativ ekspertiza: kriminalistik və hüquqi məsələlər, 2020: 4).

Hüquq-mühafizə orqanlarının fəaliyyətləri müvafiq nəzarət və təhlükəsizlik tədbirləri ilə əhatə olunmalıdır. Həm də məhkəmə ekspertləri arasında birgə təcrübə paylaşmaq və müxtəlif sahələrdə ixtisaslaşmağa kömək edəcək təşkilatlar qurulmalıdır. Bu, ekspertlərin təcrübə və bacarıqlarını artırmağa və hüquq-mühafizə proseslərini daha sürətli və effektiv etməyə yardım edəcəkdir.

Ən müasir texnologiyalardan istifadə etmək də hüquq-mühafizə sistemlərinin daha effektiv olmasına kömək edə bilər. Texnologiya tətbiqi, məhkəmə ekspertlərinin təcrübələrini daha tez və ətraflı şəkildə analiz etmələrinə və hüquqi məsələləri həll etmələrinə kömək edəcəkdir (Vəkil araşdırmasında 3D kompyuter modelləşdirməsindən istifadə edilməsi məsələləri, 2018: 88-94).

Cəmiyyət üzrə fərqli tərəfdaşlar arasında dialoq və əməkdaşlığı təşvik etmək də əhəmiyyətlidir. Hüquq-mühafizə orqanları, təlim təşkilatları, və ictimaiyyət birgə işləyərək hüquqi proseslərin keyfiyyətini artırmağa nail ola bilərlər. Bu cür bir əməkdaşlıq, hüquqi sistemin güvənin artırılmasına və cəmiyyətin hüquqi prosesə olan etirazının azaldılmasına kömək edəcəkdir.

Hüquq-mühafizə sistemlərinin effektivliyini artırmaq və cəmiyyətin güvəsini qazanmaq üçün daha bir neçə mühüm addım atmağa nail olmaq əhəmiyyətlidir (Azərbaycan Respublikasında vəkillik fəaliyyəti, 2019: 93-97).

Birincisi, hüquq-mühafizə orqanları və məhkəmə ekspertləri üçün daha geniş və təkmilləşdirilmiş təhsil proqramları təyin edilməlidir. Bu proqramlar, hüquqşünasların və ekspertlərin müasir texnologiyalardan, ictimai təhlükəsizlik prinsiplərindən və müstəqil tədqiqat bacarığından asılı olaraq daha spesifik sahələrdə ixtisaslaşmalarına imkan verəcəkdir. Bu, onların daha yüksək səviyyədə bacarığa və təcrübəyə sahib olmalarına kömək edəcəkdir.

İkincisi, hüquq-mühafizə orqanları müstəqil audit və nəzarət proseslərini gücləndirməlidir. Bir məhkəmə eksperti kimi fəaliyyət göstərən şəxslər arasında müstəqil auditlər təşkil etmək, sistemin obyektivliyini və etik normativlərə əməl etməni təmin etmək üçün əhəmiyyətlidir.

Üçüncüsü, ictimaiyyət və məhkəmə ekspertləri arasında daha yaxın əməkdaşlığı təşvik etmək lazımdır. Hüquq-mühafizə orqanları və tədqiqatçılar bir araya gələrək müxtəlif sahələrdə təcrübə və bilikləri paylaşmalıdırlar. Bu, hüquqi tədqiqatların daha ətraflı və müstəqil olmasına, bu sahədə ən yaxşı təcrübələrin paylaşılmasına kömək edəcəkdir (Vəkil yardımından istifadə etmək hüququnun İnsan Hüquqları üzrə Avropa Məhkəməsinin presedentlərində qeydə alınmış bəzi tipik pozuntuları, 2017: 122-134).

Hüquq-mühafizə orqanları və məhkəmə ekspertləri ilə ictimaiyyət arasında daha açıq və informasiya mübadiləsinin olduğu bir mühit yaratmağa nail olmaq lazımdır. Bu, cəmiyyətin hüquqi proseslərinə daha çox etiraz etməsinin qarşısını almağa və ictimaiyyətin güvəsini qazanmağa kömək edəcəkdir.

Dördüncüsü, hüquq-mühafizə orqanları texnologiya ilə daha sıx əlaqə qurmağa nail olmalıdır. İnternetdəki cinayətlər və digər təhlükəli fəaliyyətlər daha çox genişlənir, buna görə də hüquq-mühafizə orqanlarının texnologiya ilə addımlarını artırması vacibdir. Digər tərəfdən, texnologiya şirkətləri ilə daha sıx tərəfdaşlıq edilməlidir ki, yeni təhlükələrə qarşı daha sürətli reaksiya verilsin və texnologiyalardan asılı olmayaraq, insanların hüquqi haqlarını qorumaq üçün effektiv strategiyalar tətbiq edilsin.

Beşinci addım kimi, hüquq-mühafizə orqanları və məhkəmə ekspertləri daha demokratik və partisipativ qurumlarla daha yaxın əlaqələr qurmalıdır. Cəmiyyətin təhlükəsizliyi üçün ictimaiyyətin fikirləri və nəzarəti əhəmiyyətlidir. Bu münasibətdə, hüquq-mühafizə orqanları tərəfindən tətbiq edilən strategiyalar və qərarlar ictimaiyyət tərəfindən anlaşılır və dəstəklənir olmalıdır.

Altıncı olaraq, hüquq-mühafizə orqanları və məhkəmə sistemləri təlim və inkişaf üçün daha böyük ehtimam göstərməlidirlər. Texnologiyalardakı sürətli inkişaf nəzərə alındığında, hüquq-mühafizə orqanları da özlərini müasir texnologiyalar, kibertexnologiyalar və müharibədən geri qalmamağa nail olmağa təmin etməlidirlər. Məhkəmə sistemləri də hüquqi təhsil və bacarıqları möhkəmləndirmək üçün daha effektiv tədbirlər görməlidirlər.

Yeddinci addım kimi, hüquq-mühafizə orqanları və məhkəmələr daha çox beynəlxalq əməkdaşlıq və tərəfdaşlıq qurmalıdırlar. Kibertexnologiyaların və digər təhlükəli fəaliyyətlərin geniş yayılmasına qarşı mübarizədə, bir-birləri ilə əməkdaşlıq edən ölkələr daha effektiv nəticələr əldə edə bilərlər. Bu əməkdaşlıq sayəsində, informasiya mübadiləsi və təhlükəli şəxslərin izlənməsi daha sürətli və effektiv olacaq.

Səkkizinci addım olaraq, hüquq-mühafizə orqanları və məhkəmələr təşkilatları təhlükəsizlik sahəsində ən yaxşı təcrübələri mübadilə etməlidirlər. Digər ölkələrdə və beynəlxalq səviyyədə

uğurlu təcrübələri öyrənmək və öz təcrübələrini başqaları ilə bölüşmək sayəsində hüquq-mühafizə orqanları daha effektiv strategiyalar təyin edə bilərlər.

“Vəkillər və vəkillər fəaliyyəti haqqında” Azərbaycan Respublikası Qanununun 15-ci maddəsi vəkillərin hüquqlarını müəyyən edir və ədalət mühakiməsinin prinsiplərini tənzimləyir. Bu maddəyə əsasən ədalət mühakiməsinin prinsip və şərtlərini aşağıdakı kimi ümumiləşdirmək olar (Vəkil araşdırması aparmanın bir hüquq (davranış imkanı) kimi xarakteristikası, 2018: 63-58):

1. Müstəqillik və Qanuna tabe olmaq: Vəkillər müstəqil fəaliyyət göstərir və yalnız qanunun tələblərinə tabedirlər.

2. Vəkillərin hüquqları: Onların hüquqi yardım almaq üçün müraciət edən fiziki və hüquqi şəxslərin vəkili olmaq hüququ vardır. Onlar istintaqlarda, məhkəmələrdə, dövlət orqanlarında, təşkilatlarda, qeyri-dövlət təşkilatlarında, xarici dövlətlərdə və beynəlxalq təşkilatlarda müdafiə etdikləri şəxslərin maraqlarını təmsil etmək səlahiyyətinə malikdirlər.

3. Qanunvericiliyə uyğun olaraq fəaliyyət: Vəkillərin qanunvericiliklə qadağan olunmayan və hüquqi etikaya zidd olmayan istənilən üsul və vasitələrdən istifadə etmək hüququ vardır.

4. Peşəkar fəaliyyətlə bağlı müstəqil araşdırma və sənədlərin toplanması: Onların qanunvericiliyə uyğun olaraq peşə fəaliyyəti ilə bağlı müstəqil araşdırma aparmaq səlahiyyəti var. Onlar hüquqi yardım göstərmək üçün zəruri olan bölmələrdən, təşkilatlardan və müəssisələrdən arayışları və sənədləri tələb etmək, tanımaq və surətini çıxarmaq hüququna malikdirlər.

5. Ekspert məlumatı və rəyinin əldə edilməsi: Onlar ekspert bilik tələb edən məsələlərlə bağlı araşdırma aparmaq və ekspertlərdən rəy almaq səlahiyyətinə malikdirlər.

6. Texniki Vasitələrin İstifadəsi: Onlara qanunla müəyyən edilmiş texniki vasitələrdən istifadə etmək hüququ verilir.

7. Müştəri ilə maneəsiz ünsiyyət: Onların qanunla nəzərdə tutulmuş qaydada müdafiə olunan və ya təmsil olunan şəxslə heç bir maneə olmadan təkbaşına görüşmək və danışmaq hüququ vardır (Vəkil sorğusu cinayət prosesində müdafiəçinin məlumat toplamaq hüququnun realizə vasitəsi kimi, 2018: 92-98).

Bu prinsiplər vəkillərin müstəqillik, ədalətli təmsilçilik, qanunvericiliyə uyğunluq və müştəri ilə effektiv ünsiyyət kimi fundamental prinsiplərə hörmət etmələrini təmin edir. Bu, ədalətin təmin edilməsi və qanunun aliliyinin qorunması üçün vacibdir (Cinayət prosesində vəkilin baxış aparmaq və maddi sübutlar toplamaq hüquqları haqqında, 2019: 38-41).

## Nəticə

Qeyd edilən mərhələlər, cinayət əleyhinə mübarizədə təhlükəsiz cəmiyyətin formalaşdırılmasına nail olmaq üçün vacib addımlardır. Bu strateji, hüquq-mühafizə orqanları, sosial təşkilatlar, təhsil müəssisələri və cəmiyyətin özünün birlikdə fəaliyyət göstərərək cinayət statistikalarını azaltmağa və ictimai təhlükəsizliyi təmin etməyə nail olmağa nail ola bilər.

Bu mərhələlər, cinayətlə mübarizədə müxtəlif sahələrdə və aktorlar arasında birgə əməkdaşlığı təşviq etməklə birlikdə, cinayətə yol verən məsələlərin həlli və cəmiyyətin təhlükəsizliyini artırmağa yönlənmişdir. Təşkilatlar və cəmiyyətin özü bu stratejiyadan öyrənib istifadə etdikdə, daha təhlükəsiz bir həyat təmin etmək üçün güclü və effektiv bir zəmanət yarada bilər.

“Vəkillər və vəkillər fəaliyyəti haqqında” Azərbaycan Respublikası Qanununun 15-ci maddəsi vəkillərin malik olduğu hüquqları müəyyən etməklə ədalət mühakiməsinin əsas prinsiplərini tənzimləyir. Bu hüquqlar vəkillərin müstəqillik, ədalətli təmsilçilik, qanunvericiliyə uyğunluq və effektiv ünsiyyət kimi mühüm prinsiplərə hörmət etmələrini təmin edir. Bundan əlavə, vəkillərin peşə fəaliyyəti zamanı texniki vasitələrdən istifadə etmək, ekspert rəyləri almaq və sənədləri tələb etmək kimi səlahiyyətləri onlara hüquqi prosesləri effektiv idarə etməyə imkan verir.

Bu hüquqlar qanunun aliliyinin qorunmasını və ədalətli hüquq sisteminin fəaliyyətini təmin edir. Bu, vəkillərə müştərilərini ən yaxşı şəkildə təmsil etmək üçün lazımi imkanlar yaradır və ədalətin təmin olunmasına töhfə verir. Ona görə də “Vəkillər və vəkillər fəaliyyəti haqqında” Qanunun 15-ci maddəsi Azərbaycanda qanunun ədalətliliyini təmin etmək üçün mühüm alət rolunu oynayır.

## Ədəbiyyat

1. Cinayət prosesində vəkil araşdırması: terminin formalaşma mərhələləri. (2012). AMEA Fəlsəfə, Sosiologiya və Hüquq İnstitutunun Elmi əsərləri. Bakı: AMEA FSHİ. № (1)18, s.281-285.
2. Cinayət mühakimə icraatında müdafiə funksiyasının məzmunu barədə. (2015). Dövlət idarəçiliyi: nəzəriyyə və təcrübə. Azərbaycan Respublikasının Prezidenti yanında DİA. № 3 (51), s.171-178.
3. Vəkil kriminalistikası kriminalistikada yeni istiqamət kimi. (2017). Polis Akademiyasının elmi xəbərləri. Bakı, № 3-4, AR DİN Polis Akademiyası, s.138-146.
4. Vəkil araşdırması müasir kriminalistika elminin obyektidir. (2015). Odlar Yurdu Universitetinin Elmi və Pedaqoji xəbərləri. Humanitar və dəqiq elmlər seriyası. Bakı, № 42, s.13-17.
5. Vəkil araşdırması cinayət-prosessual hüququn tədqiqat obyekti kimi: vəzifələrin müəyyən edilməsi. (2012). "Hüquq elminin müasir problemləri" mövzusunda II Respublika elmi-nəzəri konfransın materialları. Bakı: Təknur nəşriyyatı. AMEA FSHİ, 29-30 mart, s.88-91.
6. Alternativ ekspertiza: kriminalistik və hüquqi məsələlər. (2020). Polis Akademiyasının elmi xəbərləri. № 1 (25). AR DİN Polis Akademiyası, s.104-110.
7. Vəkil araşdırmasında 3D kompyuter modelləşdirməsindən istifadə edilməsi məsələləri. (2018). Qanun. Elmi hüquq jurnalı. Bakı, №1 (279), s.88-93.
8. Azərbaycan Respublikasında vəkillik fəaliyyəti. (2019). Qanun. Elmi hüquq jurnalı. Bakı, № 10 (300), s.93-97.
9. Vəkil yardımından istifadə etmək hüququnun İnsan Hüquqları üzrə Avropa Məhkəməsinin presedentlərində qeydə alınmış bəzi tipik pozuntuları. (2017). Qanun. Elmi hüquq jurnalı. Bakı, №11 (277), s. 122-134.
10. Vəkil araşdırması aparmanın bir hüquq (davranış imkanı) kimi xarakteristikası. (2018). Qanun. Elmi hüquq jurnalı. Bakı, №12 (290), s.63-68.
11. Vəkil sorğusu cinayət prosesində müdafiəçinin məlumat toplamaq hüququnun realizə vasitəsi kimi. (2018). Qanun. Elmi hüquq jurnalı. Bakı, №2 (280), s.92-98.
12. Cinayət prosesində vəkilin baxış aparmaq və maddi sübutlar toplamaq hüquqları haqqında. (2019). Məhkəmə ekspertizası, kriminalistika və kriminologiyanın aktual məsələləri. Bakı, № 67, AR ƏN MEM, s.38-41.

Göndərilib: 20.10.2023 Qəbul edilib: 01.12.2023

DOI: https://doi.org/10.36719/2663-4619/97/130-135

**Turan Məmmədova**
Gəncə Dövlət Universiteti
doktorant
nuraddin.mammadov.rnk@gmail.com

# MÜASİR AZƏRBAYCAN DİLİNDƏ MƏTNİN İNFORMASİYA STRUKTURUNUN YARANMASI VƏ SIXILMASINDA XÜSUSİLƏŞMƏNİN ROLU

**Xülasə**

Məqalədə müasir Azərbaycan dilində mətnin informasiya strukturunun formalaşmasında və sıxılmasında ixtisaslaşmanın rolundan bəhs edilir. İxtisaslaşma bəzi cümlə üzvlərinin semantik birliyinə, intonasiya və pauzaya görə cümlənin digər üzvlərindən ayrılmış sintaktik vahid kimi izah olunur. İxtisaslaşma bədii mətnlərin formalaşmasında, informasiya yükünün artırılmasında mühüm rol oynayır. İxtisaslaşmanın mətn strukturunda tutduğu mövqe də onun məlumat vermək gücü ilə bağlıdır. Bir sözlə, bu mövzu Azərbaycan dilçiliyi üçün yenidir. Mətndə ixtisaslaşma bir çox vasitə və üsullarla formalaşır. O vasitələrdən biri də ikinci dərəcəli cümlə üzvlərinin "xüsusilə, xüsusi, o cümlədən, hətta özü" sözləri ilə birləşərək ixtisaslaşma yaradır. Məs.: Vətən anlayışının müxtəlifliyi onun strukturunda ideoloji amillərin payını artırmağa və siyasi diskurs çərçivəsini genişləndirməyə imkan verir. Bu, xüsusilə, əsas mexanizmi məntiqi arqumentlərə əsaslanan nitq mexanizmlərinin müxtəlif formaları olan sivil danışıqda özünü göstərir.

***Açar sözlər:*** *xüsusiləşmə, xüsusiləşmiş üzvlər, informasiya, mətn, sıxılma hadisəsi*

**Turan Mammadova**
Ganja State University
PhD student
nuraddin.mammadov.rnk@gmail.com

## The role of specialization in the creation and compression of the information structure of the text in the modern Azerbaijan language

**Abstract**

The article deals with the role of specialization in the formation and compression of the information structure of the text in the modern Azerbaijani language. Specialization is explained as a syntactic unit separated from other members of the sentence due to the semantic unity of some of the sentence members, intonation and pause. Specialization plays an important role in the formation of literary texts and in increasing the information load. The position of specialization in the text structure is also related to its power to provide information. In short, this topic is new for Azerbaijani linguistics. Specialization is formed in the text by many means and methods. One of those means is that the second-order sentence members combine with the words "especially, special, including, even, itself to" create specialization. E.g.: The diversity of the concept of homeland allows to increase the share of ideological factors in its structure and to expand the framework of political discourse. This is especially evident in civilized discourse, the main mechanism of which is various forms of speech mechanisms based on logical arguments.

***Keywords:*** *specialization, specialized members, information, text, compression phenomenon*

## Giriş

Qeyd edək ki, cümlə minimal nitq əsəridir, ünsiyyət funksiyası ilə əhatə olunub. Bu əhatədə cümlənin iyerarxik strukturunun tədqiqi-seqmentasiya ön plana keçir. Tədqiqat cümlə modellərinin sintaksem təhlilinə yol açır. Cümlə üzvlərinin yeni interpretasiya imkanları meydana çıxır. Üzvlənmənin iki tipi vardır: 1) daxili və 2) əsas üzvlənmə. Cümlə insan fəaliyyətinin koqnitiv

(fikri) fəaliyyətinin məhsulu kimi meydana çıxır. Söz nitq vahidinin açarıdırsa, cümlə də nitq vahidinin açarıdır.

Qrammatik cəhətdən cümlə üzvləri ilə baglı olmayan sözlər "ayrılıqda deyil, cümlələr daxilində birləşdikdən sonra bitmiş bir fikri ifadə edir və kommunikativ vasitəyə çevrilir. Cümlədə birləşən sözlər isə eynihüquqlu olmur. Bunlardan bəziləri cümlənin əsasını təşkil edir, müəyyən suallara cavab olur. Bu cür sözlər arasında həm qrammatik, həm də semantik əlaqələr olur. Başqa sözlər isə mətndə başlıca fikri ifadə edə bilmir və həmin sözlərlə cümlənin bazasını təşkil edən sözlər arasında heç bir qrammatik əlaqə də formalaşmır. Onlar ancaq məna cəhətdən cümlə ilə əlaqəyə girir. İkincilərə xüsusiləşmələr də daxildir" (Seyidov, 2006: 431).

Q.Kazımov yazır: *"Cümlə üzvlərinin xüsusiləşməsi fikrin aktuallaşdırılması məqsədilə bəzi üzvlərin xüsusi intonasiya ilə tələffüz edilməsi, fasilə və vurgu ilə nəzərə çarpdırılması nəticəsində cümlə sistemində baş verən bir qrammatik-funksional hadisədir. Xüsusiləşmə XIX əsrdə də müasir ədəbi dilimizdə oldugu kimi, bəzi xüsusiləşdirən vasitələrin iştirakı ilə formalaşmışdır"* (Kazımov, 2010: 195-197).

Ümumiyyətlə, mətndə xüsusiləşmənin informasiyaveridicilik xüsusiyyətləri onun başlıca əlamətləri ilə birləşir: xüsusiləşmə mətnin daxilində özünü göstərir; o, cümlə üzvlərinə aid məsələdir; xüsusiləşmiş üzvlərin (xüsusiləşmənin özünün də) transformasiyasi vardır; tabellilik əlaqəsi mövcuddur; cümlənin qalan hissəsindən intonasiya baxımdan fərqlənir, mətndə bir qədər ucadan səslənir, fasilə nisbətən uzanmır; ayrı-ayrı üzvləri nəzərə carpdırmaqdan ötrü istifadə olunur; bu zaman cümlə üzvləri öncəki funksiyasında qalır; xüsusiləşmə üçün müəyyən vasitələr (feili baglamalar və s.) tələb edilir.

Biz bu yazıda xüsusiləşməni kommunikativ aspektdə araşdırmışıq. Bu aspekt həm də xüsusiləşmənin mətnin informasiya strukturunun yaranmasındakı oynadığı rolu müəyyənləşdirməkdən ibarətdir. Bu rolu müəyyənləşdirməkdən ötrü XX əsrin 20-ci illərində əsası qoyulmuş Praqa dilçilik məktəbinin funksional yanaşma istiqamətindən istifadə etmişik. Bu əlaqənin funksional mahiyyətini müəyyənləşdirməyə çalışmışıq. Xüsusiləşmənin kommunikativ rolu məhz bu yanaşmanın elmi işə tətbiqi ilə yoluna qoyula bilər. Əsas məqsəd xüsusuləşmənin bir vasitə kimi cümlənin fikir komponentləri arasındakı baglılıgını üzə cıxarmaq, təhil etməkdən ibarətdir. Həmin dil vahidinin məna, fikir strukturunun, kommunikativ diktemin meydana gətirilməsindəki rolunu göstərməkdir.

Xüsusiləşmə mətnin xüsusi sintaktik hadisələrdən biridir. Cümlənin koqnitiv modelini təşkil edə bilir. Cümlədə baş və ikinci dərəcəli üzvlərin və xüsusiləşmənin yerininin, rolunun koqnitiv əsaslarını təyin etmək tələb olunur. Yuxarıda deyildiyi kimi, daxili üzvlərin (cümlə üzvləri arasında iyerarxik münasibət) əlaqəsini dəqiqləşdirmək, **xüsusiləşmənin bir sintaktik hadisə** olaraq mahiyyətini və onun əlaqə sistemində (diktem) statusunu aydınlaşdırmaq, daha sonra xüsusiləşmənin mətn vahidlərinin informasiya strukturunun yaranmasındakı rolunu üzə çıxarmaqdan ibarətdir. Diktem termin-anlayışı -kontekstə mətn vahididir. Diktem-kiçik mətni vahiddir. Diktem- tematik və üslubyaradıcı vahiddir.

**Mətnin informasiya strukturunda xüsusiləşmənin rol**u. Bu həm də mətnin kommunikativ strukturudur. Xüsusiləşmə kommunikasiya ilə birbaşa əlaqəlidir. Ümumi cəhət, cümlənin tema-rematik üzvlənməsinin sintaktik vasitələri mətn vahidinin tematik kontekstində diktem (cümləaltı) səviyyəsindədir.

Cümlənin informasiya xarakteri nitqlə əlaqəlidir, statik və dinamik, sintaqmatik və paradiqmatik əlaqəyə malikdir. Cümlənin təbiətinin müasir sintaktik konsepsiyası və onun ikitərəfli əlaqəsi-dil bə nitq baglılıgı barədə məlumat verir. İnformasiyanın mahiyyəti cümlədə öz əhatəsini tapır. Cümlə nitqdə, yəni mətndə aktuallaşaraq funksionallaşır. Dilin funksional vasitələri cümlənin kommunikativ (aktual) anlayışı ilə sıx olaraq baglıdır.

Xüsusiləşmənin spesifikası cümlə üzvləri arasında qrammatik (sintaktik) əlaqə vasitəsi kimi özünü göstərir. Mətn kəsikləri arasnda məna münasibətini formalaşdırır. Məs.: Nəticədə danışanın nitq fəalliyyəti-mətn "elementar situativ-tematik vahidlər-diktemə parcalanır", bu cəhət dilin

iyerarxik səviyyə qanununa əsaslanır ("fonemdən diktemə qədər") Diktem-mətndə kompleks informasiya yaradır.

Deməк, xüsusiləşmə həm məntiqi, həm də qrammatik kateqoriyadır. Hər iki kateqoroya arasında münasibət mövcuddur.

**Xüsusiləşmiş cümlə üzvlərinin funksional-kommunikativ aspektləri**. Kommunikativ proses dil vahidlərini informativ və qrammatik cəhətdən formalaşdırır. Müxtəlif tip mətnlər kombinasiya olunur.

Funksional qrammatika səviyyəsində xüsusiləşmə sintaktik üsuldur, yeni informasiyanən mətndə ayrılmasında mühüm ifadə funsiyasını yerinə yetirir. Yeni informasiya mətnin rema hissəsində özünü göstərir. Xüsusiləşmiş kompleksin kommunikativ funksiyası eliminləşən transformasiyadır (çevrilmə), burada hər hansı bir cümlə üzvü buraxılır.

Cümlə üzvlərinin mətndə xüsusiləşməsi dərəcəsinə, rematik xüsusiləşmə elementi qradasiyasına və kommunikativ mənasına görə 3 dərəcəyə ayrılır: 1-ci rema,2 və 3-cü dərəcələr. Bu dərəcələr mətnin diktemini-minimal vahidini, onun kommunikativ strukturunu da müəyyənləşdirir.

Xüsusiləşmə, eyni zamanda statik və dinamik sistaksisin predmeti kimi çıxış edir. Bir hadisə kimi cümlə səvuyyəsində funksionallaçır, statik olduguna görə sintaqmatik xarakter daşıyır. Dinamik səciyyəsinə görə isə xüsusiləşmə nitqin cümlədəki aktuallaşmasını üzə çıxarır.

Xüsusiləşmənin rematik dərəcəsinin yaranmasında zərflik mühüm rul oynayır.

Xüsusiləşmənin kommunikativ xarakteri iştirakcılaran nitq aktı arasındaı əlaqənii möhkəmləndirir.

Xüsusiləşmənin mühüm ontoloji aspektləri mövcuddur. Bu aspektdə sintaktik əlaqə tipləri təcvir olunur. Eləcə də, xüsusiləşmə koqnitiv aspektdə nəzərdən keçirilir.

Məlumdur ki, cümlə müəyyən üzvlərdən qurulur. Bu üzvlər bir-birilə qarşılıqlı əlaqədə olurlar. Əlaqə qrammatik və leksik amillərə əsaslanır. Tədqiq etdiyimiz məsələ konkretləşdirici üzvlərə aiddir. Belə üzvlərə tamamlıq, təyin və zərflik daxildir. Hər üç üzv baş üzvləri- mübtəda və xəbəri aydınlaşdırmaga, izah etməyə xidmət göstərir. Dilin sintaktik bölməsində bir sıra ikinci dərəcəli üzvlər semantik və intonasiya cəhətdən digər üzvlərdən ayrılaraq fərqləndirilir. Bunun səbəbi cümlədə müəyyən sintaktik müstəqilliyin əldə olunmasıdır.

Cümlə, cümlə üzvləri ilə baglı məsələlərdən biri də xüsusiləşmədir. Ə.Abdullayev Azərbaycan dilçiliyində bu problemi monoqrafik şəkildə tədqiq edərək göstərir ki, "*cümlə üzvlərinin bir qismi məna birliyinə, intonasiya və fasiləyə görə cümlənin digər üzvlərindən ayrılır ki, buna xüsusiləşmə deyili*r" (Abdullayev, 1981: 239-257).

Mətndə xüsusiləşmə bu vəzifəni yerinə yetirir. Bu baxımdan xüsusiləşmənin mətndə bir çox semantik-üslubi vəzifələri vardır: 1.Fikri dəqiqləşdirmək məqsədi; 2.Mətndə təsvir olunan obyekti konkretləşdirmək; 3.Mətni ekspressiv rəngə boyamaq. Misal üçün: Vəli qızlarını şox sevirdi. *Xüsusilə* də Məlikəni. Zəlzələdə heç nə eşidilmirdi. Fəryaddan başqa. Müdir eşitmədi. Xəzər bir aynadə. Üzü ləkəsiz (S.Vurgun) Mənin etirazıma baxmayaraq.

Xüsusiləşməni mətndə bir çox vasitələr və üsullar formalaşdırır. Həmin vasitələrdən biri, ikinci dərəcəli cümlə üzvlərinin *xüsusən, xüsusilə, o cümlədən, hətta, özü də* sözləri ikə birləşərək xüsusiləşmə yaratmasıdır. Məs.: Vətən konseptinin çoxceşidliliyi strukturunda ideoloji amillərin payının artırılmasına, siyasi diskursun çərçivəsinin genişlənməsinə imkan verir. Bu, *xüsusilə* sivil diskursda özünü göstərir, əsas mexanizmi məntiqi arqumentlərə əsaslanmaqla müxtəlif formalı nitq mexanizmləridir.

İkincisi isə, cümlə üzvləri *özü, savayı, başqa, əvəzinə, halda, baxmayaraq, illah da* qoşmaları ilə birlikdə öüsusiləşməni mətndə formalaşdırır. Məs.: Gələn vardı, aşkar bəlli idi. *Özü də düz Qədirə tərəf...*(Mir Cəlal); Hamı iştirak edirdi. *Səndən savayı…* (danışıqdan); Soyuq idi. *Payız olmasına baxmayaraq*. Xəstə idi. *Əlalxüsus da son iki-üç ildə. Səs-küy qaldırmışdılar. İllah da arvadlar (İ.Məlikzadə) və s.*

*Bu örnəklərdə, göründüyü kimi, cümlənin strukturu və mətnin məlumat bloku səxılmış bəziyyətdədir.*

Bu model qoşulma yarımçıq cümləyə də oxşayır. Məs.: Şəfi yatırdı. Özü də üzüqoylu. Deyirlər, keçiyə oxıayır. Özü də yekə buynuz keçiyə (Kazımov, 2016: 109).

**İnformasiya və xüsusiləşmənin işləndiyi mətnin mənas**ı. Nitqdə, ən maraqlı hadisələrdən biri xüsusmədir. Bu hadisə dil sisteminin kommunikativ-sintaktik səviyyəsinə aid hadisədir. Xüsusiləşmə nitq sintaksisinin tipik təzahürüdür. Xüsusiləşmə cümlənin qalan hissəsindən fərqləndirilir. Xüsusiləşmə mətndə ayrı-ayrı üzvləri nəzərə çarpdırmaq üçündür. Bu dil vahidi üçün müəyyən vasitələr tələb olunur. Mətnin mənası onun daxili formasının strukturu və ya mahiyyətini təşkil edir. Xüsusiləşmənin işləndiyi mətnin məna və mahiyyətini onun bütövlüyü, iyerarxikliyi və simultanlıgı səciyyələndirir (Novikov, 1983: 216).

Xüsusiləşən və xüsusiləşməyən əlavələr mətnin mənası informasiyanın dolgunluq dərəcəsi ilə əlaqədardır. Xüsusiləşmənin işləndiyi nitq vahidlərinin qurulması, nitqin gərginliyi və ya qeyri-gərginliyi, mətnin eksplisit və ya implisin ifadə vasitələrinin sarası ilə baglıdır. Məs.: **El adətində var ki, sən-Gülöyşə ərsiz-ailəsiz qalıb, saçını ağardıb qarıyasan?** (B.Bayramov)

Hər bir mətnin özünəməxsus informasiya bazası olur. İnformasiyanın ümumi kəmiyyəti mətnin mahiyyətindədir- bu, mətnin dolgunlugudur.

Xüsusiləşmənin işləndiyi mətndə yeni informasiya (rema) yeni mənaları meydana çıxarır. Bu informasiya faydalı və praqmatikdir.

Mətnin informasiya strukturunun tədqiqi bu sahənin aparıcı alimi A.İ.Hovikovun metoduna əsaslanır. Həmin metodun mahiyyəti “qarşılaşdırılan mətn”dir. Bu mətn əvvəlki mətnlə baglı olur, onu davam etdirir, oradakı ideyanı genişkəndirir. A.İ.Hovikov xüsusiləşmənin işləndiyi mətnin informasiya strukturunu- özünün inkişaf etdirdiyi elmi yol, konsepsiya ilə- “mətnin mənası”, “mətnin məqsədi”, “mətndə düşüncənin ərsi”, “mətnin dərk edilməsi” ilə uzlaşdırır. Buraya mənyaradan proseslər, vasitələr, onun qavranılması, dominantlıq prinsipi və s.daxil edilir. Bu məsələlər mətnin bütövlükdə təbiətini aydınlaşdırır. Aydınlaşır ki, xüsiləşmənin işləndiyi mətnin məzmun və mahiyyəti-insan şüurunda mətnin layihəsidir, məna isə bu mətnin yenidən şüurda formalaşmasılır. Misal üçün:

Dil və nəql olunan informasiya arasında qarşılıqlı əlaqənin olması qətiyyətn şübhə doğurmur. Sözügedən həmin əlaqənin perspektivləri ilə mental dilçilik məşğul olur. Yəni koqnitiv dilçilik. Koqnitiv cərəyanlar çərçivəsində bu əlaqəyə münasibət semiotik faktoru önə çıxarır. Bu cərəyanlar nəql olunan informasiyanı və mətnin mənasını dilxarici hadisə hesab edir, onların dillə təsadüfi assosiativ rabitə ilə bağlandığı fikrini irəli sürürlər. Semiotik cərəyanın nümayəndələrinin nöqteyi-nəzərincə, məna hər hansı bir formada olmasından asılı olmayaraq obyektiv reallığın əksi deyil, sözlə maddi dünyanı inikas etdirən müxtəlif növ mənəvi formalar arasındakı münasibətdir. Məna eyni zamanda işarə edilənə və məna ifadə edənə qarşı qoyulur. Hətta bu vaxt dildə nəyin necə işarə edildiyi və ifadə edildiyi əsas sayılmır, *nəql edəni necə nəl etmək və ifadə etmək əsas sayılı*r. Təfəkkürdə informasiyanın biçimi dəyişmə prosesi kimi başa düşülür (Rəcəbli, 2003: 292-293). Ə.Rəcəbli davam edir və yazır ki, *«informasiya nəzəriyyəsi deyilən bir nəzəriyyə vardır. Bu nəzəriyyə informasiyanın sayını, onun mətndə statistik təhkim edilməsini və maşın tərcüməsi və veriliş üçün mətnin informasiyasının hazır şəklə salınmasını tələb edir. Dil və təfəkkürün əlaqəsini belə anlama nəticəsində mentallinqvistikanın semiotik cərəyanı informasiya nəzəriyyəsi ilə qovuşur»* (Rəcəbli, 2003: 292-293).

İnformativliyin aktivləşməsində, güclənməsində mətndəki hər bir dil vahidinin, o cümlədən xüsusiləşmənin müəyyən rolu vardır. Məsələn, məcaz növü olsn metaforaların rolu. E.M.Bolf yazır: *“Metafora mətnin formalaşdırdıgı informasiyaya xüsusi təsir göstərir. Onun informativliyini həm aktivləşdirir, həm də gücləndirir”* (Volf, 1988: 510).

Ümumiyyətlə, koqnitiv linqvistikada xüsusiləşmənin istifadə olunduğu mətnin semantikası və informativliyini tədqiq edən zaman metafora və metaforlaşmaya da xüsusi yanaşmaq lazım gəlir. Bu, bəzən üslubi əlamət kimi götürülür. Lakin metaforlaşma mühüm konseptuallaşma vasitəsi oldugundan, əqlin, fəaliyyətin mental təzahür vasitəsi oldugundan, “körpü funsiyasını yerinə yetirdiyindən” informasiya sferasına da daxil olur. Məsələn, *“əsgər-Məmmədov necə gün idi ki, ac*

*idi. Bir loxma yedi gözlərinə işıq gəld. Ruhuna işıq gəldi. O,- Rahib gənc olsa da, işıqli cavanlardan idi. Vzvodun işıgı idi"* (Ş.İsmayıl. «Əsgər işıgı")

Bu kimi faktlar göstərir ki, metaforlaşma prosesinin əsasında bilik, informasiya strukturlarının işlənib hazırlanması prosedurları dayanır. Ona gorə ki, düşüncə və mədəniyyət fenomeni olan metaforalar mətndə anlaşmanı təmin edə bir vasitə rolunu oynayır.

*Metaforalar müəyyən dil kollektivinin dünyanı dərk etməsinin özünəməxsus cizgilərini və gercəkliyin şərhini əks etdirir. Dildə metaforik ifadələr sistemli şəkildə metaforik konseptlərlə baglı oldugundan, həmin ifadələrdən metaforik konseptlərin təbiətinin və insan fəaliyyətinin başa düşülməsində istifadə edilə bilər (Agelyarova, 2017).*

Zamanla əlaqədar metaforaların informativliyin aktivləşməsi və gücləndirilməsində rolu: Zaman axır. Zaman kimin ədalətli, haqlı oldugunu göstərəcək. Zaman resursdur. Beləliklə, bu kimi zaman metaforlarında insanin uzunmüddətli təcrübəsi, mədəni səviyyə və s. böyük rola malik olmuşdur.

Bu konseptin məna tutumu daha geniş sahələri əhatə edir.Mətndə informasiyanın yaranma prosesi aşağıdakı ardıcıllıqla baş verir: təsvir-diqqət-qısa müddətli fasilə- uzun müddətli yaddaş.

İnformasiyanın məzmun və mahiyyəti mətnqurucu növləri şərtləndirir. Bu baxımdan İ.R.Qalperin mətnyaradıcı növləri 3 yerə bölür: faktual, konseptual və mətnaltı (s.20-42). Mətnaltı məna özündə dərin və fərdi mənaları birləşdirir (Kazımov, 2021: 14).

Mətnyaradıcı şərtlənməni hipotetik, metodik, estetik və instruktiv terminlərlə də ifadə edirlər.

Mətndə informasiyanın az olduğu hissədən çox olan hissəsinə doğru hərəkət nitqin qurulmasının universal qanunudur. Hər bir konkret halda informasiyanın yükü kommunikativ vasitə ilə, hökmün məqsədilə, situasiya ilə və nitq axını şəraiti ilə müəyyənləşdirilir. Tədqiqatçıların fikrincə, «*elmin, texnikanın, sosial-siyasi həyatın, mədəniyyətin əksi olan ayrı-ayrı sahələrin inkişafı ilə bağlı yeni yaranan mətnlərdən yeni biliklər, məlumatlar əldə olunur, bununla da mövcud anlayış və məfhumlar genişlənir və dərinləşir*» (Stepanov, 1975: 23-26). Məlumdur ki, mətn informasiyanı həm implisit, həm də eksplisit formalar vasirəsi ilə verir. Burada xüsusiləşmələrdən də bəzi hallarda istifadə olunur.

İsmi xəbərdə şəxs şəkilçisinin buraxılması informasiyanın formal cəhətdən sıxılmasına səbəb olur. Belədir ki, ad və köməkci nitq hissələri xəbər funksiyasını yerinə yetirdikdə, adəti üzrə, şəxs morfoloji göstəricilərini qəbul edir. Lakin dildə və nitqdə elə vəziyyətlə qarşılaşmaq olur ki, bu və ya digər məqsədlə şəxs şəkilçisi buraxılır və sıxılma əmələ gəlir. Məs.: *Evdə sakitlik* (Mir Cəlal) Yəni, "sakitlikdir" cümlədə xəbər şəkilçisi buraxılmışdır, sıxılma yaranmışdır.

Azərbaycan dili materialları əsasında mətnin informasiya strukturunun cümlənin xüsusiləşmiş üzvləri ilə əlaqəsinə aid əsərlərə rast gəlmirik. Buna baxmayaqaq, rus dilində ingilisdilli bədi əsərlərin təhlilinə aid dissertasiyalar yazılmışdır (Nikoloeva, 1977: 7).

Tədqiqatlar da göstərir ki, xüsusiləşmə linqvistik təhlil predmeti kimi diqqəti cəlb edir. Cümlənin struktur üzvlənməsi başlıca problemlərdəndir. Cümlə üzvləri sistemində iyertarxiya mövcuddur.

Yəni iyerarxiya tabeliyi cümlələrin struktur üzvlənməsinə də aid edilir. Bir sintaktik vahid digərinə tabe vəziyyətdə olur. Sintaktik əlaqənin müxtəlif tipləri və üsullsrı meydana çıxır. Həmin vəziyyətdə xüsusiləşmə də status qazanmış və sintaktik əlaqə sisneminə daxil olmuş, müxtəlif aspektlərdə xüsusiləşmiş cümlə üzvü kimi mətndə "fəaliyyət göstərir". Cümlə mətndə bütün hadisələrin modeli kimi çıxış edir. Xüsusən də, koqnitiv modeki. Sintaktik əlaqə tipləri də həmin aspektdə nəzərdən keçirilir. Nəhayət, xüsusiləşmə mətnin informasiya strukturunun yaranmasında müəyyən rol oynayır.

## Nəticə

Beləliklə, xüsusiləşmənin dilin sintaktik sistemində xüsusi yeri vardır. Başlıqda ifadə olunan mövzuya bizim dilçilikdə ilk dəfə toxunulur. Mətn strukturunda da xüsusiləşmənin mövqeyi onun informasiya vermə gücü ilə baglıdır.

Bir sözlə, bu mövzu Azərbaycan dilçiliyi üçün yenidir.

## Ədəbiyyat

1. Seyidov, Y. (2006). Əsərləri. On beş cilddə. I cild. Bakı: Bakı Universiteti nəşriyyatı, 628 s.
2. Kazımov, Q. (2010). Seçilmiş əsərləri. VIII. Bakı: "Nurlan", 544 s.
3. Abdullayev, Ə. (1981). Xüsusiləşmə. Müasir Azərbaycan dili. III cild. Sintaksis. Bakı: "Elm" nəşriyyatı, 443 s.
4. Kazımov, İ. (2016). Müqayisəli sintaksis. Bakı: «Elm və təhsil", 168 s.
5. Novikov, A.İ. (1983). Semantika teksta i ee formalizaüiə. M., s.56, 216 s.
6. Rəcəbli, Ə. (2003). Nəzəri dilçilik. Bakı: «Nurlan», s.292-293.
7. Volf, E.M. (1988). Metafora v əzike i teksta. M., 510 s.
8. Kazımov, İ. (2021). Mətn, xüsusiləşmə və qoşulma. Filologiya məsələləri. Bakı, s.12-19. (Mətndə xüsusiləşmə qoşulma və parselyasiya hadisələri onun hissələri arasında sistemli bir münasibət yaradır, 14 s).
9. Stepanov, O.S. (1975). Osnovi obhego əzikoznaniə. M., s.23-26.
10. Nikoloeva, T.M. (1977). Linqvistika teksta. Sovremennaya sostoyanie i perspektive M., s.7-14. Xüsusiləşmə mətnin ən zərurinitqtaradıcı faktorudur. Nitqdə fikri yüksəldir.
11. Agelyarova, A.S. (2017). Obosoblennyy chlen predlozheniye v informatsionnom stroye teksta: AKD, M.

Göndərilib: 15.09.2023 Qəbul edilib: 16.11.2023

DOI: https://doi.org/10.36719/2663-4619/97/136-140

**Vafa Aliyeva**
Azerbaijan University of Languages
PhD in Philology
vafaali28@gmail.com
**Rana Abdullayeva**
Baku Slavic University
abdullaeva.rena@mail.ru

# THE ROLE OF METONYMY IN CRAFTING FICTIONAL REALITIES (ON THE MATERIAL OF O'HENRY'S SHORT STORIES)

## Abstract

Among the numerous literary devices that contribute to the intricacies of storytelling, metonymy, often overlooked, plays a significant role in creating evocative narratives. This paper examines the role of metonymy in fiction, particularly focusing on the works of the renowned American writer O.Henry.

To comprehend the concept of metonymy, the paper considers its nuances, emphasizing its impact on character development, setting establishment, tone creation, foreshadowing, and symbolism in fiction. O.Henry's masterful use of metonymy is examined through examples from his notable works. The study also considers various purposes of metonymy in fiction.

***Keywords:*** *metonymy, fiction, symbolism, O.Henry's short stories*

**Vəfa Əliyeva**
Azərbaycan Dillər Universiteti
filologiya üzrə fəlsəfə doktoru
vafaali28@gmail.com
**Rəna Abdullayeva**
Bakı Slavyan Universiteti
abdullaeva.rena@mail.ru

## Bədii reallıqların yaradılmasında metonimiyanın rolu (O.Henrynin qısa hekayələri məzmununda)

## Xülasə

Bir çox ədəbi alətlərin müzakirənin mürəkkəblərini təmin etməyə yardım etdiyi, çox vaxt gözardı edilən metonimiyanın, təsirli narativlərin yaradılmasında əhəmiyyətli rol oynadığı qeyd olunur. Bu məqalə, xüsusilə məşhur Amerika yazıçısı O.Henrynin əsərləri əsasında, metonimiyanın ədəbiyyatda rolunu araşdırır.

Metonimiyanın konsepsiyasını başa düşmək üçün, məqalə onun nüanslarını nəzərə alır və onun şəxsiyyət inkişafı, mühit qurma, ton yaratma, qabaqcıl işarələr və simvolizmə təsirini vurğulayır. O.Henrynin metonimiyanın qeyri-adi istifadəsi onun əsərlərindən verilən nümunələr əsasında araşdırılır. Tədqiqat, ədəbiyyatda metonimyanın müxtəlif məqsədlərinin də nəzərdə tutulduğunu göstərir.

***Açar sözlər:*** *metonimiya, bədii ədəbiyyat, simvolizm, O.Henrinin qısa hekayələri*

## Introduction

Fictional literature, in all its forms, serves as a portal into the imagination, allowing readers to transgress the frames of reality and immerse themselves in alternate worlds. The artistry of storytelling employs a toolbox of literary devices and techniques that authors use to craft compelling narratives. In fiction, every word is a brushstroke on the canvas of imagination, and

every figure of speech acts as a prism that refracts the light of meaning. Among these literary tools that often goes unnoticed but plays a significant role in creating evocative prose is metonymy. “Despite metonymy’s capacity to create aesthetically impressive and structurally important effects, it has hitherto received so little attention in literary stylistics and rhetorical tropology – especially in comparison that has been lavished on metaphor – that it may be called the “forgotten trope”” (Matzner, 2016: 4).

From the ancient epics to modern literature, metonymy has always been an important component of the fabric of storytelling that creates layers of depth and evokes emotions beyond the mere arrangement of words. Exploring the intricate role of metonymy in fiction discovers the hidden mechanisms that breathe life into the narrative tapestry. The artistic talent of outstanding American writer O’Henry has always fascinated readers and attracted researchers’ attention.

Before delving into the analysis of metonymy in O.Henry's works, it's essential to understand the concept of metonymy. At its core, metonymy is a rhetorical device that substitutes one word or phrase with another closely related word or phrase. İf in colloquial speech, metonymic transfers ensure a significant reduction in the speech chain and save speech efforts, which is very important for informal communication (Deryugina, Ilyukhina, 2023: 179), in fiction it often adds depth and complexity to a writer's work. It implies symbolic references, and contextual associations. Unlike metaphor, which relies on a direct comparison between two dissimilar things, metonymy relies on an indirect, contextual relationship. It operates on the principle that words or phrases are often interconnected by shared experiences, cultural references, or geographycal proximity. According to N.A.Ippolitova, this trope is based on the relationships of spatial, temporal, and logical coherence between the compared phenomena (Ippolitova, 2020: 274). In the hands of a skilled writer, metonymy becomes the bridge that seamlessly connects the tangible with the intangible, the specific with the abstract, allowing readers to navigate the intricate layers of meaning effortlessly.

According to Klaus-Uwe Panther and Günter Radden “Metonymy is a cognitive phenomenon that may be even more fundamental than metaphor. We believe that the contributions give a fair view of the state of the art in metonymic research, although we are also aware of the fact that a great many questions about metonymy still remain unanswered” (Panther, Radden, 1999: 1).

Let us consider the classic example of using a physical object to represent a character's identity. For instance, a worn-out jacket, a yellowed with age photograph, or a cherished childhood toy can reflect the character's past, desires, or inner turmoil, serving as a metonymic extension of their emotional landscape. Through this complex interplay, readers can understand the character's motivations, fears, and aspirations, fostering a deeper connection with the narrative.

We can adduce the following purposes of metonymy in fiction:

**Eliciting emotions.** Authors can use metonymy as a powerful tool to elicit strong emotions in readers. By mentioning a symbol or object closely tied to a particular emotion, writers can evoke the reader's senses and feelings and make the emotional impact more profound (e.g. describing "a pair of empty boots" to convey loss taps into readers' shared experiences and associations.) Moreover, metonymy plays a pivotal role in fostering an intimate connection between the reader and the text, facilitating a shared experience that transcends the boundaries of language. Through the evocative power of metonymy, readers are invited to partake in the emotional journey of the characters, empathizing with their struggles, aspirations, and triumphs. This intimate bond, forged through the subtle nuances of metonymic associations, engenders a profound sense of empathy and understanding, underscoring the timeless universality of human experiences depicted in literature. Metonymy underlie human thoughts and language (Burke, 2023: 144).

**Character development.** Sometimes the writers use metonymy to disclose character traits and enhance the reader's understanding of the characters. Moreover, through metonymy authors provide a subtle insight into their personality, history or motivations, connecting characters to certain objects, actions, or locations. For example, a character who read books may be associated with knowledge and curiosity, even without explicitly stating those attributes.

**Setting the tone.** Metonymy can help to create the atmosphere of a story. By selecting words and phrases that carry connotations and cultural weight, authors can inconspicuously convey the mood they want to create (e.g.describing a gloomy, rain-soaked street can invoke a sense of melancholy or foreboding, setting the stage for a darker narrative).

**Foreshadowing and Symbolism.** Metonymy is used as an adept way to foreshadow events and reveal hidden symbolism in a story. Objects or elements closely connected to future plot developments can be subtly introduced through metonymy. It helps to create anticipation and intrigue. A seemingly neutral object, when employed as a metonym, can later reveal its deeper significance in the story.

Metonymy's influence extends beyond the microcosm of characters and settings, permeating the macro structure of the narrative itself. Through the skillful use of metonymic motifs, authors can weave intricate thematic threads, creating a cohesive rows of symbols and motifs that underscore the deeper philosophical or societal undercurrents. In his thesis “The Urban Web: Metonymic Representation in the Work of Charles Dickens and George Gissing” Michael Lesiuk claims that “representations of pollution, filth and excrement in Victorian realist fiction are more than abstract symbols or conceptual metaphors for understanding a “diseased” or “constipated” body politic. When they are read metonymically, signs of pollution, filth, and waste also serve as indices that point towards innumerable other aspects of the actual Victorian city, and in the right narrative context they can metonymically point towards those other aspects of the city to which they are indexically connected” (Lesiuk, 2012: 2).

**Providing capacity and brevity.** Metonymy is widely used not only in fiction, but also in everyday speech. It makes the expression shorter and more practical (e.g., we can substitute the expression “the students of the class” with one word – “class”). “The traditional definitions of metonymy are carried out under the assumption that metonymy is a figurative device to provide some charm and grandeur to the style, and, the researchers are all defined to the lexical level yet without treating it as a phenomenon in everyday language and normal modes of thinking” (Guan, 2009: 179).

We can provide multiple examples that illustrate the imagery of metonymy in fiction. For instance, in F. Scott Fitzgerald's "The Great Gatsby," the use of "East Egg" and "West Egg" as metonyms for the social classes in the novel not only delineates geographical locations but also symbolizes the stark contrast between the wealthy elite and the nouveau riche; in J.K.Rowling's "Harry Potter" series, the "wand" is a metonym for magical ability. A character's wand often reflects their identity, personality, and abilities, contributing to the rich world-building in the series, in George Orwell's "1984," "Big Brother" serves as a metonym for the oppressive regime and surveillance state, embodying the omnipresent control and fear that permeates the dystopian society.

However, metonymy, while a potent tool in literature, can at times prove to be a double-edged sword, confounding readers and challenging their understanding. This linguistic device often relies on subtle associations that, when misinterpreted, may lead to confusion. “Despite being an efficient communicative device, has the potential to cause serious misunderstandings if shared knowledge and expectations on which it relies are not perfectly matched” (Littlemore, 2015: 7).

In the expression “The perfect set of wheels for the young racer”, “set of wheels” mean the vehicle, but not the part of the car. Such metonymy is used because the wheels are considered the key part of the car.

Another example, the expression "The pen is mightier than the sword" uses "pen" and "sword" metonymically to represent the power of written communication and physical force, respectively. Taken literally, one could envision a fierce duel between a pen and a sword, a scenario that hardly makes sense. Hence, metonymy's potential for ambiguity necessitates a keen understanding of context and cultural references to grasp its intended meaning in various literary works.

O.Henry, the pen name of William Sydney Porter, was a master of this literary technique. The sophisticated language of O.Henry's short stories was formed under the influence of the peculiar language of American magazine stories; dual orientation towards mass and elite readers; a sense of

language, developed by many years of reading, and an understanding of the complexity and unpredictability of life. O.Henry chooses the path of complicating the language: ridding the plot of extra-fabular elements as much as possible, he generously strings stylistic devices onto it. One of the most important features of the is his specific way of thinking and forming thoughts. In his urge to update the language, O.Henry aims not at simplicity, but at complexity. Trying to convey in his short stories his specific perception of life, in which everything is possible, in which chance decides the fate of a person, he develops an exquisite, stylistically sophisticated language, not just saturated with all sorts of tropes, figures of speech and other linguistic devices, but in fact entirely consisting of them. O. Henry uses almost all the achievements of mankind in this area - in any case, we counted about 80 varieties of them in his stories. His language is concentrated, “dense” and not so easy to understand and especially translate. The vast majority of language techniques and lexical devices in his works are untranslatable in principle, and it leads to the fact that most of the author’s original technics disappear in translation (Jdanova, 2012: 115).

His short stories, renowned for their wit and surprise endings, are replete with examples of metonymy that enrich the narrative and engage readers in a delightful dance of language and meaning. In this article, we will explore O.Henry's adept use of metonymy through a careful analysis of several examples from his works, showcasing how this technique contributes to the overall effectiveness of his storytelling. O. Henry's ability to utilize metonymy is a testament to his mastery of language and storytelling.

One of the primary ways O. Henry employs metonymy is in character development. By using metonyms, he allows readers to gain insight into the inner workings of his characters. O. Henry's use of metonymy extends to the settings of his stories, allowing readers to connect with the environment on a deeper level.

In "The Cop and the Anthem," (O’Henry, 1977: 37) New York City itself becomes a metonym for the harsh realities of urban life. The city is depicted as a cold and unforgiving place, where the protagonist, Soapy, struggles to find warmth and shelter. The phrase "the city" represents not just a geographical location but also the challenges and opportunities it presents. The term "cop" in this story is used as a metonym for law enforcement and the societal constraints that prevent the character Soapy from finding refuge during the harsh winter months, highlighting the challenges faced by the homeless in the city.

One more example of metonymy in the same story can be observed in the following passage: “Up Broadway he turned, and halted at a glittering café, where are gathered together nightly the choicest products of the grape, the silkworm and the protoplasm” (O’Henry, 1977: 39) The author uses metonyms the grape, the silkworm, the protoplasm to create the atmosphere of luxury café. We can infer that the grape refers to the wine, the silkworm refers to fancy clothes, and the protoplasm refers to the rich man. The use of metonymy makes these sentences much funny. The humous languages bring great enjoyment to readers (Tong, 2016: 205).

In "Four Million," (O’Henry, 2014) O. Henry uses metonymy to add depth to the narrative and to convey complex ideas in a sophisticated manner. In the story, "brownstone fronts" are used as a metonym for wealth and social status, representing the luxurious lifestyle of the affluent upper class in New York City. This phrase implies not just the physical appearance of the buildings, but the entire social milieu and lifestyle associated with them.

In one more short story of the author “The Hand That Riles the Word” (O’Henry, 1977: 95) metonymy is read in the title. The word “hand” symbolizes a woman who managed to wrap around her little finger two stagers. We can also observe the association with the well-known cliché “to rule the world”, that discloses the philosophy of the short story.

O.Henry's dialogue is replete with metonymy, enhancing the wit and humor in his stories. Perhaps the most famous element of O.Henry's storytelling is his use of dramatic irony, often achieved through metonymy.

For instance, in the outstanding story of the author "The Gift of the Magi," (O’Henry, 1977: 31) the titular gifts – Della's hair combs and Jim's watch chain – become metonyms for the sacrifices

made by the characters. The irony lies in the fact that they each give up their most treasured possession to buy a gift for the other, only to find that the gifts are now useless without the items they sold. Here, metonymy intensifies the impact of the story's central irony and at the same time adds dramatic effect to the plot.

## Conclusion

Metonymy, with its subtle and indirect associations, is a literary device that enriches the fabric of fiction. It allows authors to convey emotions, develop characters, set tones, and weave intricate narratives with finesse. As readers, understanding the role of metonymy enhances our appreciation of the craft that goes into creating compelling stories.

O. Henry's mastery of metonymy is evident in the way he weaves this rhetorical device into his storytelling. Through character development, setting, symbolism, dialogue, and irony, he uses metonymy to enhance the richness and depth of his narratives. As readers, we are drawn into the intricate tapestry of O. Henry's world, where words become more than mere words; they become powerful tools for conveying meaning and emotion. O. Henry's works remind us that, in the hands of a skilled writer, metonymy can elevate storytelling to an art form, leaving a lasting impression on readers long after the final page is turned.

The next time you immerse yourself in a work of fiction, pay attention to the metonyms woven into the narrative, and you'll discover the power of suggestion in shaping the worlds within books.

## References

1. Matzner, S. (2016). Rethinking Metonymy (Literary Theory and Poetic Practice from Pindar to Jakobson). Oxford University Press, 344 p.
2. Deryugina, D., Ilyukhina, N. (2023). Vozmojnosti metonimii v obznachenii litsa v pazgovornoy rechi. Vestnik Samarskogo universiteta. Vol. 29, № 1, pp.174-180.
3. Ippolitova, N. (2020). Obschaya Ritorika. Moskva-Berlin: Direct-Media, 404 p.
4. Panther, U-K., Radden, G. (1999). Metonymy in Language and Thought - John Benjamins Publishing Company/Amsterdam/Philadelphia, 410 p.
5. Burke, M. (2023). The Routledge Handbook of Stylistics. Taylor, Francis, 636 p.
6. Lesiuk, M. (2017). The Urban Web: Metonymic Representation in the Work of Charles Dickens and George Gissing. Waterloo, Ontario, Canada, 243 p.
7. Guan, J. (2009). The Cognitive Nature of Metonymy and Its Implications for English Vocabulary Teaching. English Language Teaching, CCSE, Vol.2, №4, December.
8. Littlemore, J. (2015). Metonymy. Cambridge University Press, 240 p.
9. Jdanova, D. (2012). Yazik, jizn i igra v novellakh O'Genri. Vestnik Moskovskogo universiteta, № 1.
10. O'Henry. (1977). Selected Stories. Moscow: Progress Publishers, 278 p.
11. Tong, L. (2016). A Brief Analysis on the Typical Writing Styles of O. Henry. Advances in Economics, Business and Management Research, volume 30. Atlantis Press.
12. O'Henry. (2014).The Four Million. The Project Gutenberg eBook. https://englishonlineclub.com/pdf/O.%20Henry%20-%20The%20Four%20Million%20 [EnglishOnlineClub.com].pdf

Received: 29.09.2023 Accepted: 21.11.2023

DOI: https://doi.org/10.36719/2663-4619/97/141-146

**Aytac Zeynalova**
Azərbaycan Dillər Universiteti
filologiya üzrə fəlsəf doktioru
aytaczeynalova@hotmail.com

# "DİVAN ƏDƏBİYYATI" ANLAYIŞI ƏDƏBİ-NƏZƏRİ BAXIŞLAR MÜSTƏVİSİNDƏ

**Xülasə**

Əsasını daha çox lirik şeirlər təşkil edən divan ədəbiyyatı tematik motivlərinə, məzmun və mündəricəsinə görə çox rəngarəngdir divan ədəbiyyatının istər ideya-məzmun, istərsə də forma-sənətkarlıq məsələləri ilə əlaqədar olaraq xeyli sayda terminoloji problemləri də mövcuddur. Burada "divan ədəbiyyatı" ifadəsindən başlamış poetik fiqurların və kateqoriyaların adlandırılmasına qədər bir çox sözləri nümunə çəkmək mümkündür. Divan ədəbiyyatı" ifadəsi şərti anlayış olaraq əsasən orta çağ dövründə meydana çıxmış ədəbi-bədii nümunələrin sistemli toplusuna aid edilir. Beləliklə müstəqillik illərinin ilk onilliyində Azərbaycan filoloji fikrində məhz Türkiyə ədəbiyyatşünaslığının təsiri altında "divan ədəbiyyatı" anlayışı elmi ictimaiyyət tərəfindən qəbul edilmişdir. Bu gün Azərbaycan ədəbiyyatında XIX əsrdən XX əsrin birinci yarısınadək mövcud olan və divan şeiri ənənələri əsasında yaranmış bütün ədəbi-bədii nümunələri "divan ədəbiyyatı" adı altında birləşdirmək mümkündür. Azərbaycan divan ədəbiyyatının görkəmli şairlərinin yaradıcılığında təsəvvüf təlimi ilə dini-irfani fikirlər qarışdırılaraq qeyri-müəyyənlik yaratmaqdadır.

***Açar sözlər:*** *divan, ədəbiyyat, anlayış, termin, mövzu, təsəvvüf, irfan*

**Aytac Zeynalova**
Azerbaijan University of Languages
PhD in philology
aytaczeynalova@hotmail.com

## Consept «Divan literature» in literary theoretical views

**Abstract**

The Divan literature, the basis of which are lyrical poems is a very colorful due to its thematic motifs, subjects and contents. But in the meantime it has a lot of terminology issues because of the idea-content or shape craft. Words such as "Divan literature" term including naming of poetic figures and categories can be mentioned as an example to this issue. Divan literature term is included to systematic collection of literary-artistic terms created in Medieval period. "Divan Literature" term was accepted by the scientific society during first years of independence with the influence of Turkish literary science. Today it's possible to combine all literary artistic terms came from divan lyrics which were made between XIX and first half of XX centuries, under "Divan Literature" name. There can be some uncertainty. In works of famous poets of Azerbaijan Divan literature due to mixing of Sufism teaching with religious Irfan thinking.

***Keywords:*** *divan, literature, conception, the term, topic, sufism, irfan*

## Giriş

Əsasını daha çox lirik şeirlər təşkil edən divan ədəbiyyatı tematik motivlərinə, məzmun və mündəricəsinə görə çox rəngarəngdir. Yarandığı gündən divan ədəbiyyatı həyat, yaradan, yaradılış və insan ətrafında yaranmış bir çox mənəvi-əxlaqi düşüncələrə aydınlıq gətirməyə çalışmışdır. Burada fəlsəfi, əxlaqi, məntiqi, estetik, etik fikirlərlə rastlaşırıq ki, onların hər biri ciddi qaynaqlar əsasında qələmə alınmışdır. Bütün bunlara baxmayaraq divan ədəbiyyatının nümayəndələri hansı mövzuda yazırlarsa yazsınlar bütün mövzuların alt niyyəti Yaradanın vəsfi olmuşdur. Bu kompozisiyalar söz vasitəsilə assosiasiya olunan ibadət formaları kimi də qəbul edilə bilər. Klassik

alman fəlsəfəsinin nümayəndəsi olan Hegelin təbirincə desək, klassik sənət bədii dindir (Estetika: V chetyrekh tomakh, 1968).

"Divan ədəbiyyatı" ifadəsi şərti anlayış olaraq əsasən orta çağ dövründə meydana çıxmış ədəbi-bədii nümunələrin sistemli toplusuna aid edilir. Azərbaycan ədəbiyyatında "Divan" bağlamaq isə intibah dövründə yaranmış, bu gün də qəzəl-qəsidə və digər janrların toplusundan ibarət şeir-sənət məcmuəsi hazırlamaq ənənəsidir. "Divan" sözü fars mənşəlidir, reyestr, xüsusən də vergi cədvəli, ümumiyyətlə dövlət işləri üzrə hesabların siyahıları, həmçinin bu hesabların aparıldığı yer mənasını verirdi... Abbasilər dövrünün filoloqları o zamana qədər divan adlandırdıqları kolleksiyalarda qorunan maliyyə, qeydiyyat və arxiv sənədlərini antologiya şəklində toplamışlar. Françes Bloisin qənaətinə görə, fars dilində olan "divan" sözü həmin dildəki "yazıçı" və ya "xəttat" mənasını verən "dibir" sözündən götürülmüşdür"."Divan" terminindən dünya ədəbiyyatşünaslığında da istifadə edilmişdir. Belə ki bu istilahdan 1697-ci ildən fransız dilində olan poetik əsərlərin adlarında istifadəsi barədə qeydlər diqqəti çəkir. Yohann Volfqanq Göte isə_"Qərb-Şərq divanı" (1819) əsəri ilə sözü Avropa ədəbiyyatına daxil etmişdir" (2).

Düşünürük ki, divan ədəbiyyatının istər ideya-məzmun, istərsə də forma-sənətkarlıq məsələləri ilə əlaqədar olaraq xeyli sayda filoloji problemlər mövcuddur. Başqa sözlə desək, bir çox məsələlərin həllində anlayışların ifadə olunduğu terminlərin müəyyənləşməsinin xüsusi köməyi ola bilər. Burada "divan ədəbiyyatı" ifadəsindən başlamış poetik fiqurların və kateqoriyaların müəyyənləşməsinə qədər bir çox sözləri nümunə çəkmək mümkündür.

**I Fəsil. "Divan ədəbiyyatı" ifadəsinin yaranma tarixi.**

Beləliklə müstəqillik illərinin ilk onilliyində Azərbaycan filoloji fikrində məhz Türkiyə ədəbiyyatşünaslığının təsiri altında "divan ədəbiyyatı" anlayışı elmi ictimaiyyət tərəfindən qəbul edilmişdir. Türkiyə ədəbiyyatşünaslığında isə "divan ədəbiyyatı" anlayışının elmi dövriyyəyə girməsi XIX əsrin sonu XX əsrin əvvəllərində fəaliyyət göstərmiş türk alimləri Ömər Seyfəddin və Əli Canibin adı ilə bağlıdır. Onlar özlərinə məxsus olan klassik ədəbiyyatın bədii-estetik dəyərlərinə yeni baxış sərgiləyərək ilk dəfə "divan ədəbiyyatı" terminini elmə gətirmişlər. "Mütareke devrinde ortaya çıkan divan edebiyatı tabiri önce Ömer Seyfeddin ve Ali Canip'in kalemlerinde kendini hissettirmeye başlamış, Cumhuriyet'in ilk yıllarından bu yana ise gittikçe büyük bir yaygınlık kazanmıştır. Ömer Seyfeddin gibi Ali Canip de bir başkası ve yenisi olmadığı için "eski" denmesine gerek bulunmadığı halde, onda bir köhnelik ve eskimişliği vurgulamak kastıyla, haşve düşmek pahasına sık sık "eski divan edebiyatı" ifadesini kullanır" (Akın, 2017). "Ümmət dövrünün məhsulu" və "Əcəm müqəllidi" kimi qiymət verdiyi bu ədəbiyyat barədə Türkiyəli ədəbiyyatşünas alim Əli Canib yazır: "Hulâsa divan halinde teşekkül eden, ancak saraylarda, zümrevî divanlarda kabule mazhar olan bizim eski edebiyatımıza verilecek en doğru ad 'divan edebiyatı' tabiridir" (Akın, 2017). Onun dili ve ruhu ile xalqdan uzaq, daha çox insanın daxili dünyasına qapalı bir zümrə ədəbiyyatı olduğunu bildirmək üçün Canib bu ədəbiyyatın əksi olaraq "əndərun ədəbiyyatı, mədrəsə ədəbiyyatı" anlayışlarını önə çəkmişdir. Əli Canibin bu fikri Cümhuriyyət aydınları tərəfindən rəğbətlə qarşılandığı üçün onun bu ədəbiyyata "Osmanlı saraylarında divan adlanan toplantılarda oxunan şeirlərdən ibarət olan ədəbiyyat" kimi verdiyi açıqlma zaman keçdikcə diqqətdən uzaqlaşmış, sadəcə əsərlərin toplusu kimi qəbul edilmişdir. Xarici araşdırmaçıların, eləcə də yerli müəlliflərin türk ədəbiyyatı üçün istifadə etdikləri "Osmanlı ədəbiyyatı" təbiri ilk vaxtlarda milli-tarixi kimlik kimi təqdim edilsə də, sonralar xalqın anlamadığı, Osmanlı sarayının himayə və xidmətində sadəcə Osmanlı "güzîdeler tabakası"na xitab edilən bir anlayış kimi qəbul edilmişdir. Beləliklə klassik ədəbiyyata Osmanlılara məxsus və ya onun sahibinin isə Osmanlı toplumu olması barədə bir düşüncə kimi deyil, milli mədəniyyətə yad olmuş bir zehniyyətin ifadəsi olaraq yanaşılmışdır (Qurani-Kərim, 1991: 710).

Araşdırmaları dərinləşdirdikcə alınan nəticələr daha böyük maraq doğurur. Apardığımız paralellər göstərir ki, Azərbaycanda klassik ədəbiyyata yanaşma formaları XIX əsrdən üzü bəri fərqli xarakter aldığı kimi Türkiyə ədəbi tənqidində də bu hal müşahidə olunmuşdur. Böyük dramaturq, filosof-yazıçı M.F.Axundov ədəbi-nəzəri görüşləri ilə də Azərbaycanın mədəniyyət tarixində özünəməxsus səhifə açmışdır. Onun "Nəzm və nəsr haqqında" məqaləsi ilə yanaşı digər

əsərləri də bu baxımdan maraq doğurur. Axundov yazılarında klassik irsə yeni münasibət sərgiləmiş, Şərq ədəbiyyatını bütöv şəkildə götürərək şair və nazim təbirlərinə fərqli estetik meyarlarla yanaşmışdır. O, Azərbaycanın dahi şairi Məhəmməd Füzulini "şair" deyil, "nazimi-ustad" adlandıraraq "məsava şairlərin" (sair şairlərin – İ.H.) sırasına da aid etməmişdir. Akademik İsa Həbibbəyli yazır; "bizim fikrimizcə, o, Məhəmməd Füzulini klassik romantik lirikanın ustadı kimi qiymətləndirir. Axundzadəni narahat edən odur ki, romantik ədəbiyyat yeni tarixi epoxada «millətin işinə yaramır", qəzəl-qəsidə janrında yazmaq maarifçilik hərəkatı ilə səciyyələnən XIX əsr üçün "nazimlik"dir" (Həbibbəyli).

Aaraşdırmaçı publisist Vəfa Babasoy M.F.Axundzadə ilə eyni dövrdə yaşamış türkiyəli publisist və dramaturq İbrahim Şünasinin fəaliyyətini müqayisə etmiş, eyni zaman kəsiyində klassik irsə yeni və oxşar baxışların mövcudluğunu ortaya çıxarmışdır. XIX əsrin ortalarından etibarən Azərbaycanda maarifçilik hərəkatının formalaşması, maarifçi realizmin inkişafı Osmanlının ictimai-mədəni həyatında da eyni şəkildə cərəyan etmişdir. "Tənzimat Osmanlı imperiyasının 1839-cu ildə həyata keçirməyə başladığı islahatın adı idi və Osmanlının Avropa və Rusiya müdaxiləsinə qarşı öz varlığını qoruma çabası olaraq meydana çıxmışdı. Avropa ədəbi modelinin türk ədəbiyyatına gəlişi də elə bu dövrə təsadüf etdi... Şinasinin "Tərcümani-əhval müqəddiməsi" adlı məqaləsi Tənzimat ədəbiyyatının ilk məqaləsidir. Axundzadə kritika, yəni tənqid sahəsində ilk məqalələrin müəllifidir. Onun "Nəzm və nəsr haqqında" məqaləsində təsvir etdiyi ideal şeirin tərifi Şinasi yaradıcılığında da müdafiə olunur. Axundzadə Firdovsi, Nizami, Cami, Sədi, Mollayi-Rumi və Hafizi "nadir vücuda gələn" şairlər hesab edir" (6).

Türkiyəli araşdırmaçı Fəyyaz Kandəmir **"Divan şeiri" məqaləsində** yazır: "Osmanlı edebiyatı"na ilk ciddi taarruzu **Namık Kemal** başlatır. O, 1866 yılında Tasvir-i Efkâr'da neşredilen "*Lisan-ı Osmanî'nin Edebiyatı Hakkında Bazı Mülahazatı Şamildir*" başlıklı yazısında, Osmanlı edebiyatının tek meziyetini söyleyiş güzelliği olarak görür; bunun dışında bu edebiyatı akla, fenne ve ahlaka aykırı bularak karikatürize eder. **Namık Kemal**'den sonra tenkitler artarak sürer; eski edebiyatımız beşerî his ve fikirleri yansıtmayan, kuralcı, toplumsal meselelere yabancı, Fars mukallidi, gayrimilli ve gayrisamimi bir caize edebiyatı olarak eleştirilir" (7). Müəllifə görə həmin dövr ədəbiyyatşünaslıqda klassik irsə *"edebiyat-ı kadime, şi'r-i kadim, asar-ı eslaf, Osmanlı edebiyatı/şiiri, havas edebiyatı/şiiri, saray/enderun edebiyatı, divan edebiyatı/şiiri, eski Türk edebiyatı/şiiri, klasik Türk edebiyatı/şiiri" və s. adlarla yanaşılmışdır.* Digər tərəfdən bu ədəbiyyat Qərb ədəbiyyatşünaslarının klassik şeir haqqında müəyyənləşdirdiyi prinsip və ölçülərə uyğun gəlmədiyindən ədəbiyyatşünaslar "Klassik Türk ədəbiyyatı" ifadəsindən də imtina etməli olmuşlar. "Enderunca, divanlarda gömülü eski lisan, eski divanlardaki Osmanlıca denilen Enderun dili" şeklinde ifade ettiği bu edebiyata mahsus bir dil kavramından hareketle sonunda (Ə.Canib-kursiv A.Zeynalova) "divan edebiyatı" ve "divan şairleri" gibi yeni bir adlandırış ve kavrama ulaşır" (Akın, 2017). "Bunlara karşı, mutlaka onlara benzemek mecburiyetinde olmayan eski şiirin kendi ölçüleri içinde ve kendine mahsus bir klasik edebiyat olduğunu belirtmek suretiyle bu meselede en isabetli hükmü getirmiş olan M.Fuad Köprülü (Türk Edebiyatı Tarihi, İstanbul 1921, 2. kitap, s. 121-122), Türk edebiyatı tarihinin en yetkili mümessili olmak sıfatı ile "divan edebiyatı" sözünü kullanmamaya hususi bir dikkat göstermiştir" (Akın, 2017). O, 1934-cü ildə hazırladığı "Köhnə Türk Ədəbiyyatı Antologiyası" və "Köhnə Şeir Antologiyası"ndan kənarda qalan əsərlərdən ibarət digər bir anatlogiya yaratmış, burada toplunun sərhəd və çərçivəsinə uyğun olmayan adlardan uzaqlaşmağa məcbur olmuş, ənənəyə uyğun olaraq ona "Divan Ədəbiyyatı Antologiyası" adını vermişdir ki, sonradan heç bir yerdə bu termindən istifadə etməmişdir. Elmi fəaliyyəti zamanı Şəhabəddin Süleyman ilə birlikdə yazdığı "Yeni Osmanlı Tarix-i Ədəbiyyatı" kitabında "saray ədəbiyyatı" təbirinə yer vermiş olan Fuad Körpülü sonrakı bütün yazılarında da "divan ədəbiyyatı" sözünə yer verməmiş, "klassik ədəbiyyat" və ya "klassik Türk ədəbiyyatı" ifadələrindən istifadə etmişdir.

Ədəbiyyat tarixindən bəllidir ki, Türkiyədə klassik irsə ziddiyyətli münasibət zaman keçdikcə dəyişilmiş, Əli Nihad Tərlan, Mehmet Çavuşoğlu, Mustafa İsen, Əhməd Atilla Şəntürk, İskəndər Pala və başqalarının ciddi fəaliyyəti nəticəsində dəyərli tədqiqat işləri meydana çıxmışdır. Lakin

sonradan "divan ədəbiyyatı" terminin məhdud ifadəetmə imkanları barədə türk ziyalıları tərəfindən xeyli sayda yazılar və araşdırmalar dərc edilsə də problem həll olunmamış qalmışdır. Belə ki müasir Türkiyə ədəbiyyatşünaslığında "divan ədəbiyyatı" ifadəsinə olan ziddiyyətli münasibət diqqəti cəlb edir. Fəyyaz Kandəmir öz yazısında "divan ədəbiyyatı" ifadəsinə münasibət bildirmiş, təbir olaraq bu sözün ifadə etdiyi fikri tam əhatə etmədiyini vurğulamışdır. Lakin "galat-ı meşhur lügat-i sahihden evladır" deyə o da bu temini işlətmişdir. Alınan qənaət budur ki, zamanında "divan ədəbiyyatı" ifadəsi sırf Osmanlı dövlətinə, eləcə də Osmanlı ədəbiyyatına siyasi-mədəni bir etiraz kimi ortaya atılmış bir istilah olmuşdur. Qeyd edək ki, Azərbaycan nəzəriyyəçilərinin araşdırmalarında nə sovet dövründən əvvəl, nə də sovet ideologiyası altında yazılan mətnlərdə bu istilaha yer verilməmişdir. Sözü gedən hala SSRİ məkanında yaşayan, bədii-estetik meyarlarına görə eyni ədəbi tarixi yol keçmiş digər türk xalqlarının tədqiqatlarında da rast gəlinmir. Ortaq Şərq ədəbiyyatının tərkib hissəsi olmuş fars filologiyasında isə "Divan" sözü yalnız şeir toplusu mənasında işlədilməkdədir (Golpinarli, 1969).

Söylədiklərimizdən bəlli olur ki, "divan ədəbiyyatı" termini mənasına görə Osmanlı saraylarında təşəkkül edilən, zadəgan məclislərinə məxsus zümrə ədəbiyyatı kimi hesab edilən, eləcə də zamanla şairlərin şeirlerini bir araya topladıqları "Divan" adlı şeir məcmuələrindən meydana gəlmə bir ədəbiyyat olduğu qənaətilə belə bir yorum irəli sürülmüşdür. Türkiyəli ədəbiyyatşünas alim Əbdülbaqi Gölpınarlı da elmi fəaliyyətinin ilk illərində bu dəyişikliyinin tərəfdarı olmuş, sonradan mövqeyini dəyişərək səhv etdiyini bəyan etmişdir.

**II Fəsil. "Divan ədəbiyyatı" ifadəsi Azərbaycan ədəbiyyatşünaslğında**

Azərbaycan ədəbiyyatşünaslığında divan ədəbiyyatının tarixi və poetikası haqqında xeyli sayda tədqiqatların müəllifi olan professor Sənan İbrahimovun fikirlərinə görə, "ədəbiyyatşünaslıqda bu termin çoxçalarlı olub həm də "klassik poeziya", "şəhər ədəbiyyatı", "müsəlman ədəbiyyatı" və s. istilahlara alternativ kimi işlənilir (İbrahimov, 2003). Belə ki söylədiyimiz ifadələr özündə lirik şeirlərlə bərabər epik, epik-lirik məzmunlu müxtəlif şeir şəkillərində yazılmış əsərləri, epistolyar janrda yazılmış nümunələri, səhhətnamə, "həsb-i hal", "ərz-i hal", saqinamə, hilyə, tərcümə fəaliyyətini və s-ni də ehtiva edir. Məsələn, XVI əsrin dahi şairi Məhəmməd Füzulinin "Hədiqətüs-süəda"sı buna nümunə ola bilər. Müstəqillik dövrü Azərbaycan filoloji düşüncəsində "divan ədəbiyyatı" həm də "intibah dövrü" və "orta əsrlər" istilahına alternativ kimi işlənərək zaman məfhumu bildirsə də, son zamanlar bu terminin semantik tutumu daha önə çıxmış, "divan şeiri ənənələri" termini sanki "divan ədəbiyyatı" ifadəsinə assosiasiya etmişdir. Terminologiya elminə əsasən terminin semantikasındakı dəyişmələr aşağıdakı kimi qruplaşdırılmışdır: mənanın köçürülməsi, mənanın genişlənməsi, mənanın dəqiqləşməsi. Zənnimizcə, "divan ədəbiyyatı" termini də unifikasiya və standartlaşdırma qanunlarına əsasən yeni məzmun qazanaraq zaman-zaman sabitləşə bilər. "Termin elm, texnika, iqtisadiyyat və mədəniyyət sahəsində dəqiqləşmiş anlayışları adlandıran, izah edən, definitiv funksiyaya malik olan sözdür" (Abdullayeva-Nəbiyeva, 2007). Terminin əsas xüsusiyyəti ondan ibarətdir ki, o dəqiq olmaqla bərabər, həm də qısa olmalıdır. Terminin qısalığı onun asan mənimsənilməsi, yadda yaxşı saxlanılması üçün əsas şərtdir. Belə ki, terminin yaranması üçün ilk növbədə anlayış mövcud olmalı və bu anlayışı ifadə edən söz onun əlamətlərini dəqiq ifadə etməli, definitiv mənaya malik olmalıdır. Sözün termin kimi formalaşması çoxmərhələli prosesin nəticəsidir. İkinci mərhələdə termin-sözün əlavə mənaları kənarlaşdırılır, onun işləklik səviyyəsi müəyyənləşdirilir. Üçüncü mərhələ unifikasiya, standartlaşma və kodifikasiyadır. Bu zaman termin-söz üçün ən uyğun forma seçilir və o, elmi lüğətlərdə yer alır. Beləliklə, terminologiyada termin yaradıcılığı mütəxəssislərin fəaliyyəti nəticəsində tənzimlənir və inkişaf edir. Bütün bu standartlardan çıxış etsək, bəhs etdiyimiz anlayış ətrafında kiçik bir tədqiqat apara bilərik (Həbibbəyli, İbrahimov, 2018). Ədəbiyyatşünasların fikirincə Türkiyə ədəbiyyatşünaslarının araşdırmalarında "divan ədəbiyyatı" anlayışı XIX əsrədək olan ədəbiyyatı əhatə edir. Bu gün Azərbaycan ədəbiyyatında XIX əsrdən XX əsrin birinci yarısınadək mövcud olan və divan şeiri ənənələri əsasında yaranmış bütün ədəbi-bədii nümunələri "divan ədəbiyyatı" adı altında birləşdirmək mümkündür. Məsələn, Seyid Əzim Şirvaninin yaradıcılıq fəaliyyətindən danışarkən onu divan ədəbiyyatından ayrı götürmək qeyri-mümkündür. Əlbəttə ki bu fikirləri XIX-

XX əsrlərdə yazıb yaratmış bir çox ədəbi nümayəndələr haqqında da söyləmək mümkündür. Böyük ehtimal ki bu yenilənmələr zaman keçdikcə yeni çalar və yeni mahiyyət qazanaraq XX əsrdən çağdaş ədəbiyyata qədər klassik ənənələr əsasında yazılmış bütün əsərləri həmin istilaha aid etmək fürsəti qazanacaqdır. Yəni "divan ədəbiyyatı" istilah olaraq elmi dövriyyədən çıxmayaraq hər zaman yeni baxış bucaqları altında dəyişmələrə məruz qalacaqdır.

Qətran Təbrizidən, Nizami Gəncəvi, Qazi Bürhanəddin, Şah İsmayıl Xətayi, İmadəddin Nəsimi, Məhəmməd Füzulidən başlamış divan mədəniyyəti sonrakı dövrlərdə də davam etdirilmiş, oxucu təfəkkürünün və zövqünün formalaşmasında aparıcı tendensiya kimi diqqəti cəlb etmişdir. Sonuncu yüzilliyin ədəbi-mədəni yenilənmələri divan yaradıcılığına marağı xeyli zəiflətsə də, elementə çevirəcək qədər dağıda bilməmiş, klassik şeir janrları zaman-zaman fərqli bədii-estetik meyarlar, novator keyfiyyətlər qazanaraq mövcudluğunu qoruya bilmişdir. Divan ənənələri çağdaş poeziyamızda Şahin Fazil, Hacı Mail, Hacı Ələmdar Mahir, İlqar Fəhmi, Arif Buzovnalı, Qəzənfər Talib, Kamal Hüseynzadə, Gülarə Munis və b.-nın şeir-sənət fəaliyyətində bu gün də yaşamaqdadır. Araşdırmamız göstərir ki, divan ədəbiyyatına aid olan janr və formalar nəinki unudulmamış, əksinə yeni məzmun və biçimlərdə daha geniş oxucu auditoriyası qazanmağa yönəlmişdir. Oxucu tələbatının zəifləməsi və sürətli şəkildə yenilənən dünyanın yeni meyarları fonunda bu əsərlər ədəbi hadisəyə çevrilə bilməsələr də, Azərbaycanın milli-mənəvi varislik ənənələrinin və milli-estetik təfəkkür keyfiyyətlərinin qorunub saxlanılması baxımından böyük əhəmiyyət kəsb edir (Zeynalova, 2010).

"Divan ədəbiyyatı"na yalnız əruzvəznli ədəbiyyat kimi yanaşılması da zənimizcə yanlış fikirdir. Çünki Xətayinin "Divan"ına daxil olan şeirlər toplusuna nəzəri və faktoloji prinsiplərlə yanaşsaq o zaman bu fikri təkzib etmək lazım gəlir. Bu mənada sözü gedən anlayışın bədii-estetik təbiəti daha obyektiv şəkildə və fəqli meyarlarla tədqiqata cəlb edilməlidir.

Bu ədəbiyyatın inkişafı, ideya-mövzu dairəsinin təsnifatı, mahiyyəti, bədii-estetik xüsusiyyətləri, dövrlərə uyğun olaraq tipoloji izahı və s. məsələlərin həlli bu gün də Azərbaycan ədəbiyyatşünaslığında ətraflı şəkildə araşdırılmamışdır. Məsələn, klassik poeziyamız ilk baxışda bütöv bir sistem kimi görünsə də, Nizami yaradıcılığında əksini tapmış bədii düşüncə XIII əsr təfəkkür tərzindən, XIV əsr isə XVI yzilliyin ədəbi-fəlsəfi fikrindən və həmin fikrin təzahür formalarından ciddi şəkildə fərlənir.

Sakral məzmuna malik olan söz-sənət varlığın idraki proseslərə təsiri yollarını müəyyənləşdirir, Allahı və onun iradəsini, dünyanı, eləcə də insanı və onun düşüncələrini dərk etməkdə oxucuya yardımçı olur. Etik mövzuda olan əsərlər ideal davranış qaydalarını, əxlaqi məzmunda olan bədii nümunələr taleyi idarə edən xarakterin saflığını formalaşdırır. Estetik məzmunlu əsərlər həm də gözəlliyin daşıyıcıdır, məşuqundan biganəlik və laqeydlik görən aşiq sanki bir sınaqdadır. Divan ədəbiyyatı geniş mənada insanın daxili-mənəvi transformasiyasını, paklaşma prosesinin qanunauyğunluqlarını və mahiyyətini öyrədir. Hegel yazır ki, Şərq bütövdən çıxış edir və hər şey nəyinsə hissəsidir. Və bu "nə isə" özü də daxil olduğu bütövə doğru can atır. Hər şey öz həllini ancaq Vahiddə, Mütləqdə tapır (Chalisova, 1997).

Divan ədəbiyyatının mövzu qaynaqları çox müxtəlifdir. Ədəbiyyatşünas alim Sənan İbrahimov "Divan ədəbiyyatının poetikası" kitabında Quranın ayə və surələri, təfsirlər, şəriət elmləri, islam tarixi, kəlamlar, təsəvvüf, Şərq mifologiyası, tarixi, əfsanəvi hədis və qəhrəmanlar barədə hekayələr, Peyğəmbər və övliyalar haqqında hədis və rəvayətlər, Azərbaycan tarixi ilə bağlı hədis və əhvalatlar, məsəllər, lətifələr, nağıl və rəvayətlər, əqli və nəqli elmlər (fəlsəfə, hikmət, heyət, tibb, musiqi, Azərbaycan və Şərq şifahi xalq ədəbiyyatı nümunələri, folklor nümunələri, dünya ədəbiyyatı nümunələrini divan ədəbiyyatının qaynaqları kimi qruplaşdırmışdır.

## Nəticə

Ortaq Şərq və ümumtürk ədəbiyyatının poetik ənənələri əsasında yaranmış Azərbaycan ədəbiyyatı bu gün də yeniliklərlə dolu dövrünü yaşamaqdadır. Bütün bunlara baxmayaraq klassik şeirin ideya-mövzu dairəsindən, forma-janr keyfiyyətlərindən bəhrələnmə də özünü göstərir.

